*Kitab **goyce.az** saytının təşəbbüsü ilə nəşr edilmişdir.*

Toplayıb tərtib edəni və ön sözün müəllifi: **İslam Ələsgər**

Redaktor: **Araz Yaquboğlu**

Arxiv məlumatlarını təqdim edən: **Xətai Ələsgərli**

İkinci nəşri çapa hazırlayan: **Niftalı Göyçəli**

**Sazlı-sözlü Göyçə (II kitab).**
**Bakı, "Elm və təhsil", 2018, 368 səh.**

Kitab tədqiqatçı-alim İslam Ələsgərin toplayıb tərtib etdiyi "Sazlı-sözlü Göyçə" kitabının Xətai Ələsgərli tərəfindən 1999-cu ildə kiril əlifbası ilə çap olunan ilk variantının latın qrafikası ilə ikinci nəşridir. Həmçinin bu nəşrdə cüzi əlavə və dəyişikliklər də edilmişdir.

Kitab Göyçə aşıq və şairlərinin hamsını əhatə eləmir, çünki onların çoxunun əsərləri çap olunmuşdur. Burada əsasən itib-batan yaradıcı sənətkarların əsərlərinə yer verilir, eyni zamanda tarixi ardıcıllıq zərurətindən bəzi çap olunmuş aşıq və şairlərin də əsərlərindən nümunələr verilir.

Son illər aparılmış tədqiqatlar nəticəsində əldə olunmuş digər aşıq və şairlərin həyat və yaradıcılıqları da bu seriyadan olan növbəti kitablarda nəşr olunması nəzərdə tutulur.

**ISBN 978-9952-8176-1-2**

**© "Elm və təhsil", 2018**

# SAZLI-SÖZLÜ GÖYÇƏ

Göyçə – indiki Ermənistanın Basarkeçər, Qaranlıq, Kəvər, Yelenovka, Çənbərək (Qırmızı nahiyə) rayonlarının ərazilərini əhatə edən böyük bir mahaldır. Dəniz səviyyəsindən 2000 metrə qədər yüksəklikdə yerləşən bu düzənliyi təbiət, sanki bütün bəlalardan mühafizə etmək üçün hər tərəfdən uca dağlarla hasarlamışdır. Ortada ulu əcdadlarımızın "dəniz" adlandırdığı, "Kitabı-dədə Qorqud" dastanlarında "Göyçə dənizi" kimi adı çəkilən Göyçə gölü yerləşir.

İlin yaz və yay aylarında Göyçə başdan-başa gül-çiçəyə bürünür. Bu qədim türk torpağının adı, bir ehtimala görə, "Göyçə" (göylük, yaşıllıq mənasında), başqa bir ehtimala görə, "Göyçək" olmuş, sonradan sövti dəyişiliklərə uğrayaraq, "Göyçə" şəklində sabitləşmişdir.

Göyçədən söhbət düşəndə, bəzən oranı "Aşıqlar vətəni" adlandırırlar. Burada mübaliğə olduğu kimi, bir həqiqət də var. Qəbir daşları üzərində həkk edilmiş olan insan şəkilləri və onların sinələrinə sıxdığı saz bu sənətin min illər öncə Göyçə mahalında da təşəkkül tapdığından xəbər verir. Təəssüf ki, bu mahalın başı üzərində vaxtaşırı əsən qara yellər çox sərvətimizi süpürüb apardığı kimi, XVIII əsrin ikinci yarsına qədər orada yaşayıb-yaratmış saz-söz sənətkarlarını da Göyçə tarixinin səhifələrindən silmişdir.

Atalar yaxşı deyib: "Su gələn arxdan bir də gələr". Göyçədə əmin-amanlıq yaranan kimi qaçqınlar, köçkünlər doğma yurda qayıtmış, hər iş tədricən öz qaydasına düşmüşdür. Aşıq sənəti də XVIII əsrin əvvəlində ən yüksək

mərhələyə qalxmışdır. Əlbəttə, bu sürətli inkişafa əhəmiyyətli dərəcədə təsir göstərən bəzi səbəblər də vardır.

Məlum olduğu kimi, Göyçədə qızğın iş müddəti altı aydan artıq deyildir. Orada yaşayanlar əsasən yazın ikinci ayından işə başlamış, mal-qara üçün ot-ələf tədarükü görmüş, təsərrüfatın bütün sahələrində məhsullarını toplamaqla məşğul olmuşlar. Qocaların söylədikləri xatirələrdən aydın olur ki, göyçəlilər toy və digər şənlik məclisləri olmayanda da payız və qışın uzun gecələrini keçirmək üçün mal tövlələrinin başında tikilmiş isti "otaq"lara toplaşıb, mollaların hədislərinə, dərvişlərin şirin söhbətlərinə qulaq asmış, qaravəlli danışmış, bir-birinə tapmaca demiş, müxtəlif cür xalq oyunları icra etmiş, əksər hallarda isə aşıqların sazını, sözünü dinləmişlər.

Göyçədə əsas musiqi alətləri saz, zurna (qara zurna da deyirlər) və dəf (nağara) olmuşdur.

Yaxın vaxtlara qədər bu mahalda tar, qaval, kaman, qarmon və s. yox dərəcəsində idi.

Zurna və dəfə nisbətən bir-çox üstünlüklərə malik olan saz şənlik yığıncaqlarında meydana tək yiyələnmişdi.

Göyçə mahalında ildə yüzlərlə toy və digər şənlik məclisləri keçirilirdi. Belə məclisləri keçirmək əlbəttə, bir aşığın, beş aşığın işi deyildi. Bir tərəfdən aşığa olan tələb, bir tərəfdən ona edilən hörmət, digər tərəfdən isə maddi marağın nəticəsi olaraq, aşıq sənətinə təbii bir axın əmələ gəlmiş, tez bir zamanda onlarla aşıq meydana çıxmışdır. Hətta bir çoxları mükəmməl ustad təlimi görmədən, az-çox saz çalıb, söz oxumağı bacaran kimi, "aşığam" deyə, xalq içərisinə çıxaraq şənlik məclisləri keçirməyə başlamışlar. Odur ki, kəmiyyətcə tez bir zamanda artan aşıqların çoxu keyfiyyətcə aşağı səviyyədə olmuşlar. Bu dəfə

aşıq çox olduğuna görə, şənlik məclislərinə hər rast gələni deyil, dastanları düzgün bilən, mahnıları məharətlə ifa edən, qiymətli şeirlərlə repertuarı zəngin olan, təmiz əxlaqlı və davranışı ilə hamıya xoş təsir bağışlayan aşıqları dəvət etməyə başlamışlar. Odur ki, aşıqlar arasında kamilləşmə, püxtələşmə uğrunda rəqabət başlamış, beş-altı il müstəqil aşıqlıq edənlərin bir çoxları ustad yanına gəlib, bu sənətin incəliklərini öyrənməyə cəhd göstərmişlər.

Aşıq o zaman daha çox sevilir ki, onun ifa etdiyi mahnılar məzmunca gözəl olsun, dinləyicilərin istək və arzularından xəbər versin, onlara xoş təsir bağışlasın. Odur ki, Göyçədə yetişmiş olan ustad aşıqlarımız bu məsələyə çox məsuliyyətlə yanaşmış, bir-birindən qiymətli sənət inciləri yaratmışlar. Onlar hətta öz dövlərinə qədərki şeir şəkillərinə də bir sıra yeniliklər əlavə etmişlər. Şeirlərinin məzmunu və bədii dəyəri ilə heç bir aşıqla müqayisəyə gəlməyən Aşıq Ələsgər dodaqdəyməz, dildönməz, müstəzad təcnis, ərəb əlifbasının 28 hərfinin sıralandığı “əlif-lam” yaratmaqla Azərbaycan aşıq şeiri tarixində belə formalı şeir şəkillərinin əsasını qoymuşdur.

Göyçə aşıq sənətinin, aşıq şeirinin inkişafı bu bölgədə yaşamış bir sıra el şairlərinin yaradıcılıqlarına da qüvvətli təsir göstərmişdir. Aşıqlar onların qiymətli şeirlərini məclislərdə oxumaqla, müəllifini şöhrətləndirmiş, yeni-yeni əsərlər yaratmağa olan həvəslərini daha da artırmışlar.

Beləliklə, sazla söz, daha dəqiq desək, aşıqlıqla şairlik Göyçədə paralel olaraq inkişaf yolu keçmişdir.

XX əsr də öz gəlişilə xalqımıza, eləcə də Göyçədə yaşayanlara əzablı günlər gətirdi. Ürəyiyumşaqlığımızın, mərhəmətimizin sayəsində torpaqlarımızda yerləşdirib, özümüzə “qonşu” etdiyimiz xain millət 1905-1907-ci illər-

də nə qədər faciələrə səbəb oldu! Dinc əhali nə qədər məhrumiyyətlərə məruz qaldı! 1918-1920-ci illərdə Göyçə viran edildi. Düşmənlə vuruşmada neçə-neçə igidlərimiz Şəhid oldu! "Qonşu" millətin amansız cəlladları qoca demədi, uşaq demədi, ələ keçənlərin hamsını tarixdə görünməmiş vəhşiliklə qətlə yetirdilər. Bunların arasında aşıqlarımız və el şairlərimiz də vardı. Düşmənin nə qədər qəddar olduğunu bilmək üçün Aşıq Ələsgərin şəyirdi Aşıq Nəcəfin qətlə yetirilməsini yada salmaq kifayətdir.

Barışıq qoymaq adı ilə Göyçənin tanınmış adamlarını, o cümlədən Aşıq Nəcəfi Basarkeçərə çağıran daşnaqlar onun belinə qaynar samovar bağlayıb, ağılagəlməz bir işgəncə ilə öldürmüşdülər.

"Böyük Vətən müharibəsi" adlandırılan 1941-1945-ci il müharibəsi zamanı cəbhəyə yollanan Göyçə oğulları, o cümlədən gənc aşıqlar öz canları, qanları bahasına Vətəni düşməndən təmizləməkdə fəal iştirak elədilər. Onların bir çoxu həlak oldu, doğma yurda qayıda bilmədi; öz əllərilə divardan asdıqları saz müharibədən sonra da uzun müddət sahibinin yolunu gözlədi...

Sən demə, xalqımızı, eləcə də Göyçədə yaşayanları qabaqda daha dəhşətli günlər gözləyirmiş. 1988-ci ildə xaçpərəst "qoluzorlu" dövlətlərin havadarlığı və köməkliyilə xalqımızla elan olunmamış müharibəyə başlayan xain "qonşu" millət Ermənistanda yaşayan türklərin hamsını Sovet ordusu əsgərlərinin silahı gücünə doğma yurd-yuvalarından qovdu. Bu dəfə də onlar amansız vəhşiliklərlə saysız-hesabsız soydaşlarımızı qətlə yetirdilər. Yüz illərdən bəri alın tərilə qazanılmış var-dövlət yağılara qaldı. Bir çoxları əyin paltarlarını götürməyə belə macal tapmadı...

Bu amansız təqiblər zamanı orada yaşayan aşıqlarımızın da var-yoxu talan edildi. Amma onlar çəkidə yüngül, qiymətdə isə çox ağır olan sazlarını özlərilə götürdülər; onu düşmən təhqiri təhlükəsindən xilas edə bildilər.

Bir həftə müddətində Göyçədən pərən-pərən salınan göyçəlilər bütün Azərbaycana səpələnmişlər. Çoxları bir-birinin öldü-qaldısından hələ də xəbərsizdir. Bir kəndin adamlarının sorağı yüz yerlərdən alınır...

Sazın-sözün beşiyi olan ulu Göyçə indi düşmən tapdağındadır. Təbiətin bu dilbər guşəsindən didərgin düşən insanlar maddi və mənəvi əzablar içərisində, doğma yurda qayıtmaq ümidilə günlərini sayırlar. Ürəklərdə yara bağlayan Vətən dərdi, yurd həsrəti qaçqınlarımızın, köçkünlərimizin bir çoxlarını dünyadan vaxtsız köçürmüşdür. Bunların arasında aşıqlarımız və el şairlərimiz də az deyildir. Əbədiyyətə qovuşan bu saz sənətkarlarını torpağa tapşıranda, onların keçirdikləri toy şənlikləri, səhərə qədər uzanan dastan gecələri göz önünə gəlir; sazın şirin avazı, aşığın qumrov kimi ötən zəngulısi qulağımızda səslənir...

Adam təəssüflənir ki, şeir yaradıcılığından əlimizdə nümunə olmayan, lakin məlahətli səsi və sazı ilə ömürboyu şənlik məclislərini zinətləndirən ifaçı aşıqlarımızın adları, əvvəllər olduğu kimi, zaman keçdikcə unudulacaqdır. Bu da dərd üstünə dərd gətirir. Odur ki, şair aşıqlarla yanaşı, Göyçədə yaşamış ifaçı aşıqlarımızın da adlarını xatırlamağı lazım bilirik və bununla bir qədər təsəlli tapırıq. Göyçə kəndlərindən olan aşıqlar:

**ALÇALIDAN**: Aşıq Məhərrəm.

**YARPIZLIDAN**: Aşıq Vəli, Aşıq Oruc, Aşıq Əhməd, Aşıq İslam, Aşıq Əlyar, Aşıq Qasım, Aşıq Eyyub,

Aşıq Şahsuvar, Aşıq İsrayıl, Aşıq Ağa, Aşıq Muğam, Aşıq Bəhlul, Aşıq İman.

**QIZILVƏNGDƏN**: Aşıq Alı, Aşıq Qulu, Aşıq Usuf, Aıq Mustafa, Aşıq Məsim.

**SUBATANDAN:** Aşıq İsa.

**KƏRKİBAŞDAN**: Ağ Aşıq Allahverdi.

**QANLIDAN**: Aşıq Mehdi, Aşıq Balış, Aşıq Gülmalı.

**ÇAXIRLIDAN**: Aşıq Alışan, Aşıq Hüseynalı, Aşıq İbrahim.

**DAŞKƏNDDƏN**: Aşıq Nəcəf, Aşıq Abbasəli, Aşıq Əli, Aşıq Səfyar, Aşıq Ziyad, Aşıq Novruz, Aşıq Bayram, Aşıq Hacı, Aşıq Nuriddin.

**AŞAĞI ŞORCADAN**: Aşıq Bəylər, Aşıq Murad, Aşıq İslam, Aşıq İdris, Aşıq Mirzə.

**SARIYAQUBDAN**: Aşıq Məhəmmədəli, Aşıq Paşa, Aşıq Əhməd, Aşıq Valeh, Aşıq Qasım, Aşıq Nuru, Aşıq Musa, Aşıq Ələddin.

**QAYABAŞIDAN**: Aşıq Cəmil.

**QOŞABULAQDAN**: Aşıq Məhəmmədəli, Aşıq Bəhlul, Aşıq Rəcəb, Aşıq Hümmət.

**QARAQOYUNLUDAN:** Aşıq Sadıq, Aşıq Əsəd, Aşıq Məhəmməd, Aşıq Cahad, Aşıq Saleh, Aşıq Səlim.

**NƏRİMANLIDAN:** Aşıq İsə, Aşıq Mikayıl, Aşıq İslam, Aşıq Bəhman, Aşıq Fətullah, Aşıq Nəriman, Aşıq Ələddin, Aşıq Nurəddin.

**AĞKİLSƏDƏN**: Aşıq Ələsgər, Aşıq Musa, Aşıq Qurban, Aşıq Talıb, Aşıq Nəcəf, Aşıq İman, Aşıq Musa, Aşıq Cəmşid, Aşıq Haqverdi.

**ZƏRZİBİLDƏN**: Aşıq Şirin, Aşıq Məmməd, Aşıq Rüstəm, Aşıq Oruc, Aşıq İdris, Aşıq Mehralı, Aşıq Aslan,

Aşıq Nəcəf, Aşıq Daşdəmir, Aşıq Nəcəf, Aşıq Cəmil, Aşıq Sayad, Aşıq Qabil, Aşıq Əli.

**ZODDAN**: Aşıq Qasım, Aşıq Bəylər, Aşıq Ağayar, Aşıq Pənah, Aşıq Tapdıq, Aşıq Əlövsət.

**İNƏKDAĞIDAN**: Aşıq Qəhrəman, Aşıq Kərəm, Aşıq Alırza, Aşıq Qənbər, Aşıq İsmayıl, Aşıq Cavid, Aşıq Cəmşid, Aşıq Nurəddin, Aşıq İsrayıl, Aşıq Vəli.

**CANƏHMƏDDƏN**: Aşıq Meydan, Aşıq Sayad, Aşıq Qiyas.

**QARAİMANDAN**: Aşıq Ağalar.

**KƏSƏMƏNDƏN**: Aşıq Nağı, Aşıq Bayram, Aşıq Bəşir.

**GÖYSUDAN**: Aşıq Qulu, Aşıq Qasım.

**BÖYÜK MƏZRƏDƏN**: Aşıq Əziz, Aşıq Qiyas.

**KİÇİK MƏZRƏDƏN**: Aşıq Qara, Aşıq Məhəmmədəli, Aşıq Hüseyn, Aşıq Rza.

**ŞİŞQAYADAN:** Aşıq Rəhim, Aşıq Qara, Aşıq Hüseyn, Aşıq Teymur, Aşıq Şəmil.

**SADANAXAÇDAN**: Aşıq Hümmət, Aşıq Binnət.

**DƏRƏDƏN**: Aşıq Fərman, Aşıq Məcnun.

**PƏMBƏKDƏN**: Aşıq İslam, Aşıq Qoşnəli, Aşıq Qərib, Aşıq İsmayıl, Aşıq Bayram, Aşıq Əli, Aşıq Qədim, Aşıq Murtuzəli.

**BABACANDAN**: Aşıq Şükür, Aşıq Valeh, Aşıq Məhəmmədəli, Aşıq Qədir, Aşıq Xanbuta, Aşıq Kərəm, Aşıq Mikayıl, Aşıq Əmiraslan, Aşıq Yunus, Aşıq Əli.

**CİLDƏN**: Aşıq Mehdi, Aşıq Qasım, Aşıq Yunus, Aşıq Oruc, Aşıq Müseyib, Aşıq Əli.

**ARDANIŞDAN**: Aşıq Niftalı, Aşıq Məhəmmədəli, Aşıq İsə, Aşıq Bəhmən, Aşıq Kərəm.

**AĞBULAQDAN**: Aşıq Alyar, Aşıq Məhərrəm, Aşıq İmran, Aşıq Mahmud, Aşıq Abbasəli, Aşıq Dünyamalı, Aşıq Sultanəli, Aşıq Allahyar, Aşıq Məhəmmədəli, Aşıq Hüseyn.

Göyçədə yaşamış aşıqların adlarından ibarət tərtib etdiyimiz bu siyahı natamamdır. Vaxtilə Göyçənin Qaranlıq, Kəvər və Yelenovka rayonlarının kəndlərində yaşamış aşıqlar şəxsən bizə məlum deyildir. Bu siyahıda adı çəkilən kəndlərdə boya-başa yetən saz sənətkarlarından bəzilərinin yaddan çıxmağına da şübhə etmirik. Qoy bunu bizə irad tutan oxucular unudulanları yada salmaqla kitabın gələcək təkmilləşdirilmiş nəşri üçün köməkçimiz olsunlar.

Kitabda bəzi müəlliflərin əsərlərindən 3-4 nümunə verilmişdir. Deməli, əldə olunan ancaq bunlardır. Hörmətli oxuculardan bir xahişimiz də odur ki, belə şairlərin əsərlərindən kimin şeir dəftərində, yaxud yaddaşında nə varsa, onu da bizdən əsirgəməsinlər. Bu xeyirxah iş üçün onlara əvvəlcədən minnətdarlığımızı bidiririk.

**İslam Ələsgər**



# MİSKİN ABDAL
(1430-1535)

Azərbaycan ədəbiyyatında Miskin Abdal adı ilə tarixə düşən Seyid Hüseyn 1430-cu ildə qədim Göyçə mahalının Sarıyaqub (Zərgərli) kəndində anadan olub.

Hüseynin babası Cəfər, atası Məhəmməd Ərdəbil şeyxlərinin ən sınanmış müridləri kimi Göyçədə sufiliyin təriqət ideyalarının yaranmasına hamilik etmişdilər. Miskin Abdal Şah İsmayıl sarayında aşıq-sufi ədəbiyyatının binasını qoyur. 1524-cü ildə sarayla birdəfəlik vidalaşaraq doğma yurduna – Göyçə mahalına qayıdır. Ömrünün ahıl çağlarında Sarıyaqubda açdığı ilk məktəb Göyçənin elm, irfan, sənət dünyasında mühüm rol oynayır. “Miskin Abdal və Sənubər” dastanı şairin ömür yolundan bəhs edən məhəbbət dastanıdır, “Şah İsmayıl və Miskin Abdal” dastanı isə öz ideya-bədii xüsusiyyətlərinə görə məhəbbət və qəhrəmanlıq dastanlarından fərqlənir. Bu dastanın süjetində real tarixi hadisələr dayanır. “Aslan şahla İbrahim”, eləcə də “Yetim Hüseyn” dastanları isə Göyçənin saz-söz ustalarının söylədiklərinə görə Miskin Abdal tərəfindən yaradılmışdır. Miskin Abdal 105 yaşında 1535-ci ildə Göyçə mahalının Sarıyaqub kəndində vəfat etmişdir. Onun yaşadığı ev, uyuduğu məzar müqəddəs ocaq kimi uzun əsrlərdir ziyarət edilməkdə idi.

Miskin Abdalın şeirləri “Göyçə ustadları” antologiyasında əldə olunan sayda verilmişdir və buradakı onun şeirlərindən nümunələrdir.

## *QOŞMALAR*

## DAĞLAR

Məğribdən məşriqə səf çəkib durub,
Qüdrətdən çatıbdı baş-başa dağlar.
İtaət boynuna salıb həmayıl,
Misli pəsənd, xotkar, xan, paşa dağlar.

Baxıb hökmü yekdal dürrey, dükafa,
Gah kükrərsən, gah gəlirsən insafa.
Pey peykərə çəkib, bəyaz ləffafə,
Pərvərdin geydirib qumaşa dağlar.

Ağ çeşmən sərindən car elər seli,
Yaşıl tirmə qurşar, ədağa beli.
Dağıstan kölgəsi, zabitə yeli,
Sərin səfalıdı həmişə dağlar.

Baxıb hökmü-yekdal, dürrey-dükafa,
Gah kükrərsən, gah gələrsən insafa.
Pey peykərə çəkib, bəyaz ləffafə,
Pərvərdin geydirib qumaşa dağlar.

Nəs illərdən satın aldın pis günü,
Çağırdın dumanı, tökdün çişkini.
Gözü yaşlı qoydun cüda Miskini,
Eylə gülə-gülə tamaşa, dağlar.

## QALDI

Bahar vaxtı yol başdadım Təbrizə,
Günüm qaldı, ayım qaldı, il qaldı.
Öz elimdə mələkmisal gözəllər-
Yanax qaldı, dodax qaldı, tel qaldı.

Savah-savah yarpaqlara şeh düşür,
Gül bülbülnən, bülbül gülnən öpüşür.
Asimanda ulduzdarı sayrışır,
Tufan qaldı, şimşək qaldı, sel qaldı.

Bu güllərdən dəstələ, al əlinə,
Miskin Abdal, apar canan elinə.
İzin versə, düz yarının telinə,
Çəmən qaldı, çiçək qaldı, gül qaldı.

## *GƏRAYLILAR*

## NƏDİ

Tərs gəlib fələyin işi,
Lil axan arxdımı, nədi?
Fani dünyanın gərdişi
Dolanan çarxdımı, nədi?

Qalanıb kürsün kürəsi,
Odlanır gözün görəsi,
Tutulub yanı-yörəsi,
Bir görən yoxdumu, nədi?

Miskin Abdal, işin xata,
Ünün gedib ərşə çata...
On iki ay müdam yata,
Görəsən baxdımı, nədi?

## DÜŞƏRSƏN

Adamsansa, tələ qurma,
Tələyə, fəndə düşərsən.
Üzə durma, ara vurma,
Zülmündən anda düşərsən.

Hər yetənlə olma tanış,
Yazın olar boranlı qış.
Fikir eylə, sonra danış,
Qəfil kəməndə düşərsən.

Miskin Abdal, vəfadar ol,
İlqarında düz ilqar ol,
Çətin günə şükürdar ol,
Dönüb asanda düşərsən.

## ALLAH, ÖLÜMÜM HAQDI

Bu dünya, o dünya var,
Allah, ölümüm haqdı!
Bir dirilik suyu var,
Allah, ölümüm haqdı!

Axırın puçdu, dünya,
Var ikən heçdi dünya.
Hey gəldi, keçdi dünya,
Allah, ölümüm haqdı!

Abdal, yastıq daş olar,
Üst torpağın yaş olar.
Mələklər yoldaş olar,
Allah, ölümüm haqdı!

## *DİVANİ*

### MƏNİ

Çərxi-fələk yarıtmadı
Dövlətdən, vardan məni;
Min bir dərdi-əzab verib,
Ayırdı yardan məni;
Səkrəqibin fitnə-feli,
Çəkdi məni çarxına,
Yazıq Həzrət İsa kimi,
Asdı divardan məni.

Türk əcəmə, əcəm türkə
Zülm eyləsə, günahdı;
Hər ikisi bir kökdəndi,
Yaradan da Allahdı;
Öz elinə düşmən kəsin
Axır günü kütahdı;
Qadir mövlam, uzaq eylə
Bayquşdan, sardan məni.

"Qırxlar piri" özü verib
Dərsimi ümman mənim;
Çətin girə ürəyimə,
Ləini-şeytan mənim;
Seyyid Miskin Abdal mənəm,
Söz mənim, meydan mənim,
Qoruyanım, özün qoru,
Xain dostlardan məni.



## AĞ AŞIQ ALLAHVERDİ
(1754-1860)
(**şəkil şərtidir**)

Ağ Aşıq Allahverdi 1754-cü ildə Sulduzda Qara Osmanoğlunun ailəsində dünyaya göz açmışdır. Sonra ailəsilə Şəril mahalının Kosacan kəndinə köçmüşdür. Dədə Qorqud kimi Aşıq Allahverdinin də saç-saqqalının, qaşlarının, kipriklərinin tükü dümağ imiş və dərisi də adi insanların dərisi rəngində olub. Ustadın haqqında bəzi uydurmalar onun görünüşünün, istedadının qeyri-adiliyindən əmələ gəlmişdir, eyni zamanda el arasında Ağ Aşıq Allahverdi kimi tanınmışdır. Atası Qara Osmanoğlu dövrünün tanınmış aşıqlarından olmuşdur.

Ağa Məhəmməd Şah Qacarın hakimiyyəti dövründə müharibələr nəticəsində yaşayışın ağırlaşması səbəbindən Ağ Aşıq Allahverdi həyat yoldaşı Süsənbər, bacısı Ümmülbanu, oğulları Məhəmməd və İsmayılla Göyçə mahalının Kərkibaş kəndinə pənah gətirmişdir. Aşıq Alının ustadı olmuşdur.

Ustad Aşıq 1860-cı ildə Kərkibaş kəndində dünyasını dəyişmiş və qəbri həmin kənddədir.

**Qeyd:** *Ağ Aşıq Allahverdinin şeirləri şair Məcnun Göyçəlinin arxivindən götürülmüşdür. "Göyçə ustadları" antologiyasında Ağ Aşıq Allahverdinin əldə olunan son 50-dən çox şeir və bayatıları nəşr edilmişdir. Burada həmin şeirlərdən nümünələr təqdim olunur.*

## *QOŞMALAR*

### QAYITDI

Bir maral baxışlı, ceyran cilvəli,
Gəldi məni gördü, güldü qayıtdı.
Pünhanı göstərdi gül camalını,
Buxağına şəbnəm doldu, qayıtdı.

Mən görmüşəm gözəllərin çoxunu,
Belə olmaz, ancaq boyu, buxunu.
Müjganından çəkib xədəng oxunu,
Yaralı sinəmə çaldı, qayıtdı.

Gözləyərkən gözlərimə sataşdı,
Xəstə canım eşq oduna alışdı.
Şəhrayıdan qıya baxıb ötüşdü,
Ağ Aşığa nəzər saldı, qayıtdı.

### GİLLİ

Dərya kimi çalxalanır, daşırsan,
Salırsan Göyçəyə qalmağal, Gilli!
Xan, bəy kimi öz həddini aşırsan,
Yolçuya vermirsən sən macal, Gilli!

Novbahar gələndə tüğyan edirsən,
Bir ildə ən azı, yüz qan edirsən,
Gedəni-gələni peşman edirsən,
Dad eylər əlindən bu mahal, Gilli!

Müddətdir vətəndən düşmüşəm uzaq,
Əl çəkmir yaxamdan pristav, kazak.
Öldürdün atımı, özüm qaldım sağ,
Canımda qalmayıb daha hal, Gilli!

Allahverdi kimə desin bu dərdi?
Bəzirganam, yüküm qəmdi, kədərdi.
Xalqın dərdi mənimkindən betərdi,
Salan yoxdur, bir üstündən yol, Gilli!

## OLMAZ

Dedim, könül, bacar yaxşılıq eylə,
Həmişə əlində ixtiyar olmaz.
Çox da bel bağlama dünya malına,
Nə mala, nə mülkə etibar olmaz.

Yaxşı olar mərd igidin təməli,
Namərd də əl tutmaz heç kəsə, bəli!
Hər qul Qənbər olmaz, hər ağa Əli,
Hər qılınc kəsməklə Zülfüqar olmaz.

Ey nazənin, sən geydiyin nə aldır,
Yenə başındakı hansı xəyaldır?
Birisi büdrəsə, qolundan qaldır,
Hər zaman dost-dosta səbəbkar olmaz.

Aşıq oldun, hər ağrıya dözəsən,
Sinən üstə odlu közlər əzəsən.
Gündoğanla günbatanı gəzəsən,
Allahverdi kimi xiridar olmaz.

## *GƏRAYLILAR*

### BƏNÖVŞƏLƏR

Sən baharın qonağısan,
Boynuburuq bənövşələr.
Eşq əhlilər qınağısan,
Boynuburuq bənövşələr.

Məcnun Leyli xəyalında,
Kərəm Əsli sorağında.
Qurbaninin qəm bağında,
Boynuburuq bənövşələr.

Ağ Aşığın bəxti kəmdi,
Fələkdən bu, bir sitəmdi.
Dərdi bil səndən betəmdi,
Boynuburuq bənövşələr.

### ELİM GƏLƏ

Bahar gəldi bu dağlara,
Gülüm gələ, gülüm gələ.
Yay olanda yaylaqlara,
Elim gələ, elim gələ.

Gözəlləri söhbət sözüm,
Şövqə gələ telli sazım.
Cövlan edə xoş avazım,
Gül hüsnünə bilim gələ.

Ağ Aşığın xoş çağıdı,
Göy yaylaqlar oylağıdı.
Göyçə bir gülşən bağıdı,
Tərifinə dilim gələ.

## SƏNİN

Alçaqlı, ucalı dağlar,
Xub əsir yellərin sənin.
Bəlli deyil yazın, qışın,
Qar qucar bellərin sənin.

Yay olanda gülün qaynar,
Ağır ellər səndə yaylar.
Bir cüt yaşılbaşlı oynar,
Bulanar göllərin sənin.

Güllərin solğun olmasın,
Süsən-sünbülün solmasın.
Yad yerdən ovçu gəlməsin,
Bağlansın yolların sənin.

Allahverdi, budur yurdun,
Nə bir yerdə məskən qurdun.
Xub gözləyib, dürüst vurdun,
Qurusun qolların sənin.

## SÜSƏNBƏRƏ

Sərdar səni iflic vursun,
Ünüm yetməz Süsənbərə.
Qərib-qürbət diyardayam,
Ünüm yetməz Süsənbərə.

Ay dolandı, ilə gəldi,
Şeyda bülbül gülə gəldi,
Telli sazım dilə gəldi,
Ünüm yetməz Süsənbərə.

Ağır illər ötürmüşəm,
Ömrü başa yetirmişəm,
Məhərrəmi itirmişəm,
Ünüm yetməz Süsənbərə.

## DOLANA-DOLANA

Dağlar, səndən duman qalxar,
Çərxə dolana-dolana.
Göy guruldar, şimşək çaxar,
Çərxə dolana-dolana.

Tər çiçəklər ilməyindi,
Nərgiz-çəmən köynəyindi.
Duman çalman–diləyindi,
Çərxə dolana-dolana.

Ağ Aşıqtək havalısan,
El-obanın cəlalısan.
Bahar fəsli davalısan,
Çərxə dolana-dolana.



## ŞAİR MƏMMƏDHÜSEYN
(1800-1880)

Məmmədhüseyn Həsən oğlu 1800-cü ildə Göyçə mahalının Daşkənd kəndində anadan olmuşdur. O, heç bir təhsil almamışdır. Şairin böyük qardaşı Əli Ərdəbildə və İsfahanda 8 il ruhani təhsili almışdır. Məmmədhüseynin atası dülgər olsa da, bütün varlığı ilə aşıq sənətinə bağlanmışdır. Elə Məmmədhüseynin də şair olmasında atasının az təsiri olmamışdır.

Məmmədhüseyn bədahətən şeir deməyə qadir bir şair imiş. Daşkənddə yaşayan "Şairlilər" nəsli şairin adı ilə bağlıdır və onun nəsil şəcərəsinin üzvüləridir. Şair Məmmədhüseynin Kərbəlayi Məhəmməd, Kərbəlayi Əsəd, Əbülfət, Əli və Xəlil adlı beş oğlu olmuşdur. Böyük sənətkar müqəddəs Kərbəlanı oğlu Məhəmmədlə birgə ziyarət etmişdir. Deyilənə görə uca boylu, qədd-qamətli, iri gövdəli adam olub. Qalın çatma qaşları ona xüsusi yaraşıq verərmiş. Əkinçiliklə, maldarlıqla məşğul olub.

Şair Məmmədhüseyn 1880-ci ildə qabaqcadan özünə agah olmuş olan ilan çalması nəticəsində doğma Daşkənd kəndində vəfat etmiş və orada dəfn olunmuşdur.

## *QOŞMALAR*

## MƏNİM

Ay ağalar, nə bəlalı qul oldum,
Tapılmır dərdimə dəvalar mənim.
Fitnəkar kəslərin hökmü ucundan
Yığışır sinəmə yaralar mənim.

Baş götürüb çıxdım Göyçə elindən,
Yağı düşmən oynamasın yerindən.
Ay ellər, düşmüşəm haqq nəzərindən,
Gəlibdir başıma bəlalar mənim.

Şikəstə könlümün gözləri nəmli,
Sinəm dərdli, qəmli, həm də vərəmli;
Bir mirzə istər ki, əli qələmli,
Mən deyəm, dərdimi yazalar mənim.

Məmmədhüseyn, dünya fanıdı-fanı,
Taxtından endirdi çox Süleymanı.
Haraya çağırdım Şahi-Mərdanı,
Yetişsin dadıma ağalar mənim.

## NƏ DEYİM

Qadir Allah, sənsən mənim pənahım,
Qanlı leşkar hücm etsə, nə deyim?
Bu dünyada gizli olan günahım
Qiyamətdə aşkar olsa, nə deyim?

Qadir Allah, sən rəhm eylə naçağa,
Qoyun necə tab gətirsin bıçağa.
Qoyarlar məzara, bükərlər ağa,
Nəkreyinlər sual sorsa, nə deyim?

Bir ağrı ki başdan enəndə cana,
Əcəl gələr, ömrü yetər bədfana.
Əzrayıl xışmında vuranda cana,
Haqq əmridir, canım alsa, nə deyim?

Bu sözlərim mütəllifə yetməsə,
Qəbul olub, həmdi-surəm ötməsə.
Kəlməm danışmağa dilim tutmasa,
Haqq əmridir, gürzün çalsa, nə deyim?

Məmmədhüseyn doymaz dünya bəhsindən,
Oxumuşam əlifbeydən, yasindən.
Nəkreyenin qilü-qallı səsindən,
Məzar qızıb odla dolsa, nə deyim?

## NEÇƏDİR

Məndən salam olsun arif olana,
Bu dünyanın cəm ümmanı neçədir?
Ərşdən göndərilən əziz Quranın
İçində yazılan nunu neçədir?

Məhəmməd hümməti haqqa bağlıdı,
O kimdir, haqq üçün sinədağlıdı.
Nədən söz açanlar əzəl ağladı,
Yasin surəsinin sini neçədir?

Məmmədhüseynə doğru-dürüst bax indi,
Gördünmü zərbini, bəri bax indi!
Öyünürdün, bacarırsan, çıx indi,
Gərdişi-rəftarın yönü neçədir?

# *TƏCNİSLƏR*

## QALANAR

Bimürvət kəslərin olmaz kölgəsi,
Vəfalı dost, dost oduna qalanar.
Fitnə-fəsad ilə uyuşan insan
Azar yolun müdam, qilü-qal anar.

Xudam xəlq eyləyib, alışam məni,
Düz əhdə, ilqara alışam məni.
Dostun dar günündə alı şam məni,
Sonra sinəm üstə istər qala nar.

Məmmədhüseyn qananlara calanar,
Qanmaza ha cala heyva, cala nar…
Gədadan uzaq ol, axır calanar,
Tökülər arada olub-qalan ar.

## A YANA-YANA

Bir Leyliyə ürcah oldum, nə oldum,
Məcnunam eşqindən, ay ana-ana.
Özü getdi, saldı məni bu oda,
Qalmışam əlində, a yana-yana.

Süzdürüb oynatdı ala gözünü,
Ya öləm, ya canım ala gözünü.
Göz açdım, gəlmədi alagöz ünü,
Zülfün daramışdı, a yana-yana

Məmmədhüseyn, yön çevirrəm yaracan,
Qibləgahım o qapıdı, yar açan.
Kim söyləməz belə gözəl yara “can”,
Qalmışam adını, ay ana-ana.

## ÇAL, A ÇAL

Ağırdır cavanın işvəsi, nazı,
Sənə cahal nə gərəkdir, çal, a çal?
Yolunu gözləyər, hörmət saxlayar,
Qismətdirsə, əgər qoca çala çal.

Necə meyl etmisən belə gülə sən,
Açılarmı eyni, min də güləsən.
Halın ki, qalmayıb təzə gül üzən,
Kəməndini özün kimi çala çal.

Sən yatırsan, onun fikri yazadı,
Şux qəlbi gizlicə işrət yazadı.
Məmmədhuseyn deyər, bir də yaz adı,
Görəmməzsən çatır əcəl, çal, a çal.

## DİL-DİLƏ

Könül, uyma hər yetənə, yad olar,
Ömrünə vəfalı şirin dil-dilə.
İstəmə ay üzlü, türfə gözəli,
Ömrü boyu sənnən ötə dil-dilə.

Gözəl gərək hər dərsini cəm ala,
Fikir verə mərifətə, camala.
Könül vermə bütün aləm cəm ola,
Toxunmasan yarla əgər dil-dilə.

Məmmədhüseyn, axtar sənə yar olan,
Bağlan bir soyluya, ona yar ol, an.
Tap bütün ömrünə arxa, yar olan,
Dəm verməz heç zaman əhlidil dilə..

## DÜZƏ GƏL
## (cığalı təcnis)

Günah etdin, saldın illər xəstəsi,
Yaxşı – yaman bəd gətirər, düzə gəl.
        Mən aşiq, düzə gəl,
        At əyrini, düzə gəl.
        Boyuna inci, mərcan,
        Sən də düzə-düzə gəl.
İlqar-iman, əhdi-peyman yad olsa,
Can yığışır topuqlardan düzə gəl.

Geyinibsən ipək, qumaş, al yenə,
Yanaqların lalə kimi, al yenə.
        Mən aşıq, al yenə,
        Bir könlümü al yenə.
        Ya göstər ay camalın,
        Xəstə canım al yenə.
Busə alım, de ürəkdən: – Al, yenə,
Şair könlüm vəsfin-vəsfə düzə gəl.

Məmmədhüseyn istər üzdə xalını,
Gəl, döşərəm yolun üstə xalını.
        Mən aşıq, xalını,
        Göstər üzdə xalını,
        Möhnətin üzdü məni,
        Gəl göstərim xalını.
Gecə-gündüz arzularam xalını,
Seyr etməyə çəmənə gəl, düzə gəl,

## YA ƏLİ, FƏRYADİ RƏS

Canişini-mustafasan, ya Əli, fəryadi rəs!
Sadiqi şəhri vəfasan, ya Əli, fəryadi rəs!
Bəs sənin günəş camalın sureyi yasindimi?
Yoxsa ki, ərşi-əlasan, ya Əli, fəryadi rəs?!

Şövkəti ali-əbasan, şəritətin rəhbəri,
Həsən, Hüseyn babasıtək yerə qoydun şapəri!
Mən ki, sənin aşiqinəm, yada sal mən müstəri,
Nə nazəli mübtəlasan, ya Əli, fəryadi rəs!

Cəbrayıl vəhy gətirəndə peyğəmbər də tutdu rah,
Yetişdi ərşi-əzəmə, sanasan ki, yüzdü şah...
Büraq dilə gəldi gedə bilməm – deyə çəkdi ah,
Qeyibdən gələn sədasan, ya Əli, fəryadi rəs!

Cəbrayıl der: “Ya peyğəməbər, meracın olsun qəbul”,
Buyur gedək behiştdə, ümmətin olmasın məlul.
Bax Xudanın hikmətinə, orda əcaib dəlil,
Zahir, batil bir fətasan, ya Əli, fəryadi rəs!

Məmmədhüseyn der, ya Abul Həsən, Abu Turab,
Ay ilə gün birləşəndə kimsə etməz ona tab.
Didələrdən qan axanda olar həşti inqilab,
Fəqirlərə son pənahsan, ya Əli, fəryadi rəs!

## DEYİŞMƏ

**Axund Əsgər:**

Səndən xəbər alım, ay əmri-maarif,
O nə idi, ərşdən araya gəldi?
Kimiydi meydanda durdu, çağırdı,
O, nə idi mindi oraya gəldi?

**Şair Məmmədhüseyn:**

Haqqtala əmr etdi Məhəmməd üçün,
Qurani lətifdi, araya gəldı.
Salsaldı, meydanda durdu, çağırdı,
Əli düldül ilə oraya gəldi.

**Axund Əsgər:**

Kim idi, dünyanı bir qərəl bildi,
Kim idi, səhrada gəzirdi buldu?
Kimiydi buyurdu, kimiydi endi,
Kimiydi yanınca oraya gəldi.?

**Şair Məmmədhüseyn:**

Vəssalam dünyanı bir qərəl bildi,
Talibdi səhrada gəzirdi, buldu:
Haqq tala əmr etdi, Cəbrayıl endi,
"Salam"da yanınca oraya gəldi.

**Axund Əsgər:**

Mən Axund Əsgərəm, oxuram billah,
Ayətəl – Quranı Səmədlüillah.
Söylə, nədən zöhr olundu Seyfullah, (zühr)
Onlar hardan çıxdı, oraya gəldi?

**Şair Məmmədhüseyn:**

Şair Məmmədhüseynəm, oxuram billah,
Ayətəl quranı Səmədül illah.
Bir almadan zöhr olundu Seyfüllah,
Düldül daşdan çıxdı, oraya gəldi.



## ŞAİR ALMƏMMƏD
(1800-1868)
**(şəkil şətidir)**

Şair Alməmməd məşhur Aşıq Ələsgərin atasıdır. O, təxminən, 1800-cü ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olmuşdur.

Alməmməd böyük bir ailənin qayğısını çəkmişdir: Ələsgər, Saleh, Xəlil, Məhəmməd adlı dörd oğlu; Fatma, Qızxanım adlı iki qızı olub.

Əsas məşğuliyyəti əkinçilik olan Alməmməd ailəni dolandırmaqda əvvəllər çətinlik çəkmiş, bir müddət Kəlbəcərin meşələrindən ağac daşıyaraq, ondan kürək, şana, dırmıq, çömçə, qaşıq, hövsər, çanaq və sair təsərrüfat, məişət əşyaları düzəldib satmağa məcbur olmuş, sonra isə bir dəyirman tikib, dəyirmançılıq eləmişdir.

Alməmmədin yaradıcılığından əlimizdə olan dörd-beş nümunə onun həm də istedadlı el şairi olduğunu göstərir. Aşıqlar bu şeirləri dastan söyləməyə başlayanda bir ustadnamə kimi oxuyurlar. Əslində adı "Əliməhəmməd" olan Alməmməd şeirlərində adını "Məhəmməd" şəkilində işlətmişdir. Oğlanları Aşıq Ələsgərin və Şair Məhəmmədin şeir deməyə həvəs göstərməsində Alməmmədin təsiri az olmamışdır.

Alməmmədin atası Allahhverdi də şair imiş, fəqət şeirlərindən heç biri əldə olunmamışdır.

Şair Alməmmədin əldə olunan aşağıdakı şeirləri vardır.

## *QOŞMALAR*

## EYLƏR-EYLƏR

Bir elə kişinin tut ətəyindən,
Aləmə imdadı ol eylər-eylər.
Zərrəcə üstündə olsa nəzəri,
Yerdən daş götürsən, ləl eylər-eylər.

Böhtan demə, böhtan tutar adamı,
Qul eylər, bazarda satar adamı.
Cəhənnəm odundan betər adamı
Yandırar kasıblıq, kül eylər-eylər.

Düz yoldan azanı tez tapar qada,
Doğruluq nemətdi həddən ziyada.
Alməmməd də bir at minər üqbada,
Sualsız Cənnətə yol eylər-eylər.

## İNSAN

Axırı fikr eylə, qafil dolanma,
Qəlbini şeytandan yad elə, insan!
Elə iş tut, aqibətdə utanma,
Bacar könül yıxma, şad elə, insan!

Bu dünya dediyin fanıdı – fanı,
Əvvəl Nuh gəlmişdi, qalmayıb, hanı?!
Puç eylədi İsgəndərtək xaqanı,
Bizə də əsəcək bad elə, insan!

Alməmməd dünyada hələ bihuşdu,
Bənadəm dediyin vətənsiz quşdu,
Səxasız dövlətin axırı puçdu,
Ye malın, dəhanda dad elə, insan!

## ŞİRİN-ŞİRİN

Varıb dost köyünə mehman gedəndə,
Süzülür sinəmdən tər şirin-şirin.
Bu yerlərin əcəb seyrangahı var.
Gətirir bağçalar bar şirin-şirin.

Bir qəmər taylıdı, ləbləri püstə,
Həsrətin çəkməkdən olmuşam xəstə.
Bir ləhzə başımı al dizin üstə,
Can verim yolunda yar, şirin-şirin.

Məhəmmədəm, sənə qurban olum, yar,
İzin versən, qol boynuna salım, yar,
Gəlmişəm bağına bağban olum, yar,
Budağından dərim nar, şirin-şirin.

## *DİVANİ*

## GÖRMƏDİM

Dünya, sənin gərdişinlə
Başa varan görmədim.
Qəhr oldu aləm işindən,
Can qurtaran görmədim.
Bilmirəm ki, səbəb nədi,
Şadı qəmgin eylədin;
Abadını viran qoydun,
Artdı haran, görmədim.

Kəsilməz mürdə karvanı,
Qəflə işlər, köç gedər;
Nə imranlar nakam qoydun,
Didəsindən yaş gedər.

Yetmiş iki millət ki var,
Əli səndən boş gedər;
Yanısınca malü-dövlət,
Pul aparan görmədim.

Alməmmədəm, bu dünyada
Bir nişanım qalmadı;
Getdi əldən qohum-qardaş,
Ata-anam qalmadı.
Süleyman tutdu dunyanı,
Dedi: "Mənəm!" – qalmadı;
Bir kəs ilə heç düz ola
Sənin aran görmədim.



## AŞIQ ALI
(1801-1911)

Aşıq Alı 1801-ci ildə Göyçə mahalının Qızılvəng kəndində anadan olmuşdur. Aşıq Alının atasının adı İmirzə (Mirzə), anası Fatma (Fatimə), bacısının adı Pəridir. Aşıq Alının Məhəmməd, Abdulla, İsmayıl adında 3 oğlu, Sənəm, Mələk adında 2 qızı olub.

Aşıq Alı Ağ Aşıq Allahverdinin şəyirdi olmaqla dini təhsil də almışdır. Ustad sənətkar şeirlərini deyilənə görə, ərəb əlifbasında kağıza da köçürmüşdür, fəqət həmin yazılar sonralar it-bata düşüb, hələlik üzə çıxmayıb.

Aşıq Alının 1934-cü ildən bu yana bir neçə şeir kitabları nəşr olunmuşdur.

Aşağıda ustadın divanilərini və bir dodqaqdəyməz cığalı təcnisini təqdim edirik:

## *TƏCNİS*

### YARA YAR
(dodaqdəyməz cığalı təcnis)

Qəddah qəhr eyləyər, dərdi-sər artar,
Sədasından həsrət qalar yara yar.
        Aşiq sənsən, yara yar,
        Dərd səddini yar, a yar.
        Tənha qalan haraylar:
        Dada yetiş, yar, a yar.
Hədyan ərz eyləsə nadan lisanı,
Sadiq qalar sənə aqil yar, a yar.

Dərdikeş qayəsi dərdə sarıdı,
Əyirdi dərdləri dərdə sarıdı.
        Aşiq dərdə sarıdı,
        Dərd əsiri sarıdı.
        Qəsrin şaha layiqdi,
        Nədən rəngi sarıdı.
Canansız xanələr dərd asarıdı,
Əhlihallar yar dərdinə yarayar.

Qəhrin sədasına tərsalar ağlar,
Can naçar qalanda, tər salar ağlar.
        Aşiq tər salar ağlar,
        Yaylıq tər salar, ağlar.
        Haqqına ar alana
        Desən, tərs alar, ağlar.
Alı yaddan çara tərs alar, ağlar,
Yar yaranda sayalanar yara, yar.

## *DİVANİLƏR*

## BİRDİ-BİR

Ərşdə xaliq, yerdə züllah[1],
Evdə ata birdi-bir;
Bəzək vuran, qurğu quran
Kainata birdi-bir;
Bu günahı keçməz xaliq,
Haqq səni bağışlamaz –
Ya öldürdün, ya öldürtdün,
Bu cür xəta birdi-bir.

Qüdrət qamət bəxş etmişdi,
Fələk vurdu belimdən;
Leyli-nahar car eylərəm
Nəsihətlər dilimdən;
Tənəli söz bəd yaranıb
Qərəzlidir ölümdən;
Həbib səni gözdən sala,
Ya da ata, birdi-bir.

Alı, səni düymaz nadan,
Sərraf salar yadına.
Zati-pakdan halal olan,
Tez yetər muradına;
Əzrail gürzün çalanda
Kimsə yetməz dadına;
Ya bəhri-bar badə verə.
Ya baxt yata, birdi-bir.

---

[1] zühur

## İKİDİ

Əbcəd ilə "A" oxudum,
Ol Allahı bir bildim.
Yaradandan qeyri nə var,
Bu həyatda ikidir.
İki "sə"ni bir oxudum,
O billahi bir bildim;
O billahın hikmətində
Süd də, zat da ikidir.

Bədənində düzülübdür,
Əzaların iki şər;
Ölüm-dirim ikilidir,
İkiləşər xeyir-şər;
Səbir cütsə, səbir eylə,
O cütlükdə yoxdu şər.
Usta birdir, nə yaradıb,
Hesabatı ikidir.

Cüt ünsürlər iki yerdən,
İki göydən birləşər.
Abı, atəş, xaki-baddan
Ruzi tapıb bu bəşər;
Dərin fəza boş deyildir,
Ordan yerə nur düşər…
Alı, cütlük təzaddır,
Hər bir qatda ikidir.

## ÜÇƏDİR

Bəni-insan xəlq olandan
Hesabatı üçədir.
Kəlmeyi-şəhadət beytin
İlk misrası üçədir.
Dövran açdı sirrini,
Küllü-aləm yarandı.
Zat, süd, övlad gərdişinin
Davaməti üçədir.

“Cim”, “bey”, “əlif” bazarında,
Sövdəgardı kafi-cim;
“Kafi”i, “bey”i əl-ayağı,
“Vov”u əlsiz ərəccim;
“Kafi”i – “cim”də bir “əlif” var,
Nəqş olunub çox nəcim;
Üç səqirə dayaq dövrü
Kəraməti üçədir.

Nuh övladı xidmətində
Vurar başa, ayağa;
Gah dayağı olar başda,
Gah ayaqdır dayağa;
Bu bazarda xidmətini
Bacarırsan say, ağa;
İki yolla dövran eylər
Hər sifəti üçədir.

“Yek” yaradan, “du” yaranan
Gözəllikdə gözəldi;
Cəmi üçə dəlalətdi,
Cümlə aləm düzəldi;

Aşıq Alı mürəxxəsdi,
Bu dünyadan üz əl, di;
İki dayaq bəs eyləməz
Tələbatı üçədir.

## DÖRDDÜR-DÖRD

Ay səf çəkər il işində,
Həftə kafi dörddü-dörd.
Bahar fəsli "yek" sel eylər,
İftixarı dörddü-dörd.
Həsdir, Kəbə, Nəcəf, Məşhəd,
Səcdəgahlar diyarı;
Uçar qonar mürği-ruhum
Pir diyarı dörddür-dörd.

Cahargahnan qərar tutdu,
Əşya yerdə dayandı.
Sənət sərmayə hökmündə
Sayaları bəyandı.
Səməndərin cismi-canı
Odda söndü, həm yandı;
İstər uçan, istər qaçan
Balu-pəri dörddür-dörd.

Şəmsi xilqət şərəflidir,
Ulılardan uludu;
Kərəm eylər nanu-nəmək
Bəhrələnib, doludu;
Gərdişimə növraq verən,
Səltənətin yoludu;
Bəyan edir cəhətləri,
Ünvanları dörddür-dörd.

Neçə çeşmə qərar tutdu
Müdam nəhrin içində;
Neçə nəhr ümman oldu
Saysız qəhrin içində;
Neçə ümman dərya oldu,
Bir sehirin içində;
Dəryaların pür dəryası,
Nəhəng varı dörddür-dörd.

Hey oxudum, hey aradım,
Axır qaldım bisavad;
Fəzli elə bir həmdəmdi,
Kimsənəyə deyil yad;
Aşıq Alı, zikr eylə,
Abı, atəş, xakı, bad;
Aşkar etdim dövranımın
Səbəbkarı dörddür-dörd.

## BEŞDİ

Vücudi-adəm üstündə
Fəhm et, budağı beşdi.
Dörd balu-pər kənarında
Seyr et, yarağı beşdi.
Vuran, görən, bilən əhli
Əsasıdır vücudun,
Üçü aşkar, iki pünhan,
Bais marağı beşdi.

Şərafət nazil olanda
Haşim övladlarına;
Yüz on dörd surə bəxş oldu
Ol Xudadan adına;

Sidqinən iltimas eylə,
Yetər mömin dadına.
Hökmü aşkar, özü baqi,
Əsl mərd ağa beşdi.

Kənar etməz bəni-insan
Candan dərdi, nə qəmi;
Mövciyyat təqdir etdi,
Yox tədbirin nə cəmi;
Bətni-ana, tifil novrəst,
Əri piran aləmi.
Cəm eyləsən birər-birər,
Yazsan, varağı beşdi.

Alı, çağır imdadına
O şahların şahını.
Müqəddəs xak kənar etməz
Ərşi-əla ahını.
Bəşər üçün kəlam yazdı
Həqiqətin xakını.
Söfvt, Tövrat, Zənbur, İncil,
Quran sorağı beşdi.

## ALTIDI

Çərxi-pirə salam edən,
Səyyarələr altıdı.
Adınaya cəhd eyləyən
Ruziləri altıdı.
Əfsəl, Mürsəl gəldi-getdi
Neçə rəsul dünyadan.
Ünvanları bərr-haqq qılan
Pür dəryalar altıdı.

Altı dəsgah oxuyanlar
Az qaldılar lal ola.
Zənbur bu san şan hörəndə
Bəhrə verər, bal ola;
Sanki bu san dühasıyla
Uya dalbadal ola;
Bətni zəmin hesabıyla
Ağ-qaralar altıdı.

Altı-altı məskən saldı
Qüdrət aləm Quranda.
Bu san ilə hesab aldı
Sərdabələr duranda;
Cümlə-aləm abad olar
Haqqın gürzü vuranda;
Dağ Yunisdən də kənara
Qaçan biçar altıdı.

Saya-saya san itirdim,
Alı, son qoy hesaba;
Hesabını çəkməyənə
Kimsə deməz “Mərhaba!”.
Surəti yoxdu meylərin,
Doldur, cəm et bir qaba;
Dördü xakda, cütü canda
Gübaralar altıdı.

## YEDDİDİ

Xaki-zəbun ünvanında
Cəm turabı yeddidi.
Səri-kuydə çeşmə birdi,
Xalis abı yeddidi.

On ikidi abdal sayı,
Əllikidi əzası;
Hər əzanın qüdrətindən
Şabı-tabı yeddidi.

İxtisar eyləmə ayət
İki cismin kəc deyə;
Yetiş elin harayına,
Yubanma fəraq deyə;
Fərbah deyə kar eyləsən,
Düşsən haqqa səcdəyə.
Əzalardan xaka dəyən
Can hesabı yeddidi.

Sər hesaba, qəlb hökmüylə
Cisim aləm bəhrəsin;
Əlvan eylər vücudları,
Açar rəmzin çöhrəsin.
Kimsə görməz əzaların
Bir nöqtəsin, bir nəsin;
Xani-cövlan edən canda
Bir girdabı yeddidi.

Nəzər eylə asimana,
Sirri qalıbdı hesab;
Aşıq Alı, çəkmə xiffət,
Hər əzaba eylə tab.
Seyrə çıxıb bir bağçanı
Gördüm üç tayın sirab;
Səmasında cövlan edən
Gərdiş qabı yeddidi.

## *MÜXƏMMƏS*

## QOCALIQ

Axtarıb tapdı məni
Bilmirəm hardan qocalıq.
Ağlımı başdan aldı,
Huşumu sərdən qocalıq;
İşimi əskik etdi,
Lap yerbəyerdən qocalıq.
Müxtəsər, qoydu məni
Xeyirdən-şərdən qocalıq.

Dən düşdü saçlarıma,
Əzəl xəbərdar eylədi;
Hər iki yan qrovladı,
Ölkələrə car eylədi;
Arvad baxıb bədənimə
Hər işimi zay eylədi;
Axırda ayrı saldı
Yarı yavərdən qocalıq.

İstədim duram gedəm,
Qaranlıq çökdü gözümə;
Keçən günlər yada düşdü,
Əlimi vurram dizimə;
Oğul-uşaq qulluq etmir,
Baxan da yox sözümə;
Üzümü soyuq etdi
Borandan, qardan qocalıq.

Fələk məni oda saldı,
İki idim, üç elədi.
İstədim uzaq görəm,
Uzağı da puç elədi.

Ölüm yoxdu, keçib tamam
Doxsan da, yüz elədi.
Vurnuxuram yüzü keçəm,
Alıbdı candan qocalıq.

Söyləyir Aşıq Alı:
Mən neyləyim qocalığa?
Deyirlər sərgi gözlə,
Quşu qoyma yarmalığa.
Hər kəs gördü, götürmədi,
Döndüm əski yamalığa.
Aləmdə car eylədi
Gözümü nurdan qocalıq.



## AŞIQ ƏLƏSGƏR
(1821-1926)

Aşıq Ələsgər Göyçə mahalının Ağkilsə kəndində, təxminən, 1821-ci ildə anadan olmuşdur. Onun atası Alməmmədin əsas məşğuliyyəti əkinçilik olmuşdur. Əlindən dülgərlik işləri də gələn Alməmməd saz çalmağı bacarmasa da, el arasında şair kimi tanınmışdı.

Səkkiz nəfərlik ailəni dolandırmaqda çətinlik çəkən Alməmməd böyük uşağı Ələsgəri kəndlərində o qədər də varlı olmayan Kərbəlayı Qurban adlı birisinə nökər vermişdir. Bir qədər keçəndən sonra Kərbəlayı Qurbanın yeganə qızı Səhnəbanı ilə Ələsgər bir-birinə məhəbbət bəsləmişlər. Qızın atası bunu biləndə çox razı qalmış və onları evləndirmək fikrinə düşmüşdü. Lakin Kərbəlayı Qurbanın qardaşı Pullu Məhərrəm bu işi pozmuş və Səhnəbanının göz yaşlarına məhəl qoymadan onu oğlu Mustafaya almışdır.

Hələ nökər olduğu illərdən şeir qoşmağa başlayan Ələsgər bütün ömrü boyu bu uğursuz məhəbbətindən şikayətlənmiş, qırx yaşına qədər subay qalmış, nəhayət, Kəlbəcərin Yanşaq kəndindən olan Nəbinin qızı Anaxanımla evlənmişdir.

Aşıq Ələsgər beş ilə qədər Aşıq Alının yanında şəyird olmuşdur. Bu müddətdə o, püxtələşmiş, qüdrətli aşıq kimi tanınmışdır.

Aşıq Ələsgər oxumamış, yazı-pozu bilməmişdir. Lakin dini, tarixi kitab oxuyan dostlarını dinləmiş, mollaların hədislərinə, dərvişlərin sehirli nağıllarına qulaq asmış, soruşub öyrənməyi özünə ar bilməmiş, şifahi yolla çox zəngin bilik qazanmışdır.

Bədahətən şeir qoşub sazla oxuyan bu böyük şəxsdə ürəkdən keçənləri bilmək, kənarda törədilmiş hadisələrdən xəbər vermək kimi fitri qabiliyyətlər də varmış.

Göyçə aşıq sənətinin inkişafında, təkmilləşməsində Aşıq Ələsgərin xidməti əvəzsizdir. Onun:

*Adım Ələsgərdir, mərdi-mərdana,*
*On iki şəyirdim işlər hər yana,*

– misralarından da göründüyü kimi, böyük sənətkar neçə-neçə tanınmış aşıqlarımıza ustadlıq eləmişdir.

Aşığın həyatının XX əsrə düşən dövrü qəmli-kədərli keçmişdir. 1905-ci ildə törədilən milli ixtilaf, 1908-ci ildə Bəşirin Molla Rəhimi (Aşığın xalası oğlu) bilmədən güllə ilə vurub öldürməsi, 1915-ci ildə qardaşı oğlu və istəkli şəyirdi Aşıq Qurbanın vəfatı, bir il sonra isə qardaşı Xəlilin ölümü, 1918-ci ildə ermənilərin Göyçəni viran etməsi kimi faciəli hadisələr qüdrətli nəğməkarı sarsıtmış, onun yaradıcılığında kədərli iz buraxmışdır.

Aşıq Ələsgər qaçqın olduğu illərdə (1918-1921) ailəsi ilə birlikdə Kəlbəcər rayonunun Qanlıkənd kəndində yaşamış, Ermənistanda sovet hakimiyyəti qurulduqdan sonra isə köçüb, öz doğma kəndinə qayıtmışdır.

Xalqımızın bu ölməz saz-söz ustadı 1926-cı il mart ayının 7-də dünyasını dəyişmişdir. Onun qəbri Ağkilsə kəndinin qərbindəki qəbiristanlıqdadır.

## *QOŞMALAR*

### GƏRƏKDİ

Aşıq olub, tərki-vətən olanın,
Əzəl, başda pür kamalı gərəkdi.
Oturub-durmaqda ədəbin bilə,
Mərifət elmində dolu gərəkdi.

Xalqa həqiqətdən mətləb qandıra,
Şeytanı öldürə, nəfsin yandıra.
El içində pak otura, pak dura,
Dalısınca xosədalı gərəkdi.

Danışanda sözün qiymətin bilə,
Kəlməsindən ləlü-gövhər süzülə.
Məcazi danışa, məcazi gülə,
Tamam sözü müəmmalı gərəkdi.

Arif ola, eyham ilə söz qana,
Naməhrəmdən şərm eyləyə, utana.
Saat kimi meyli haqqa dolana,
Doğru qəlbi, doğru yolu gərəkdi.

Ələsgər haqq sözün isbatın verə,
Əməlin mələklər yaza dəftərə.
Hər yanı istəsə, baxanda görə,
Təriqqətdə bu sevdalı gərəkdi.

## ÇƏKİRSƏN

Müxənnət zamana, bimürvət fələk,
Şamı sübhə, sübhü şama çəkirsən.
Ləhzədə açırsan min cürə kələk,
Gah pozursan, gah nizama çəkirsən.

Çox həsrətlər görmür öz kimsəsini,
Vaya döndərirsən toy məclisini.
Tərəqqi-tənəzzül kəmənçəsini
Gah zilləyib, gah da bəmə çəkirsən.

Rəhimsən, kərimsən, ədlü ədalət,
Könüldən xəbərdar, hər dilə bələd.
Seyiddən, molladan, bəydən xəcalət,
Bu nə dağdı, sən sinəmə çəkirsən!?

Səksən il qurğuna qıldım tamaşa,
Səndə bir etibar görmədim, haşa...
Heç kəs dövran sürüb çıxmadı başa,
Əkməz kotan kimi xama çəkirsən.

Bəhrəm olsun təqdir, pozulsun yazı!
Bu qurğuya heç kim olmaz irazı;
Eşəyyə çullayıb əbrü ətlazı,
Köhlən deyin, şahlıq dama çəkirsən.

Arpadan incikdim, bitmədi gəndüm,
Darıyla dareqan heç deyil fəndim.
Candan bezdim, öz-özümdən iyrəndim,
Axırımı nə həngama çəkirsən!?

Ələsgər qəlbinə saldın işığı,
Məclislər zinəti, el yaraşığı.
Əzizliklə saxladığın aşığı
Zəlilliklə intiqama çəkirsən.

## QOCA BAXTIM

Nə sevda tapıbsan, nəyə talıbsan?
Hansı qəflətdəsən, gəl, qoca baxtım!
Ya məndən küsübsən, ya qocalıbsan,
Bu sınıq könlümü al, qoca baxtım!

Çəkilib pünhana deyirsən: “Sən döz!”
Qiyamət odundan pisdi tənə söz.
Gümüşüm tunc oldu, zəri-zibam bez,
Qəlp çıxır aldığım mal, qoca baxtım!

Özüm aşıq oldum, oğlum gülləçi,
Bildim ki, qalacaq dövlətin üçü.
Qırıldı mal-qoyun, qalmadı keçi,
İndi də yıxılıb kal, qoca baxtım!

Mardan şirə çəkib, daşdan keçərdin,
Dəryalardan ləlü gövhər seçərdin,
Pərvazlanıb Qafdan-Qafa uçardın,
Keçən günü yada sal, qoca baxtım!

Təqdir üçün yaxşı deyil bu adət:
Gah çox sevir, gah eyləyir xəcalət.
İyidlər at vermir, gözəllər xələt,
Gəlmir tənbəkiylə bal, qoca baxtım!

Səksəni, doxsanı ötübdü yaşım,
Gor deyə tərpənir bəlalı başım.
Əzrayıl həmdəmim, məzar yoldaşım,
Daha köç təblini çal, qoca baxtım!

Ələsgər kəsilib səbrü aramdan,
Oxlayıbsan, qanlar axır yaramdan.
Haqq ilə qıl sövdə, əl çək haramdan,
Halaldan mətləbin al, qoca baxtım!

## DÖRD KİTAB HƏR YANA YOLU GÖSTƏRİR

Dörd kitab hər yana yolu göstərir,
Nəfs ilə mərifət olur şeş cahat.
Belə əmr eyləyib qüdrəti-qadir,
Bu əmrə qol qoyan tez tapar nicat.
Eylə etiqad.

Şəhr aydı, bayram onun gülüdü,
İki ay bir-birin müttəsilidi.
Üç yüz altmış altı gün-bir ilidi,
Səkkiz min yeddi yüz səksən dörd saat,
Gəl verim isbat.

Altıda qarışdı Nuhun tufanı,
Qırx ildə sərgərdan gəzdi hər yanı.
Altı min altı yüz insan, heyvanı
Hərə öz diliynən eylədi fəryad,
İstədi imdad.

Neçə müddət qərq oldular tufana,
Əmr etdi, kəbutər gəzdi hər yana.
İki yüz otuzda tapdı bir danə,
Nuh üçün fəmində gətirdi sovqat,
Qıldı iltifat.

Altmış altı ayə niyə danmısan?
Belə məlum, bizi avam sanmısan.
Dünya cifəsinə sən aldanmısan,
Unutma üqbanı, bu dünyanı at,
Afərin ustad!

Qasım “qaf”ınandı, Həsən “hey”inən,
Xeyir çəkməz ustadınnan deyinən.
İşim yoxdu seyyidinən, bəyinən,
İxtiyarımdadı qalan məxluqat,
Daimül-övqat.

Aşıq Ələsgərdi, soruşsan adım,
Huş başımdan gedib, **yoxdu savadım**.[2]
Sözlə mətləb yazmaq **deyil muradım**,
Arifə eyhamla **yazıram hurfat**,
Sədrin olsun sat!

## *GƏRAYLILAR*

### ƏLİF, LAM

İbtidakı “əlif” – Allah,
“Bey” – birliyə dəlalətdi.
“Tey” – təkdi, vahidi-yekta,
Arif bu elmə bələddi.

“Sey” – sabitdi doğru yola,
“Cim” – ucadı, bax calala.
“Hey” – mehribandı halala,
Müngir ondan xəcaləti.

“Xey” – birdi, xaliqi-əkbər,
“Dal” – doğru doqquz fələklər.
“Zal” – zikr eylə dildə əzbər,
“Rey” – rəsuli – Əhməddi.

---

[2] **“savadlı” yazı təhsili görən, “savadsız” təhsil görməyən** mənasında işlənmişdir. Sonralar “savadsız” sözü bir növ vulqarlaşmaqla ironiya kimi işlədilmişdir.

“Zey” – zəbanı aç xudaya,
“Sin” – salam et, getməz zaya.
“Şin” – şövq elə o mövlaya,
Qeyri söhbət məsiyyətdi.

“Sat” – səbri-Şahi-Heydərə,
“Zat” – zərbin vurdu Əntərə.
“Ta” – tərif çıxdı göylərə,
Ağam kani-şücaətdi.

“Zay” – zülm edəcək düşmənə,
“Ayın” – həyati-çeşminə.
“Ğayın” – ğül-ğüli-dövranə,
“Fey” – fəna, “qaf”-qiyamətdi.

“Kaf” – kon ilə tutub qərar,
“Lam” – lal necə hesab verər?!
“Mim” – möminə yol göstərər,
İsmi-paki Məhəmməddi.

“Nun” – nida eylər hər zaman,
“Vov” – vay deyər, yatma, oyan.
“Hey” – hamıya yetər fərman,
Sanma səhni – zərafətdi.

“Yey” – yekdi adil padişah,
“Lam – əlifla” – birdi Allah.
Ələsgər, tutduğun günah
Bağışlansa, çox hörmətdi.

## BAX-BAX
(dildönməz gəraylı)

Axı biya, biya bigu,
Bigu, biqof, dağa bax-bax!
Həyyü, həqqü hakim sənsən,
Həyyə bax, bu bağa bax-bax!

Gözüm sağı, səhər çağı,
Geyək ağı, gəzək bağı;
Hamı sevib bu sayağı,
Qaymağa, həm yağa bax-bax!

Əziz ayə, müammayə,
Salsan sayə, bu məvayə.
Səbəb sənsən bu sevdayə,
Böyük ağa, sağa bax-bax!

## *DODAQDƏYMƏZ TƏCNİSLƏR*

### A YAĞA-YAĞA

Gəldi yaz ayları, həsrət çəkər xak,
Deyər: – Neysan gələ, a yağa-yağa!
Lənət şeytana! – de, şər işdən əl çək,
Şeytan səni salar ayağ-ayağa.

Səyyad dəryalarda alar cəng ələ,
Həsrət çəkər: çiskin gələ, çən gələ.
Əzrayıl sinəni çəkər çəngələ,
Qəssal qəss eyləyər ay ağa, ağa.

Keçən qəncər gər erkəkdir, gər dişi,
Dəllək çağır, çəkdirəsən gər dişi.
Qəzanın qədəri, çarxın gərdişi
Sərsəri tez alar ayağ-ayağa.

Ələsgər, de, yaxşı deyil aya, nə?
Gizlin sirrin nahaq saldın ayanə.
Çırağın ki ilahidən a yanə,
Ehtiyacın nədi, a yağa, yağa?

### AYAĞA, AYAĞA

Dağlar sinəsində lalə seyr edər,
Səri səcdə qılar ayağ-ayağa.
Darda qalanların dadına yetər,
Sidq ilə çağırsa: ay ağa, ağa!

Yazarlar kağızın “sin” arasında,
Nanı gətirərlər sin arasında.
Cəsəd cansız gedər sin arasında,
Nəkreyin qaldırar ay ağa, ağa.

Ələsgər, eşq atın yayın təhrində,
Nəqqaşlar yay çəkər yayın təhrində.
Dağlar al geyinər yayın təhrində,
Qışın çilləsində a yağa-yağa.

**AY EYLƏR QIJ-QIJ**

Qeyz eyləyər, çən çəkilər dağlara,
Qəhrindən yelləri ay eylər qıj-qıj.
Qarşı gəlsə həsrət çəkən yar yara,
Ağlı çaşar, səri ay eylər qıj-qıj.

Şin şəhər axtarar, şəc ara dəyər,
Şeytan şər eyləyər, şəc ara dəyər,
Daşar çaylar, qalxar şəcara dəyər,
Hərlənər daşları, ay eylər qıj-qıj.

Aşiq çaşsa, dildə "qar"a "qar" qalar,
Dağlar sinəsində qara qar qalar.
Gəştə çıxsa ərşə qara qarqalar,
Çalar qanadların, ay eylər qıj-qıj.

Ələsgər, əlin ki yetsə nə nara,
Nə həsrət çək, nə ah eylə, nə nara.
Nə insandı səngi salır nə nara,
Qaynadar dəryatək, ay eylər qıj-qıj.

## QIJHAQIJ

Hər kəsin qəsdindən aşıqlıq keçir,
Qarşı gəlsin edək cəngi qıjhaqıj.
Dəli eşq də dərya təki çalxanır,
Qeyzə gəlir səs ahəngi qıjhaqıj.

Hər kəs istər qana aşıq sirrini,
Axtarsın dayazı, gəzsin dərini.
Qilu-qala salan aşiq sərini,
Siyah çalar qızıl rəngi qıjhaqıj.

Ələsgərin qəddi Sinaya yetər,
Dərs alanlar gedər sinaya yetər.
Əzrail qəsd eylər, sinaya yetər,
Can alar dəstində cəngi qıjhaqıj.

## NƏDİ ADI

Şəriətdə təriqəti seçənlər,
Təriqət, həqiqət-denən nəd adı?
Hansı şah haqq ilə ilqar eylədi,
Nə incidi, nə ah çəkdi, nə dadı?

İstəyirsən seyr edəsən Sinanı,
Şər işlərdən sağın, saxla sinanı.
Sədət gətdi sin içində si nanı,
Dildə qaldı nə ləzzəti, nə dadı.

Ələsgər də eşq içində qaladı,
Şirin canın atəşinə qaladı.
Ər iyidin canı getsə, qal adı,
Nakəslərin dəhr içində nə dadı?

## SƏ QALI TEZ-TEZ

Sarsaq ilə seyrə çıxsan səhraya,
Gətirər sərinə sə qalı tez-tez.
Tərlan xəyal qalxar ərşi-əlaya,
Sardan şikarını sağ alı tez-tez.

Yel dəyir tellərin yar, a gəzdirir,
Saqi stəkanı yara gəzdirir.
Yar həsrəti canda yara gəzdirir,
Yar gəlsə yaralar sağalı tez-tez.

Xədəngin neyləsin, səng isə qala,
Eşq atəşi canda səngisə, qala.
Şah dəstin yetirsə səngi-səqala,
Qaldırar yerindən səqalı tez-tez.

Aşıq gərək sirrin desin halala,
Yanağından həya eylər ha lala.
Səxa əhli satdığını halala
Siratdan keçəndə sağ alı tez-tez.

Səhər səyyad seyrə çıxarsa dağa,
Ağan təkdi, dəngi deyil sad ağa.
Ələsgər, sərini sən qıl sədağa,
Geydir yar qəddinə sağ alı tez-tez.

## ÇATA-ÇAT

El yeridi, yalqız qaldın səhrada,
Çək əstərin, sal çatığın çata-çat.
Hərcayılar səni saldı irağa,
Həsrət əlin yar əlinə çata-çat.

Qışda dağlar ağ geyinər, yaz qara,
Sağ dəstinlə ağ kağıza yaz qara.
Əsər yellər qəhr eyləyər yaz qara,
Daşar çaylar, gələr daşlar çata-çat.

Ələsgərin xətti çıxdı, çal indi,
"hey"i "yey"ə, "dal"ı "rey"ə çal indi,[3]
Hərcayının kəlləsindən çal indi,
Sal çəngəlin, çək ciyərin çata-çat.

---

[3] "hey"i "yey"ə, "dal"ı "rey"ə çal indi – Həz. Əlinin adı – Heydər oxunur.

## NƏ YAXŞI-YAXŞI

Əzizi-cani-dil, eyni dirəxşən,
Deyirsən risalə nə yaxşı-yaxşı.
    Qarşıda nə yaxşı,
    Ləhcən gəlir nə yaxşı.
    Canan candan əzizdi,
    Nə Leylidi, nə Yaxşı.
Dil deyər cananın sadağası can,
Canan deyər: ey can, nə yaxşı-yaxşı.

Yazıq canı yada saldın sən ginə,
Səd hazar dərdinə gətirdin kinə.
    Qarşıda sənginə,
    Ahən yanar sənginə.
    Tərlan şikar eyləyər,
    Çıxar dağlar sənginə.
Şəcər ahən çəkər səngi-sənginə,
Yeyər dəni dəhan nə yaxşı-yaxşı.

Ələsgər, sən eşq atını yay indi,
Yazdan, qışdan ləzzətlidi yay indi.
    Qarşıda yay indi,
    Çək xədəngin yayın di!
    Aşıq, eşqin atını
    Yayacaqsan, yay indi!
Ah-zar eyləyər insan yay-indi,
Ərşdən neysan yağa nə yaxşı-yaxşı.

## *DİVANİ*

### GƏDA
(dodaqdəyməz)

Gizli sirri nahaq yerə
Gizlətdin xandan, gəda;
Ah çəkər, nalə edərsən,
Can gedər candan, gəda;
Etiqadla, sidqi-dillə
Çağır şahlar şahını.
Nahaq işdir dilək dilər
İnsan insandan, gəda.

Al çətirin, sal sərinə,
Çıx səhraya, sayə gəz;
Qəza sənnən gəzəcəkdir,
İstər gir dəryaya gəz.
Sakin əyləş sinn içində,
Həqiqətdən ayə gəz;
Ağ eylə sinən aynasın
Şəri-şeytannan, gəda.

Ələsgərnən danışanda
Al əlinə saz, danış.
İnci, səni istəyənlə
Eylə ərki-naz danış.
Əyləşəndə ağır əyləş,
Danışanda az danış.
Eşidənlər "əhsən" desin
Sənə hər yannan, gəda.



## AŞIQ MƏHƏRRƏM
(1825-1910)
**(şəkil şərtidir)**

1825-ci ildə Göyçə mahalının Alçalı kəndində dünyaya göz açmışdır.

Aşıq Alıya şəyirdlik etmiş, xalq arasında kamil sənətkar kimi hörmət qazanmışdır.

Aşıq Məhərrəm 1910-cu ildə dünyasını dəyişmişdir.

Əldə olunan şeirləri aşağıdakılardır:

## *QOŞMA*

## BULAQLAR

Mən bilirəm, zimistanın qəhrindən
Ağ niqab örtübsən üzə bulaqlar!
Yaşılbaş sonalar tərk olub səndən,
Həsrətsən gəlinə, qıza, bulaqlar!

Cənnətül-məvadan olmusan təyyar,
Üstündə gəşt eylər cümlə ərənlər.
Sənə bəxş eyləyib bir pərvərdigar
Qüdrət yeygisindən təzə, bulaqlar!

Üstündə cəm olur türfə gözəllər,
Ağ sürüynən ətrafını bəzərlər.
Mərd iyidlər ağır xonlar düzərlər,
Xanlar mehman gələr sizə, bulaqlar!

Qarlı dağlar alçaqlanmaz, ucalmaz,
Ləşgər çəkib xotkar ondan bac almaz.
Səndən içən hicran çəkib qocalmaz,
Yetirsə də sinin yüzə, bulaqlar!

Məhərrəm arzular, gəlsin baharın,
Ərisin girmələr, tökülsün qarın,
Dad versin dəhanda Abi-Kövsərin,
Olsun içənlərə məzə, bulaqlar!

## *TƏCNİSLƏR*

# TƏRSİ–TƏRSİNƏ

Dağlar al geyinib, ellər qırmızı,
Hüsnün zinət verir tərsi-tərsinə.
Aşıq deyər, qəddi tər,
Libası tər, qəddi tər.
Bu gün bir hikmət gördüm –
Mürdəsində qədd itər.
Qoy söykənsin köynəyinə qəddi tər,
Sinən tərdi, köynək tərsi-tərsinə.

Mərd igidlər çörək verər, hey alı,
Namərd sənsən, çörək səndən həyalı.
Aşıq deyər, həyalı,
Gözəl gəzər həyalı.
Bədəsil əsil olmaz,
Əsil olan həyalı.
Yornuq maral otlar, gəzər hey yalı,
Ülkər ovçusundan tərsi-tərsinə.

Məhərrəm, aç gözün həyat içində,
Dolan, gəz cahanı həyat içində.
Aşıq həyat içində,
Xalın həyat içində.
Bir canlıdı, bir cansız,
On baş həyat içində.
Qapısız-bacasız həyat içində,
Götürüb qoyarlar: tərsi-tərsinə.

## YANA–YANA

Bir üzügülməzin, bəxtiküskünün,
Ağladım dərdinə ha yana-yana.
        Aşıq deyər ha yana,
        Qəlbin oda ha yana.
        Yaxşı dostu unutma,
        Canın oda ha yana.
Çəksən də zəhmətin qədirbilməzin,
Axırda qalarsan ha yana-yana.

Ağanın hökmü ilə dərya dayandı,
Suya qərq olana dərya da yandı.
        Aşıq deyər nə yandı,
        Nə yandırdı, nə yandı.
        Kərəm oldu eşq əhli,
        Axır oda nə yandı.
Məcnunu öldürdü Leyli həsrəti,
Eşqi sinəsində ha yana-yana.

Məhərrəm, qəlbini üzən nə qandı?
Düşünməzlər bu dünyadan nə qandı?
        Aşıq deyər nə qandı,
        Nə yaradı, nə qandı.
        Ağıllı yüz ad dedi,
        Qanmaz ondan nə qandı?
Bir gün olar bu dünyadan köçərsən,
Ağlıyar dostların ha yana-yana.

## *DİVANİLƏR*

### ÇƏP

Sən dənizsən, mən dəryayam,
Sən özünü bilmə çəp;
Çin-çin eylə şahmar zülfün,
Yar, boynuna salma çəp;
Sinən çarşı, məmən dükan,
Müştəriyəm bazarda;
Sən satgınan, qoy mən alım,
Mənim ilə olma çəp.

Şahi-cahan, mərdi-sultan,
Ərənlərin sərvəri;
İsmi Əli, özü bəli,
Yəni yerin ləngəri;
Əntərə çaldı qılıncı,
Fəth eylədi Xeybəri;
Möminlərə rəhbərdi,
O xəyala dalma çəp.

Ey Məhərrəm, sidqi-dillə,
Sığın ağan Heydara;
Haqqı bil, mövlanı tanı,
Qalma aciz, avara;
Şahi-Mərdan sayəsində
Haçan gəlsən bazara;
Vur, çalxansın, qat bəhrəni,
Girdabında qalma, çəp.

## GƏLMƏDİ

Ey gözəl, sənin təhrində
Huri, qılman gəlmədi;
Yıxdın könlümün evini,
Oldu viran, gəlmədi;
Açılsın mahcamalın,
Qoy olsun bayram günü;
Cümlə-cahan həsrət çəkir
Mahi-ruhan gəlmədi.

Düşdü eşqin ataşına,
Yandı səməndər kimi;
Saz sinədə cuşa gəldi,
Cəm oldu dəftər kimi;
Heç mahalda ustad yoxdu
Aşıq Ələsgər kimi;
Yüz yerdən qətrə oynadı,
Belə ümman gəlmədi.

Məhərrəməm, əzbərimdi,
Sirri-sübhan ibtida;
Ondan münkir olan kimsə
Məhşərdə tapmaz cada;
Müxənnətə bel bağladım,
Zəhmətim getdi bada;
Bağlandı namərd kisəsi,
Daha dövran gəlmədi.

## NƏDİR

Barilahim, divan budur.
Yetişən dada nədir?
Müxənnəs haqqı unudub,
Heç salmır yada, nədir?
Kirmə nadan məçlisinə,
Qədirbilən olmasa,
Hərcayı hədyan söyləyər,
Bəy nədir, gəda nədir?

Əsli-zatı halal olan
Çaşqın olmaz binadan;
Mətləbinə tez yetirər
Yeri, göyü yaradan.
Tərk eyləyən sovmü salat
Əlin çəksin üqbadan;
Titrəyər dizi Siratda,
Heç tapmaz çara nədir.

Ey Məhərrəm, dosta yetir:
Dostdan-dosta al olmaz.
Həqiqətdən dərs almayan,
Təriqətdən hal olmaz;
Şəriətdə kamil olan
Yetgin olar, kal olmaz;
Gəşt eyləyər dəryalarda,
Çay nədir, ada nədir.

## *MÜXƏMMƏSLƏR*

## ÇƏKİRƏM

Ay hazarat, qulaq verin,
Görün, nə bəla çəkirəm;
İki arvadın əlindən
Qazamat, qala çəkirəm;
Qədd əyilir, bel bükülür,
“Əlifi” “dala” çəkirəm;
Dərdi qanmaza deməm,
Mən əhli-hala çəkirəm.

Dedim ki, xoşbəxt olaram,
Mən də alaram birini;
Yıxıldım dul arvada,
Qanmadım acı-şirini;
İstəyirəm söhbət edəm,
Öyür əvvəlki ərini;
Olmaz bəlaya düşmüşəm,
Sübhədək nala çəkirəm.

Getdim gördüm, böyük arvad
Kiçiyə çox kəsim satır;
Kiçiyi böyüyə deyir:
– Eşşəkdən törəmiş qatır!
Səsləri düşüb aləmə,
Bir-birinə şıllaq atır;
Mətləbi yazdım dəftərə,
Özgə mahala çəkirəm.

Neçəki cavan idim,
Gəlmirdi mənim eynimə;
Dedim, alım iki gözəl,
Paltarım salar çiynimə;

Yetişdim doxsan sinnimə,
Təqsirim allam boynuma;
Asqırıram, öskürürəm,
Hərdənbir dala çəkirəm.

Məhərrəməm, nə deyim
Bu dünyanın kəc işinə;
Aqillər, ürafələr
Gərəkdir bunu düşünə;
Hüş verib, guş tuturam
Çərxi-fələk gərdişinə;
Hikmətə sirr qalmışam,
İndi kamala çəkiəm.

## MƏN EVLƏNMƏZ İDİM

Vallahi, bilsəydim işi,
Adı mən evlənməz idim;
Gər biləydim ki, budu
Dadı, mən evlənməz idim.
Edəcəm qəm könlü-şadı,
Adı mən evlənməz idim;
Olacam arvad arvadı,
Adı mən evlənməz idim!

Dedim, birini də alım,
Qoy iki arvadım ola;
Birisi dərdə şərik,
Birisi övradım ola;
İkisindən törəyə,
Bir neçə övladım ola;
Gər bilsəm, belə becadı,
Adı mən evlənməz idim!

Nə bilim, təzə gəlin
Köhnəyə hədyan deyəcək;
Köhnə də təzəyə "heyvan
qızı heyvan" deyəcək;
Oturub bir-birinə
Min cürə böhtan deyəcək;
Gələcək qonşu, qohum,
Adı mən evlənməz idim!

Nə bilim, zalxa dua
Yazdıracaq at nalına;
Eşidənlər də yanacaq
Mən fağırın əhvalına;
Söyəcək hər ikisi
Mən yazığın saqqalına;
Deyəcəklər: – İfrit qoca!
Adı mən evlənməz idim!



# AŞIQ ƏZİZ
(1825-1918)

Aşıq Əziz təxminən 1825-ci ildə Göyçə mahalının Böyük Məzrə kəndində yoxsul bir ailədə dünyaya gəlmişdir. Aşıqlığa maraq göstərən Əziz bu sənətə dərindən yiyələnmiş və şeir qoşmağa başlamışdır.

Aşıq Əzizin yaradıcılığından əldə edilən bir-iki nümunə göstərir ki, aşığın ictimai quruluşa, onun haqsızlıqlarına qarşı ciddi etirazı olmuşdur. O, dövrünün ədalətsizliklərini yarızarafat ifadələrlə kəskin şəkildə söyləmişdir. Görünür ki, elə bu kimi səbəblərə görə o, dəfələrlə həbs edilmiş, sürgünə göndərilmiş, saz çalmağı qadağan olunmuşdur.

## *QOŞMALAR*

### OLUB

Ay ağalar, gəlin sizə söyləyim,
Gecə-gündüz işim ahü zar olub.
Bərəkət kəsilib, urza gödəlib,
Müxtəsəri, dünya çox bekar olub.

Heç iyidin işi düşməsin dara,
Dara düşən olar işdən avara.
İşləməklə versə, verər Cabbara,
Çalışmaqdan qulaqları kar olub.

Doğrudumu gör Əzizin dediyi,
Allah qırmaz yaratdığı bəndiyi.
Hacı Bədəl qoyub bu məzəndiyi:
Onçu arpa pulnan barabar olub.

### YOXDU

Ay ağalar, sizdən sual eylərəm:
Mən niyə kasıbam, dövlətim yoxdu?
Düşmənin diləyi gəlib yerinə,
Qız külfəti basıb, öylətim yoxdu.

İllah da ki, kasıblığın azarı,
Alıbdı canımı, qalmayıb yarı.
Oğurluq əlimdən gedəndən bəri,
Kəsilif urvatım, hörmətim yoxdu.

Aşıq Əziz deyər, düşə dəstimə,
Kor yapalaq nə giribdi qəsdimə!?
Çox tülkülər baş qaldırıb üstümə,
Patronum, tüfəngim, qüvvətim yoxdu.



## ŞAİR AYDIN
(1825-1915)
**(şəkil şərtidir)**

Göyçədə el şairi kimi tanınan sənətkarlardan biri də Şair Aydındır. O, təxminən 1825-ci ildə Şişqaya kəndində anadan olmuşdur. Mətbuat səhifələrində Aydının aşıq kimi qələmə verilməsi yanlışdır. Aşıq Ağayarın söyləməsinə görə, Aydın aşıq olmamış, toylarda, şənliklərdə özünün baməzə hərəkətləri və gülməli söbətlərilə camaatı əyləndirərmiş.

Şair Aydının tutulması, Sibirə sürgün olunması, hakim siniflər tərəfindən işgəncələrə məruz qalması halları da olmuşdur.

Şair Aydının şeirlərində bir zarafat, bir şuxluq, incə yumor da diqqəti cəlb edir. Təəssüf ki, onun şeirlərinin əksər hissəsi itib-batmışdır.

Şair Aydın 1915-ci ildə Şişqaya kəndində vəfat etmişdir. Əldə olunan şeirləri aşağıdakılardır.

## *GƏRAYLILAR*

## AY AĞALAR, AY QAZILAR

Ay ağalar, ay qazılar,
Dünya kimə qalacaqdı!?
Cəfa çəkdim, can çürütdüm,
Fələk bir gün alacaqdı.

Oturubsan ağ otaqda,
Olmayacaq bu damax da.
Altın torpaq, üstün taxta,
İnkir-minkir gələcəkdi.

Aydın deyər, malın çoxdu,
Çox malın vəfası yoxdu.
Körpü birdi, karvan çoxdu,
Gələn bir-bir keçəcəkdi.

## GƏLİN

Gedirdim, yoldan eylədi,
Bir qırmızı tatar gəlin.
Qul eylər, çəkər bazara,
Axır bir gün satar gəlin.

Cavahir seçdim dəryadan,
Məni qəflətdən oyadan,
Sənin kimi ağ mayadam
Düzdürəydim qatar, gəlin.

Aydın gəzər yar yanında,
Qalsın haqqın divanında.
Heç arzu qalmaz canında
Hər kim sənlə yatar, gəlin.

## ENDİ

İki dağın arasından,
Gördüm, bir cüt maral endi.
Biri eşqin havasından,
Biri yardan yaral endi.

Xına qoyub əllərinə,
Sığal çəkib tellərinə.
Gümüş kəmər bellərinə,
Hayıf, məndən aral endi.

Əsmə badi-səba, əsmə,
Yar, meylini məndən kəsmə.
Biri Dursun, biri Məsmə,
Aydın deyər, bular endi.

## MİNTƏNƏ
**(**Sarı don geyinmiş bir qız – mintənə**)**

Bahar vaxtı, yaz vədəsi
Geyinib sarı mintənə.
Yəqin bil ki, əmən ölməz,
Qoynunda narı, mintənə.

Qomrovluca quş kimisən,
Broflu gümüş kimisən.
Təzə yetişmiş kimisən,
Gilas nübarı, mintənə.

Hərnə oldu, mənə oldu,
Saraldı, irəngim soldu.
Aydını aranda qoydu
Biiman qarı, mintənə.



**AŞIQ MUSA**
(1830-1912)
**(Şəkil şərtidir)**

Aşıq Musa Səfər oğlu Göyçə mahalının Ağkilsə kəndində təxminən 1830-cu ildə anadan olmuşdur.

Deyilənlərə görə onun atası Cəfər XIX əsrin əvvəllərində Qazaxdan Zod kəndinə, sonra Ağkilsə kəndinə köçmüşdür.

Aşıq Musa Aşıq Ələsgərə böyük ehtiram göstərmiş və şeirlərinə nəzirələr yazmışdır.

Aşıq Musanın əldə olunan şeirləri İslam Ələsgər tərəfindən "Aşıq Musa – Əsərləri" adlı kitab halında 2013-cü ildə nəşr olunmuşdur.

Burada bir neçə şeirlərini təqdim edirik:

## *QOŞMALAR*

## DƏLİ KÖNÜL, SƏNDƏ NƏLƏR DOLANIR

Dəli könül, səndə nələr dolanır,
Biri qışdır, biri payız, biri yaz.
Üç əlamət gözəllərin nişanı:
Biri işvə, biri qəmzə, biri naz.

Coşqun çaylar kimi qaynadım, doldum,
Heyvatək saraldım, gül kimi soldum.
Gedər ikən üç gözələ tuş oldum:
Biri qarı, biri gəlin, biri qız.

Qürbət eldə kimdi halım soruşan,
Ağ üzündə qoşa xal verir nişan.
Üç şeydi ki, bu otağa yaraşan:
Biri Musa, biri söhbət, biri saz.

## DİLİM

Dilim, sənə bu nəsihət, deyirəm,
Dünyanın malına sarışma, dilim!
Yəqin eylə, ölüm haqdı qabaqda,
Qiyamət oduna alışma, dilim!

Mənim sözlərimi saxla amanat,
Haqqınan dost olan tez tapar nicat.
İstəyirsən, sərin ola salamat,
Ağlına gələni danışma, dilim!

Sən uyma namərdə, gördüm səxasın,
İçməynən, zəhr olu mey piyalasın.
Hər kəs çəkər öz ağlının bəlasın,
Fitnəvü şərlərə qarışma, dilim!

Bir məclisə vardın, sən ol nöqtə hal,
Eşidənlər səndən dərk etsin kamal.
Dindirsələr, dillən, yoxsa da ol lal,
Hərcayı danışıb gülüşmə, dilim!

Musa eşqə alışmayıb, nə lazım,
Bibəfaynan qonuşmayıb, nə lazım,
Allah özü sirr açmayıb, nə lazım,
Sən bildiyin sirri gəl açma, dilim!

## GÜLƏ-GÜLƏ

Xudam səni nə xoş gündə yaradıb,
Salıb bu cahana ay gülə-gülə.
Gözəllikdə Yusif sənə tay olmaz,
Alıbsan qüdrətdən pay gülə-gülə.

Çətindir ki, müşkül işlər düzələ,
Təbibimsən, gəl yaramı təzələ.
Mən nə deyim sənin kimi gözələ,
Eylədin ömrümü zay gülə-gülə.

Uca boylu, tuti dilli baxtavar,
Sənə qurban malım, mülküm – hər nə var.
Aşıq Musa deyər, gül yanaqlı yar,
Sən gətir, mən içim çay gülə-gülə.

## VARMI

Ala gözlü, uca boylu şahzada,
Şah sənsənmi, səndən qeyri şah varmı?!
Səni sevən malı neylər dünyada,
Qaşlarından özgə qibləgah varmı?!

Boyun görən candan keçər sərbəsər,
Dilim bir dəryadı, sinəm bir dəftər.
Camalın aləmi edib münəvvər,
Bundan şərafətli mehrü-mal varmı?!

Qamətin hüsnünə qılım ibadət,
Qaşların tağına edim ziyarət.
Zülfünün muyundan qurulsa Sirat,
Günahkar Musaya bir irah varmı?!

## YATMIŞDIM, GUŞUMA GƏLDİ BİR SƏDA

Yatmışdım, guşuma gəldi bir səda
Oyandım: əyləşib bir alişan şah.
Durdum salam verdim, mən oldum agah,
Dedi: Nə yatıbsan, qumbeyi-zillah?!

Allahın izniylə mana “dur” dedi,
Buyurdu Qəmbərə “badə ver!” dedi.
Şahədət barmağın tutdu, “gör” dedi,
Göstərdi bir cavan, eylədi agah.

Qismətdən, qədərdən gələn varımı-
Agah oldum mən görəndə yarımı.
Unutdum ağlımı, huşi-sərimi.
Dedi: Qorxma-qorxma, mənəm Seyfullah!

Seyfullah deyəndə mən oldum bələd,
O dəmdə payına etdim ziyarət,
Ağıl çıxdı başdan, oldum bitaqət,
Dilimdə dolandı “lailahəillallah”.

“Lailahəillallah” dilimdə bu gün,
Yerlərə ləngərdi, göylərə sütun.
Çəkib zülfüqarı, aşkar etdi din,
Haqqa dost olana göstərdi irah.

İrahınan gedən bulmaz müşkülü,
Bir ismi “Həlalət”, bir ismi “Bəli!”
Cəbrayılın ustasısan, Ya Əli!
Sirlərini kimsə bilməz cabəcah.

Cabəcah deməkdə haqqa aslansan,
Pərdeyi – hicabda alma bölənsən.
Meracın yolunda xatəm alansan,
Səni necə əziz xəlq etdi Allah!

Allahın şirisən, özün pürhünər,
“Yahu” deyib, zikr elərdi Zülfüqar.
Tamaşaya durdu göydə mələklər,
Hüsnündən dərc oldu nuri-təcallah.

Huru görən ömrü gedər yüz ilə,
Neçə qatar nər – mayası düzülə.
Bir saatda yüz min dəftər yazıla,
Vəsfin başa gəlməz vallahü billah!

Billahi, sənsən o, vəsfə aşikar,
Dəstində paylanır saqeyi-kövsər.
Aləmə xəlq edən ya pərvərdiyar,
Səndə rəhm çoxdu, Musada günah.

*GƏRAYLILAR*

## BİR GÜN

Könül, ara dostlarını,
O da səni gəzər bir gün.
İki mirğəzəb əyləşib,
Xeyir-şəri yazar bir gün.

Ey yükü tunc olan kimsə,
Nağdısı vec olan kimsə,
Nütfədən kəm olan kimsə,
Doğru yoldan azar bir gün.

Yazıq Musa eylər dilək,
Bu qəm bizi qoymaz gülək.
Demədimmi, çərxi-fələk
Bu dövranı pozar bir gün.

## NƏ GÜNAHI TELLİ SAZIN

Məclisləri abad eylər,
Nə günahı telli sazın!?
Məlul könüllər şad eylər,
Nə günahı telli sazın!?

Yeki şəcər, yeki dəmir,
Ara vurmur, yalan demir.
Qazı kimi rüşvət yemir,
Nə günahı telli sazın!?

Fikirini vermir qələmə,
Zülüm eyləmir aləmə.
Pulunu vermir sələmə,
Nə günahı telli sazın!?

Yoldan çıxıb, yolun azmır,
İblis kimi ara pozmur.
Molla kimi cadu yazmır,
Nə günahı telli sazın!?

Musa vəsfin söylər saza,
Ruh verir gəlinə, qıza.
Oxşamayır kələkbaza,
Nə günahı telli sazın!?

## SULTANIM

Bir bivəfa yar ucundan
Yetişdim cana, sultanım.
Du çeşmi-xumar ucundan
Düşdüm zindana, sultanım.

Üzündə qoşa xalını,
Əmim ləblərin balını.
Bir də görsəm camalını,
Gəlləm imana, sultanım.

Mən olmuşam bəxti qara,
Gül meylini verməz xara.
Rəhmin gəlsin, yetir yara, –
Yazıq Musana sultanım.

## *TƏCNİSLƏR*

## AY ÜZƏ-ÜZƏ

Ay ağalar, çeşmim yaşı sel oldu,
Çalxanır sonalar ay üzə-üzə.
Mərd sözünü deyər mərdü-mərdana,
Namərd saxlar sözü ay üzə-üzə.

Nazlı dilbər əldə tutub nə saqı,
Dərd çəkənin nə bimarı, nə sağı.
Ala gözlər mənə eylər nasağı,
Kəc baxar, ömrümə ay üzə-üzə.

Aşıq Musa deyər, yetibdi dərdim,
Məni bu qürbətə atıbdı dərdim.
Səksəni, doxsanı ötübdü dərdim,
İndi də yetişib a yüzə, yüzə.

## DE BİR ÜZ, BİR ÜZ

Arif olan, diqqət elə, fəhm elə,
Qövr elədi yaram de bir üz, bir üz.
Fələk saldı məni hicran xəstəsi,
Yatıram yan yerdə de bir üz, bir üz.

Yaralıyam, çətin qallam bu yaza,
Ərz eyləyəm dərdi-dilim bu yaza.
Yetir xəbərimi gərdən bəyaza,
Görünsün gözümə de bir üz, bir üz.

Aşıq Musa, səni dərd az alımı?
Görüm düçar olsun dərdə zalımı!
Dərmansız xəstədən dərd azalımı?
Loğmantək deyirəm de bir üz, bir üz.

## *DİVANİ*

## QALMADI

Ey fələk, sənin cövründən
Xanü xavan qalmadı;
Neçə danəndələr getdi,
Mətləb qanan qalmadı.
Çoxlarının baharını
Döndərdin zimistana,
Pozuldu bağı-bənövşə,
Soldu gülşən qalmadı.

Hər kimə ki şərab verdin,
Tez zəhirmar eylədin;
Zülmünən yıxdın evini,
Taxtını tar eylədin;
Beş gün xoşbəxt olanların
Sonun bimar eylədin;
Nə xəstələr şəfa buldu,
Nə də Loğman qalmadı.

Kim ilə dostluq elədin,
Söylə görüm, başa-baş!?
Qəzəbindən xof elədim,
Didəm verdi qanlı yaş;
Sümüyümə lərzə düşdü,
Cismimdə yandı ataş;
Qəhrinə baş əyməkdən
Musada can qalmadı.



# MİRZƏ BƏYLƏR

(1837-1919)

**(şəkil şərtidir)**

Aşıq şeiri səpkisində yazıb-yaradan el şairlərindən olan Mirzə Bəylər 1837-ci ildə Göyçə mahalının Zod kəndində anadan olmuşdur. Atası Kazım onu ərəb, fars, fransız, rus və türk dillərində oxutdurmuş, dövrünün ən savadlı ziyalısı kimi yetişdirmişdir.

Mirzə Bəylər İrəvan quberniyasının dəftərxanalarında xeyli müddət tərcüməçi və katib işləmişdir. O, dövrünün mətbuatını həmişə izləmiş, "Molla Nəsrəddin" jurnalının abunəçisi olmuş, Sabir xəstələnərkən onun müalicəsi üçün jurnalın ünvanına pul göndərmişdir.

Özünün davranışı ilə xalq arasında hörmət və şöhrət qazanan Mirzə Bəylər saza-sözə hədsiz maraq göstərmiş, Aşıq Ələsgərlə səmimi dost olmuş, aşıq şeirinin müxtəlif şəkillərində çoxsaylı sənət əsərləri yaratmışdır. Onun qəzəlləri də vardır. Təəssüf ki, onun öz əlilə yazdığı böyük şeir dəftərindən yalnız beş vərəq (on səhifə) mühafizə olunmuşdur. Şairin əl yazmasının əhəmiyyətli bir cəhəti də odur ki, şeirin hansı tarixdə (hətta bəzən saat neçədə), nə münasibətlə yazılması da qeyd olunmuşdur. Qəzəllərindən biri fars dilindədir.

Aşağıda şairin əldə olunan şeirlərini təqdim edirik:

## *QOŞMALAR*

## SƏNİN DEYİLMİ

Nə baxırsan həzin-həzin, şikəstə,
Əzizim, bu canlar sənin deyilmi!?
Gecə-gündüz əmək çəkib tikdiyin
Dolu xanimanlar sənin deyilmi!?

Haqqın kərəmindən hazır tapılmış,
Plan çəkib başı başa çatılmış.
Təzə-təzə cani-dildən yapılmış
Bu köşkü eyvanlar sənin deyilmi!?

Sənsən bizim üçün Cənnət hurisi,
Ya da göydə mələklərin birisi.
Bu görünən malü-qoyun sürüsü,
Hesabsız heyvanlar sənin deyilmi!?

Laləyi həmralar, gülü yamənlər,
Müttərdi gülü reyhan, süsənlər.
Yaz gələndə çiçək açan çəmənlər,
Cənnəti-rizvanlar sənin deyilmi!?

Təzəcə ağaclar ulduz sanında,
Göyərmiş hər biri öz məkanında.
Sağında, solunda, evin yanında
Bağça gülüstanlar sənin deyilmi!?

Ucadan alçağa suyun endirən,
Taxılı, qəlləni una döndərən.
Araba-araba taylar göndərən
Qoşa dəyirmanlar sənin deyilmi!?

Hər gün sayıl xirmənindən pay alar,
Dolu samanlıqlar, qoşa tayalar.
Sarıxlı yüzlüklər, halal mayalar,
Saxlanan pünhanlar sənin deyilmi!?

Xidmətində duran cani-dilinnən,
Qələm tutan bir-birinin əlinnən.
Öz evində dörd millətin dilinnən
Oxuyan oğlanlar sənin deyilmi!?

Neçə ki, xəstəsən, xəstəyik bizlər,
Allahdan gözümüz şəfalar gözlər.
Qulluğunda duran gəlinlər, qızlar,
Cəmi novcavanlar sənin deyilmi!?

İnşallah, bularsan şəfa canında,
Durarsan, gəzərsən xanimanında.
Atalı-oğullu sənin yanında
Boynunu buranlar sənin deyilmi!?

Allahdan diləyən dadü fəryadlar,
O ismi-əzəmlər, müqəddəs adlar.
Qohumlar, qardaşlar, biganə, yadlar,
Haqqa yalvaranlar sənin deyilmi!?

***14 noyabr 1904-cü il***

## ƏLƏSGƏR[4]

Güşeyi-səhrada, tənhanişində
Sən ki yazdın bu ünvanı, Ələsgər!
Çillənin günündə, qış mövsümündə
Bahar etdin zimistanı, Ələsgər!

Naməniz qəlbimi xeyli oyatdı,
Mətləbi mövzundu, xub kəlimatdı.
Yusifin köynəyi Yaquba çatdı,
Abad etdi bu Kənanı, Ələsgər!

Aşiqəm mən sənin ixlatlarına,
Nəzminə, fərdinə, xoş əbyatına.
Afərin, afərin əsli-zatına!
Sənisən hafizi-sanı, Ələsgər!

Gərçi müləbbəssən ev libasında,
Şahidəm, şəribsən haqqın tasında.
Azəribaycanda, türk arasında
Sənin kimi şair hanı, Ələsgər!

Durmamışam məcazının qolunda,
Gəzməmişəm namərd sağü-solunda.
İmtahandan çıxan dostun yolunda
Əsirgəməm, billah, canı, Ələsgər!?

Əcəb nəzmi, xoş əfradı yazıbsan,
Vəsfi tamam ictihadı yazıbsan,
Ləqəbi atıban, adı yazıbsan,
Unutmaram bu ziyanı, Ələsgər!

---

[4] Mirzə Bəylərin qeydi: "Ağkilsə sakini Aşıq Ələsgər Əliməhəmməd oğlunun mənə göndərdiyi vəsfin müqabilində cavab yazılmışdır"

Səhv etdim, ləqəbim sətrə sığışmaz,
Ləfsi səqil salar, bəhrə sığışmaz,
İnşallah, qəzəbə, qəhrə sığışmaz,
Əfv elərsən bu üsyanı, Ələsgər!

Mən belə işlərə mahir deyiləm,
Baxma, öz-özümə faxir deyiləm,
Hərçəndi yazıram, şair deyiləm,
Bağışlarsan bu Mirzanı, Ələsgər!

## ƏFƏNDİM[5]

Natiqi – hatifdən bir xəbər gəlmiş,
Səmun tuta o göftarı, əfəndim!
Cismimiz dəryayi-dərlərə dalmış,
Nicata bulunmaz çarə, əfəndim!

Məhəbbət, məhəbbət ömrümüz aldı,
Aya, məcazidən əldə nə qaldı?!
Şəmdir, görünür ki, əbəs xəyaldı,
Könül vermək hər əğyara, əfəndim!

Qəflətdə keçirdik biz bəxti qara,
Oyandıq, dolandıq sibə, əhara.
Bülbül ikən düşdük güldən kənara,
Gülüstan yetişdi xara, əfəndim!

Guşumuza çatdı cavanlıq səsi,
Xudpəsəndik, bəyənmədik heç kəsi.
Tənburun nəğməsi, şövqün həvəsi
Bizi saldı hər azara, əfəndim!

---

[5] Mirzə Bəylərdən qeyd: "1916-cı sənədə bəndə yel naxoşluğundan xəstə ikən alışan cənabi Hacı ağa kərrat və mərrat ilə yazdığı kağızlara cavab verilmiş."

Dirəxtan meyvəsi, barı olmasa,
Savabinən pur anbarı olmasa,
Bir kişinin girənbarı olmasa,
Nə verərlər səbükara, əfəndim!

Hanı, möüz-möüz guşəmiz hanı?
Hanı, dərdiyimiz xuşəmiz hanı?
Əldə axirətə tüşəmiz hanı,
Nə götürək girdigara, əfəndim!?

Ömrü girənmaya yetişdi ziya,
Gözəl zindəganlıq getdi fənaya.
Ağlayayım, yalvarayım xudaya,
Rəhm eyləyə, bəlkə zara, əfəndim!

Aylar, illər ilə qürbətdə qaldıq,
Zəmilər içində solduq, saraldıq.
Qəlilən, kəsirnən qədri mal aldıq,
Axır döndü zəhirmara, əfəndim!

Gör nələr çəkibdir bu yazıq başlar!?
Mürid ilə Mürşid halal yoldaşlar.
Yaranan, yalvaran qövmü qardaşlar
Dönüb ovsunlamaz mara, əzizim!

İmtahana çəkdim mən bir nakəsi,
Qulağına böyük gəlib öz səsi.
Yağmurluğu, fəsi, qaloş, çəkməsi...
Kişi olub hər avara, əfəndim!

Dərd məni xeylicə zindana salmış,
Qüssənin əlindən Mirzə saralmış.
Xəstəyəm, şəyəd ki, əqlim azalmış,
Diqqət etmə günahkara, əfəndim!

## *TƏCNİSLƏR*

## NƏ SAQI SAQAR

Bir düzəl təcnisə, mənim dal qəddim,
Nəzmi-vəzni söylə nə saqı saqar.
Dərdbilməz yolunda mənim çal xəddim,
Ağarırsan, ağar, nə saqısa qar.

Dost bağında alma nədi, heyva nə?
Muşa varsam, seyr edərəm heyvana.
Tabıstanda ələf sazla heyvana,
Zimistanda əgər nasaq isə qar.

Zənburun əsəlin-balın tutmayan,
Səməndərin pərü balın tutmayan,
Məhəbbət səngini balın tutmayan,
Nə mərəkdə namus, nə sağı sağ ər.

Mərəzin nəbzi düz, məcazı dursa,
Xəyalı yasaqsa, məcazı dursa,
Dost dostun yolunda məcazı dursa,
Nəsib olar ona nəs ağı saqar.

Bərbadku bədor daim badədən,
Sərsər olsa, vermək olmaz bada dən.
Zəif Mirzə xəstə düşüb badədən,
Nə özü əməmməz, nə saqı sağar.

## KAMALA KAMAL

Ey zərri-səxavət, pilləläri-dost,
Gəl səninlə qoyaq kamala-kamal.
Görək kimdə müyəssərdir mərifət,
Dedim: iqbal qoymaz kam ala kamal**.**

Bəs ki, gözləmədin haqqı-hesabı,
Gəl araya qoyaq haqqı, hesabı.
Sənlən çəkəcəkdim haqqı-hesabı,
Şəxs ki, haqqı səndən kəm ala Kamal.

Fərhadın nəzəri dustaq Şirinsə,
Bağlıdı əlləri qoçaq şirinsə.
Şirinsə şəkkəri, dodaq şirinsə,
Axrı zəhr olur Kamala, Kamal.

Sanma muradı nahaqdan dilərəm,
Murği – kürüsnəyəm, haq dən dilərəm.
Mirzəyəm, haqqımı haqdan dilərəm.
Fəqət lənarizqəm kəm ala kəm al.

## *MÜXƏMMƏS*

## SƏNİN

Düşdü yada, dilbəra,
Zülfü-pərişanın sənin.
Yetdi ətri çün dimağa
Müşki-əfşanın sənin.
Süsənü sümbül, sənubər,
Lalə, reyhanın sənin;
Və düzülmüş sərbəsər
Yengi xiyabanın sənin;
Neylərəm bağі-behişti,
Bəsdi İrizvanın sənin.

Qaşlarının tağının
Qıyqacına heyran mənəm;
Mailəm, müştaqıyam,
Eşqində sərgərdan mənəm;
Sailəm, misgin mənəm,
Biçarəvü giryan mənəm;
Şol qoşa düşmüş xəttə
Canın qurban edən mənəm;
Qoysa gər minnət bu cana,
Tiği-bürranın sənin.

Ərz edim, canım sənin
Həzzarına olsun fəda;
Nərgisə tən eyləyən
Şəhla gözün, ey məhluqa!
Hüsnünə rağib edib
Göydə mələklər cabəca;
Zikr edərlər dəmbədəm.
Dildə diləllər "mərhaba!"
Nazir olsa göylərə,
Ta çeşmi-məstanın sənin.

Al yanağa bənzəməz
Baqi-İrəmin gülləri;
Qümrə və peyhano, nanə,
Yasəmən sünbülləri;
Oxuşan şamü-səhər
Həm tutiyi-bülbülləri;
Lal olur görcək yanağın
Zinətinin dilləri;
Batil etmiş cümləsin
Təzə gülüstanın sənin.

Ləblərin yaquta bənzər,
Ya da laləyə əhməri;
Şəhdü çün tamı ləzizdir,
Misli Tehran şəkkəri;
Acizə əhli-səxa
Əsirgəməz simü-zəri;
Qapına sail gəlib,
Ey nazənini-xavəri!
Rəhm yox səndə məgər,
Bəs, hanı ehsanın sənin!?

Dişlərin mirvaridir.
Ləli-Bədəxşan, gövhər;
Ya sədəf, ya incidən
Ləblərin memari-qüdrət
Sətri düzüb kilki-qədər;
Xoş çəkib güldən çəpər;
Görməsin hasid baxanda,
Ya münafiq bədnəzər;
Saxlanır pünhan xəzinə
Dürrü-dəndanın sənin.

Mən səni sevdim, məgər
Eyləmişəm xeyli xəta!?
Adəti qoyub gedibdir
Babamız Adəm Ata.
Məndə yox səbri-sükut,
Səndə yox qədri-əta;
İki “yox”dan nə çıxar,
Bəlkə, çıxa və həsrata;
Beylədirmi, doğuru de,
Yandırma imanın sənin.

Zəmzəmimdir, zairəm
Cahi-zənəxdanın sənin;
Gəbğəbi-simin sərasər
Zəcri-zindanın sənin;
Ey gözü şəhla, üzü gül,
Bəsdi dövranın sənin;
Çeşmimin bəstindədir
Şəkli-xuramanın sənin;
Mirzədir faş eyləyən
Dillərdə dastanın sənin.

## *QƏZƏLLƏR*

# NİSAR OLMUŞ[6]

Be həmdulla, be həmdulla, bu gün işrət qərar olmuş,
Kəmini bəyləyin səyyad seydinə düçar olmuş.

Həzaran həsrəti çəkmiş vəfalı müntəzir gözlər,
Aralıqda bulub yetdi murada iftixar olmuş.

Bu günkü işrət, ey saqi, rəqibə baisi-nikbət,
Həsudun qəlbi-napakı qamuya aşkar olmuş.

Gələn günlər dəxi xoştər, gül ey mərdana irşadım,
Nəsib olsun bu dərgaha qədimi piyadar olmuş.

Nədir cəli, nədir xatun, əcəbmi məst olub kitab,
Yazar Mirzəyə bir ünvan, həqiqi can nisar olmuş.

# MƏRHƏBA[7]

Mərhəba, xoş gəldin ki, ey ruhi – rəvanım, mərhəba!
Mərhəba, xoş gəldin ki, ey cism iylə canım, mərhəba!

Sən bənim nuril-iyunum, sən mənə binta nuh nəbi,
Sən bənim Nuhum, nicatım, gəştibanım, mərhəba!

Sən könüldə dərdimə, hər sirrimə qəmxarsan,
Həmdəmim, razım, niyazım, həmzəbanım, mərhəba!

---

[6] Alişan Hacı ağanın oğlu Ağalar xanın ərusu Qarabağdan gələn günün sabahı bu kəlam tərtib tapıb. 1911-ci sənədə, 26 yomində, mah iyul, saat səkkizdə, sübhdə.

[7] 1911-ci sənədə iyul ayının 12-də Mirzə Əli Qocayevin şəninə xeyir-dua mərhəbi yazılmış.

Qeyridən dərman bulunmaz yarama, sənsən təbib,
Zindəganım, həyyi-canım, cavidanım, mərhəba!

Bəxti-dövlət, ömri-səhhətlə, əfəndim, bin yaşa,
Qismət olsun xanədanım, xanimanım, mərhəba!

Mirzənin nazın çəkərsən bülbül ilə gül kimi,
Qamudan qabil tutarsan imtahanım, mərhəba!

## SƏD AFƏRİN[8]

Naməniz məzmununu dərk eylədik, səd afərin!
Mətləbindən zahir oldu işvəsi ol dilbərin.

Cani-şirini tutubdur həyyi-zatında qərar.
Vasili-məlfufə bulduqda, yəqin, bu kəmtərin.

Xeylicə qəmgin dilim abü-havalı gül kimi
Təzələndi, bəh əcəb açdı yenə balü-pərin.

Gövhərü dürrü-girdənmayə düşüb bəhri-şinə,
Yetdi bu ətşan dilə bir qətrəsi ol Kövsərin.

Şinin şəkkərdən ləzizdir kafi çün kani-gövhər,
Müşkülün həll eyləsin xaliq, görüm, ol kəslərin.

Sənə həm vəsf etməyə yoxdur bu gün nitqim mənim,
Çün onun vəsfində acizdir dili hurilərin.

Bin səniylə sizi yad eylədi ey səni, yar,
Hali-təhrirə yetib duası Mirzə Bəylərin.

---

[8] 1874-cü sənədə bəndə Dərəçiçək murovları sudunda mütərcim olan vaxtı Kamal sakini Kərbalayi Hüseyn bəy mənə məxvi mətləbli yazdığı şeirin cavabında yazılmışdır.



## HACI ƏLİŞ AĞA
(1841-1919)
**(şəkil şərtidir)**

Hacı Əliş Ağa Göyçə mahalının Zod kəndindəndir. Səməd Ağanın yaxın qohumu olan Hacı Əliş ağanın babaları XVIII əsrin sonlarında Qazax mahalının Kəsəmən kəndindən köçüb Göyçəyə gəlmiş və orada məskunlaşmışlar. Zod kəndində həmin tayfaya "Kəsəmənlilər" deyirdilər.

Əliş ağa Həcc ziyarətindən sonra şeirlərində "Hacı" təxəllüsünü işlətmişdir. Dəftərxanalarda, rəsmi yazılarda, məktublarında "Hacı Əliş ağa Kəsəmənski" imzası qoymuşdur.

Səməd ağanın göstərdiyi maddi köməklə o, əvvəlcə Kutaisi gimnaziyasında, sonra isə Peterburqda mükəmməl təhsil alıb. İrəvan quberniyasının idarələrində məsul vəzifələrdə işləmişdir.

Dövrünün açıqgözlü ziyalısı olan Hacı Əliş ağa "Molla Nəsrəddin" jurnalının abunəçisi olmuş, Sabir xəstələnərkən onun müalicəsi üçün jurnalın ünvanına pul göndərmişdir.

Gənc yaşlarında yaradıcılığa başlayan və qəzəl janrına daha çox meyl göstərən Hacı Əliş ağanın əsərlərinin bir qismi itib-batmışdır. Əldə olunan şeirlər onun gözəl şair olduğunu göstərir.

1918-ci ildə ermənilər Göyçəni viran qoyarkən doğma yurddan didərgin düşən Hacı Əliş ağa 1919-cu ildə Gəncədə vəfat etmişdir.

## *QOŞMA*

## AĞLAR

Ayrı düşdüm vətənimdən, elimdən.
Düşən ağlar, vətən ağlar, el ağlar.
Əl çəkmərəm sünbülümdən, gülümdən,
Sünbül ağlar, bülbül ağlar, gül ağlar.

İstərdim ki, yazam bir şəmmə güldən,
Bir şəmmə də yazım zülfü sünbüldən.
Düşdü yerə nagah qələmim əldən,
Qələm ağlar, kağız ağlar, əl ağlar.

Xərabə yerlərdə bayqu olmasa,
Arif olan bu mətləbi bilməsə.
Çöllərdə gər ahu-ceyran olmasa,
Dağlar ağlar, çöllər ağlar, çöl ağlar.

Bu məclisə tari-mütrüb gəlməsə,
Oynayıb, çarx vurub, deyib-gülməsə.
Hənalı tellərə şanə vurmasa,
Şanə ağlar, zülflər ağlar, tel ağlar.

Gethaget əhvalım bədəhval oldu,
Büküldü qamətim, qəddim dal oldu,
Etdiyim xəyallar xamxəyal oldu,
Xəyal ağlar, əhval ağlar, hal ağlar.

Günbəgün Hacıya artar azarın,
Çıxar asimana həm ahü-zarın.
Qazanda ləhədin, qəbir qazanın,
Külüng ağlar, kürək ağlar, bel ağlar.

## *QƏZƏLLƏR*

### A MOLLA

Bir namə yazım, ver çapa salsınlar, a molla!
İftadələrin qeydinə qalsınlar, a molla!

Bircə gəl oyat millətini, çoxdandı yatıblar,
Yatdıqca yatar, bəsdir, oyatsınlar, a molla!

Bihudə dolanmaqdı bu ah ilə dolanmaq,
Qoyma bunları böylə dolansınlar, a molla!

Nə vəxta kimi vızi-nəsihət dəyişəcəksən?!
Lazımdır, onlar özləri qansınlar, a molla!

Əcnəbi millət özünü elmə yetirdi,
Milləti çağır, yanıma gəlsinlər, a molla!

Peşiman da olub millətimiz millət içində,
Nə vaxta kimi dalıda qalsınlar, a molla!

Hər tayifə gültək açılıbd, şöləlınibdir,
Biz tayifə solsun və saralsınlar, a molla!?

Yox, yox, dolanım başına, irşad elə, sən yaz,
Yaz, yaz, yenə yaz, bəlkə, utansınlar, a molla!

Türkdü, bunlara yazma ərəb, farsi lisanı,
Türkidilər, yaz kim, anı qansınlar, a molla!

İtxaz elədi xaricilər elmi-fünunu,
Qoy ağzını büzsün, bizə gülsünlər, a molla!

## AXTARIRAM

Bülbüləm, gülşən ara bir güli-tər axtarıram,
Gül tər səhni-çəmənlərdə bitər, axtarıram.

Salıban boynuma zəncir, dolanıb gəşt eylərəm,
Qeystək xeyməyi-Leylayə güzar axtarıram.

Hədd həştadə yetib, eşq hələ başımda var,
Eyb olmaz ki, desəm: eşqə kəmər axtarıram.

Qaç sənələrdə ki, qeyb etməmiş ol mah bəşər,
Gəzirəm xanabəxanə, dəri-dər axtarıram.

Zati-pak aqilə və kamilə bir ali nəsib,
Hacıya, ali təbiət ola gər, axtarıram.

## QƏZAVÜ QƏDƏRƏ

Getdi növrəstə balam, yar oldu əğyarilərə,
Həmdəm oldu gedibən çöldə gəzən vəhşilərə.

Bəslədim zəhmət ilə, aldı əlimdən əğyar,
Mən də üzümü tuturam ərşdəki dadilərə.

Bir gül əkmişdim özüm, qönçəliyində dərərəm,
Nə bilim, qismət edər Tanrı bir özgə bəşərə.

Həsrət oldum boyuna, sərvsifət qamətinə,
Qaldı yollarda gözüm, getdi nə gəlməz səqərə.

Ürəyin yandı sənin, səd heyif oldun, Hacı bəy,
Nə yaman yerdə başın düşdü qəzavü qədərə!?

## BALAM

Səni yüz yaşa, görüm, dövləti-dünyada, balam!
Maşallah, səni o xəlq edən icada, balam!

Əhsən, əhsən, yenə əhsən, o gözəl qamətinə,
Fətəbarək bu boyu nəqş edən ustada, balam!

Madərin huriyü qılman, pədərin ərşdə mələk,
Əsli-nəslindi sənin göydə mələkzadə, balam!

Qıl həzər, gəzmə belə ay kimi roşən-roşən,
Qorxuram, Gün tutula ərşi-səmavada, balam!

Görə kafər səni ol qaməti-rənada, gözəl,
Büt deyib səcdə qılar gündə kəlisada, balam!

Hacı bəy səcdə qılar, gündə edər razi-niyaz,
Dil əmanətkar olub sübhi-məsihada, balam!



# ŞAİR MƏHƏMMƏD
(1857-1937)
**(şəkil şərtidir)**

Şair Məhəmməd Göyçə mahalının Ağkilsə kəndində, təxminən 1857-ci ildə dünyaya göz açmışdır. O, Aşıq Ələsgərin qardaşıdır. Bir müddət çobanlıq etdiyinə görə, ona "Çoban Məhəmməd" də deyirlər.

Yazı-pozu bilməyən Məhəmməd xalq arasında istedadlı el şairi kimi tanınmışdır. Şeirləri vaxtında yazıya alınmadığına görə, çoxusu unudulmuşdur. Ancaq bir çox şeirləri aşıqlarımızın dillərinin əzbəridir. Məhəmmədin bir neçə dastanı da qalmışdır. "Məhəmməd və Sərv Xuraman" ("Məhəmmədin Qars səfəri") dastanı da məşhurdur.

Məhəmmədin şeirləri üslubuna görə Aşıq Ələsgərin şeirlərinə yaxındır. Hətta bəzi şeirlərin Ələsgərinmi, yoxsa Məhəmmədinmi olması mübahisəlidir.

Şair Məhəmməd 1918-1921-ci illərdə, qaçqın olduğu zaman Kəlbəcərdə yaşamışdır. Göyçəyə qayıtdıqdan sonra bir müddət xırda alverlə məşğul olmuş, daha sonra isə bir dəyirman sazlayaraq, ailəni dolandırmış, kolxoz quruluşu zamanı dəyirmanı kolxoza qoymuş və ölənə qədər dəyirmançılığına davam etmişdir.

Şair Məhəmməd 1937-ci ilin yayında vəfat etmiş və Aşıq Ələsgərin qəbrinin yanında dəfn olunmuşdur.

Şair Məhəmmədin əldə olunan şeirləri əsasında "Çoban Məhəmməd" adlı şeirlər kitabı 2000-ci ildə AMEA Folklor İnstitutu tərəfindən çap olumuşdur. Burada şeirlərdən bəzi seçmələr təqdim olunur.

## *QOŞMA*

## AY SƏNƏM, SƏNƏM

Sübhü şəm dərdindən yahu çəkərəm,
Ölüncə deyərəm: ay Sənəm, Sənəm.
Gözlərimdən qanlı yaşlar tökərəm,
Kirpiyi ox, qaşı yay Sənəm, sənəm!

Bağban olsam, gəl bağçaya, bar apar,
Gəzək, seyr eyləyək bağı bərabar.
Yoxdu yer üzündə sana barabar,
Ərşdə mələklərə tay Sənəm, sənəm!

Buxağın büllurdu, yanağın lala,
Vəsfin təzəlikcə düşüb mahala.
Məhəmmədi döndəribsən abdala,
Eyləyibsən ömrün zay, Sənəm, sənəm!

## *GƏRAYLI*

## BİRDİ

Vəfalı dost tək-tək olar,
İnsanlarda yüzdə birdi.
Sən arzula can sağlığı,
Çox da birdi, az da birdi.

Kəklik ötər qış keçəndə,
Ovçu yanar boş keçəndə,
Güzəranın xoş keçəndə,
Qış da birdi, yaz da birdi.

Məhəmmədəm, düşdüm xəstə,
Canım qurban yaxşı dosta.
Eşqin olsa, sinən üstə
Tar da birdi, saz da birdi.

## *MÜXƏMMƏS*

## GÖYÇƏNİN

Hər mahalda dastan olub,
Söylənir halı Göyçənin;
Qəhr elədi çarxi-fələk,
Döndü iqbalı Göyçənin;
Dağıldı ağır sürüsü,
Talandı malı Göyçənin,
Pozuldu qurğu-büsatı,
Şəni, cəlalı Göyçənin;
Suyu saf, havası xoş,
Cənnət misalı Göyçənin.

Çarxı-qəzanın qədəri
Göyçəni eylədi talan;
Qaçan dağlarda qırıldı,
Əsir oldu dalda qalan.
Aman Allah! Nə gün çəkdi
Qürbət eldə qaçqın olan;
Nə qədər doğru danışdıq;
Dedilər: ”Söyləmə yalan,
Biz ki bilirdik, əzəldən
Azdı kamalı Göyçənin”.

Ah çəkməkdən qürbət eldə
Qara bağrım qana dönüb;
Çarx dolanıb, iqbal qaçıb,
Baxt yatıb, zamana dönüb.
Görün qəzanın qədərin,
Tülkülər aslana dönüb;
Cacıq yeyib, çaşır satan
Hərəsi bir xana dönüb;
Həcv eləyib deyir bizə:
“Bəddi amalı Göyçənin”.

Göyçənin şəhəridi
Basarkeçərinən Kəvər.
Neçə iyidlər var idi
Biri birindən mötəbər;
Dava düşdü, el qırıldı
Olduq vətəndən dərbədər;
Dedilər alveri kəsilib
Gələn, gedən gətdi xəbər;
Heç yandan xırıd gəlmədi,
Bağlandı yolu Göyçənin.

Göyçəni abad elədi,
Yaşasın Şura hökməti!
Ayağının sayəsində
Göyçə tapdı bərəkəti;
Hər şəhərə tel vurdular,
Gəldi güclü inayəti;
Həftədə bir payladılar,
Yaxşı saxladı milləti:
Qaldırıldı ortalıqdan
Dərdü məlalı Göyçənin.

Məhəmmədəm, duaçıyam;
Şura ölkəsi yaşasın!
Artsın şanı, şöhrəti,
Ucalsın səsi, yaşasın!
Hər mahala səddi düşüb,
Söylənir bəhsi, yaşasın!
Qəniminə qan ağladır,
Alır qisası, yaşasın!
Halal olsun yoldaşlara
Əmliyi, balı Göyçənin!



## USTA ABDULLA
(1865-1943)

Usta Abdulla təxminən 1865-ci ildə Göyçə mahalının Zod kəndində anadan olmuşdur. Onun atası dülgərlik sənətini oğluna da öyrətmiş və bu səbəbdən də Abdullaya "Usta Abdulla" demişlər. O, yazdığı şeirlərdə də çox zaman "usta" sözünü adının əvvəlində işlətmişdir.

Usta Abdulla mollaxanada təhsil almışdır. O, Ələsgər ocağı ilə daim ünsiyyətdə olmuş, şeirlərin müzakirə edildiyi ədəbi məclisdə iştirak eləmiş, özünün yazdığı şeirləri də müzakirəyə təqdim etmişdir. Bəlkə buna görə də, Aşıq Ələsgər onu öz oğlanlarından seçməmişdir.

Aşıq şeirinin müxtəlif janrlarında qələmini sınayan Abdulla təcnis yazmağa çox meyl göstərmişdir.

1943-cü ildə Gəncədə olarkən vəfat etmiş və vəsiyyətinə görə "İmamzadə" adlanan qəbiristanlıqda dəfn olunmuşdur.

## *QOŞMALAR*

### BİLƏ

Hər yetən gözələ gözəl demərəm,
Gözəl olur, yar qədrini yar bilə.
Bülbül güldən ötrü bağı dolanır,
İnsaf deyil, ləzzətini xar bilə.

Şeyda bülbül yuvasından çaşanda,
Eynim yaşı mövcə gəlib coşanda.
Sevgi sevgisindən ayrı düşəndə
Sağlığı canına ahü zar bilə.

Hər kəs özü çəkər xəcalətini,
Görmədim namərdin ədalətini.
Dost gərək dostunun əmanətini
Saxlaya yanında, yadigar bilə.

Abdulla da dəryalara dalıbdı,
Şikəstə könlünü zülmə salıbdı.
Aşıq qardaş, əlac sənə qalıbdı,
Dost gərək dostunu ümidvar bilə.

### ÇAĞINDA

Bir ox vurdun ürəyimin başına,
A bimürvət, günün batan çağında.
Naşı ovçu durub ov bərəsində,
Maral gəldi keçdi atan çağında.

Doldurub verəsən ipək sağıdan,
Qurtarmadım bu bimürvət yağıdan.
Səni nist olasan, məclis dağıdan,
Şirin ixtilatın qatan çağında.

Qafıldan canıma saldın azarı,
İl müddət çəkirəm bu ahü-zarı.
Açılsa Yusifin Firdos bazarı,
Sən al Abdullanı satan çağında.

## ÇƏKMİŞƏM

Əyyami-qəzada, qəhri-dünyada
Bilirsənmi, nə bəlalar çəkmişəm!?
Ahü-zar, müsibət dünyadan çıxıb,
Leyli-nahar nə bəlalar çəkmişəm.

Dağıldı mahalım, pozuldu elim,
Tükəndi dövlətim, gödəldi dilim,
Əyildi qamətim, büküldü belim,
Nə qazamat, nə qalalar çəkmişəm.

Abdulla, bir yana yetmədi dadım,
Ha yana düşdümsə, yandırdı odum.
İtib dülgərliyim, batıbdı adım,
Aranlarda nə alalar çəkmişəm.

## QARIŞAR

Mərdlərin içindən seçin namərdi,
İlqarsızdı, gedib elə qarışar.
Kökündən çıxardın qara tikanı,
Hayıfdı, ətirli gülə qarışar.

Alçaq adam qarışdırar aranı,
Bayquşda adətdir: sevər viranı.
Odun sayma qarağanı, turanı,
Yandırsan, köz olmaz, külə qarışar.

Ağac bəlli olar yaxşı barından,
İyidlər seçilər düz ilqarından.
Abdulla, ev tikmə qışın qarından,
Yazda gün əridər, selə qarışar.

## MƏNƏM

Arif məclisində, qanan yanında
Hər sözü dillərdə yayılan mənəm.
Eşqin atəşidi yanan canımda,
Qəza qamçısıyla döyülən mənəm.

Taqət olmaz qəriblərin dizində,
Mürvət olar mərd iyidin özündə.
Səksənində, doxsanında, yüzündə
Qəflət yuxusundan ayılan mənəm.

Yatmış idim, bəxtim məni oyatdı,
Qəzanın qədəri kəməndin atdı.
Mahalım Göyçədi, sakinim Zoddu,
Sənətkar Abdulla deyilən mənəm.

## OLAN VARMI

Arifi-müəzzəm, ey nuri didəm,
Mənim təki ömrü bad olan varmı!?
Qohumdan, aşnadan, dostdan, tanışdan
Xəyalı dolanıb, yad olan varmı?

Hər kəs özü mətləbinin qanmayan,
Dünya cifəsini nəhyi sanmayan.
Fələk əli dəyib, çərxi dönməyən,
Ləzzəti dahanda dad olan varmı!?

Dağlar qan ağlayır, düşüb borana,
Daha bundan sonra çətin yarana,
Göyçə yasa batsın, qaldı virana,
Daha Ələsgərtək ad olan varmı!?

Mənim üçün nə ata var, nə ana,
Arif gərək bu mətləbi tez qana.
Minək qəm atını, çıxaq cahana,
Görək bu dünyada şad olan varmı!?

Hacı Əliş ağanı talan eylədin,
Səməd bəyi gördün, yalan eylədin,
Bizi viran bağa bağban eylədin,
Qan ağla, sızılda, ha dolan varmı!?

Günbəgündən bağlayıram mən vərəm,
Könül sakit olub heç tapmır aram.
Nə Şirin, nə Fərhad, nə yazıq Kərəm
Abdullatək cismi od olan varmı!?

## *GƏRAYLILAR*

## ARASINDA

Səhərdən sərv boylunu
Gördüm bağlar arasında.
Tüstüm ərşə bülənd oldu,
Yandım yağlar arasında.

Yandım, yetirən olmadı,
Mətləb bitirən olmadı.
Öldüm, götürən olmadı,
Qaldım ağlar arasında.

Eşqin firqətindən çaşdım,
Zülfün toruna dolaşdım.
Abdullayam, sənsiz aşdım,
Gəzdim dağlar arasında.

## MƏN

Deyilənlər gerçəkdimi,
Doğurdanmı dəliyəm mən!?
İstəyirəm ağıllının,
İç üzünü əliyəm mən.

İşləyirəm hər bir öydə,
Mənə birdi kasıb, bəy də.
Haqqım olsa daş da, zəy də,
Hamısına "bəliyəm" mən.

Mən ustayam, çalışıram,
Dəzgahımla yarışıram.
Qan-tərimə qarışıram,
Abdullayam, ləliyəm mən.

## MƏNİM

Qulaq asın, a yoldaşlar,
Çoxdu qəhri-qəzam mənim.
Xəstə düşdüm qürbət eldə,
Artıq olub cəzam mənim.

Bir zaman gəzdim havalı,
Götürdüm muzdu, bavalı.
Qonşum imiş un çuvalı,
Dostum imiş qazan mənim.

Mənim işim ahü-zardı,
Bu gen dünya mənə dardı.
Abdullayam, günahkardı,
Dəftərimi yazan mənim.

## *TƏCNİSLƏR*

## A YARA DƏYDİ

Qafil bir ox atdın, keçdi sinəmdən.
Dərdindən cismimə a yara dəydi.
Pəhləvan gəzirdi meydan içində,
Keçdi pəhləvandan əyyara dəydi.

Gecə uzun, təbi nazik, yaralı,
İnsaf deyil, qurma mənə, yar, alı.
Yar incisə, yar könlünü yar alı,
Bilmirəm nə dedim, a yara dəydi.

Yaxşı dostun xəyalını ay ara,
Həftə dedin, neçə keçdi ay ara.
Təbib qarşı gəlsə, yetər a yara,
Təbib qarşı gəldi, a yara dəydi.

Düzdürübsən dəhanına, yar, inci,
Al xəncəri, bağrım başın yar, inci!
Abdulladan olmaz sənə yar, İnci,
Seyraqublar vurdu, ay ara dəydi.

## A YAZI BELƏ

Nəzər əyiləndə, iqbal yatanda,
Qananı qanmaza a yazı belə.
Kimin zimistanı nobahar keçdi!?
Məni də yandırır a yazı belə.

Öz əlinlə qoysan məni qara sən,
Al üstündən bağlayıbsan qara sən.
Sənsən salan bu zülmətə qara, sən,
Dağıt duman, çiskin, ayazı belə.

Həqiqi dost yandan beləmi keçər,
Kəmərin toqqası beləmi keçər.
Abdullanın ömrü beləmi keçər,
Qışı dərdü-möhnət, a yazı belə.

## LEYLİNİ YAZDI

Bihudə dolandım, əfsanə gəzdim,
Canım dost yolunda, Leyli, niyazdı.
Etibar kəsilib, ilqar pozulub,
Əvvəlki məhəbbət, Leyli, niyazdı?!

Qəmər qan ağladı, leşkər yeridi,
Yaram sızıldayır, neştər yeridi.
Leylinin qoluna neştər yeridi,
Məcnun qanı çöldə "Leyli"ni yazdı.

Dost olan dostunu çəkməzdi dara,
Al şanəni, siyah zülfün di dara.
Həsrət qoymaginən didar-didara,
Görən, dost yolundan Leyli niyazdı?

Həya çəkib, daldalanma sən ara,
Həqiqi dostundan kəsmə sən ara.
Abdullanın xəyalını sən ara,
Gəzir şəms təki leylini, yazdı.

## YARAĞINI SƏN

Səhər şikarını, seyri-gülşəndə,
Alıbsan dəstimin yarağını sən.
Şirin danışanda, şirin güləndə,
Qatırsan şərbətə, yar, ağını sən.

Mərdin məclisində nə danəsidi,
Mürğin dahanında nə danəsidi?
Dost dostdan sirrini nə danəsidi,
Deyirsən sözünün, yar, ağını sən.

Həqiqi dostunu sına gedəndə,
Seyraqub gərdəni sına gedəndə.
Sənətkar Abdulla sinə gedəndə.
Ümid var, verəsən, yar, ağını sən.

## *MÜXƏMMƏS*

## BƏRİ BAX

Şəninə dastan yazıram,
Ay qoşa duran, bəri bax!
Gürcüsən, aysorusan,
Yoxsa müsəlman, bəri bax!
Səf düşdüm, səbr elədim,
Mələksən, insan, bəri bax!
Xəstəyəm, yalvarıram,
Həkimi-loğman, bəri bax!

Gəzmişəm hər mahalı,
Gözəl yoxdu sən cürə, bax.
Yolunda məhbus olmuşam,
Gərdənində zəncirə bax,

Musayisən, Tövrat oxu,
İsayisən, İncilə bax.
İslamısan, and verirəm,
Ayeyi-quran, bəri bax!

Qaş qara, gözlər ala,
Yanaqların xalına bax.
Danışır şirin-şirin,
Ləblərinin balına bax.
Oynayıb-gülməkdədir,
Yoldaşının halına bax.
Yoldaşın bixəbərdir,
Sən təzə cavan, bəri bax!

Zülf tökülüb dal gərdənə,
Qabağa tellər yaraşır.
Burun püstə, dodaq qaymaq,
Yanağa güllər yaraşır.
Abdulla sadağadır,
Kəsməyə əllər yaraşır.
Hazarat, siz də deyin,
Gəlibdi qurban, bəri bax!



## BƏŞİR
(1867-1934)

Bəşir Aşıq Ələsgərin böyük oğludur. 1867-ci ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olmuşdur. Bəşir əvvəlcə öz kəndlərində, sonra isə Sarıyaqub kəndindəki molla məktəbində oxumuşdur.

Saz çalıb, söz qoşmağı bacaran Bəşir aşıqlıq etməsə də, bu sənətin qədir-qiymətini bilirdi. O, yazdığı şeirləri nədənsə mühafizə etməmişdir.

At minməyi, şux geyinməyi sevən Bəşir həm də əla nişançı idi. O, ömrü boyu heç kəsdən qorxub-çəkinməmiş, bəylərə, ağalara, qlavalara, pristavlara baş əyməmişdir.

1915-ci ildə münaqişə zəmnində kəndin kovxasını güllə ilə vuran Bəşir çar hakimiyyəti yıxılana qədər qaçaq yaşamışdır.

1918-ci ildə ermənilərin törətdikləri milli vuruşma zamanı Bəşir Göyçənin müdafiəsində böyük şücaət göstərmiş, yağılara ağır zərbə vurmuşdur. O, 1918-1921-ci illərdə Kəlbəcərin Qanlıkənd kəndində Aşıq Ələsgərlə bir ailədə yaşamışdır.

Bəşir 1934-cü ildə Kəlbəcər rayonunun Yanşaq kəndində qonaq olarkən xəstələnib vəfat etmiş və vəsiyyətinə görə orada da torpağa tapşırılmışdır.

## *QOŞMALAR*

## KİMİ

Səyyad olan bu dağları dolanar,
Ovu bərəsində bulana kimi.
Laçın qıya çəkər görcək şikarın,
Tab etməz havada alana kimi.

Bahar olcaq bağban barı gözləyər,
Vəfalılar düz ilqarı gözləyər,
Kişi olan namus, arı gözləyər,
Dosta xain çıxmaz ölənə kimi.

Bəşirəm, heç zaman çıxmıram yasdan,
Çaqqallar şir olub, tülkülər asdan.
Özgələr sözüynən incimə dostdan,
Eşidib dilindən bilənə kimi.

## QADAN ALIM

Əziz bəradərim, gəl otur rahat,
"Bəxtin yatdı, sən də yat", qadan alım.
Gecə qaranlıqda olan nadamət,
Cəhd elə, mənzilə çat, qadan alım.

Çətindi gədikdən, dağdan aşmağı,
Ola bu saqqalın əba-başmağı.
Qurbanın yerişi, malın qaçmağı
Eləyibdi məni mat, qadan alım.

Bəşirəm, hər yana göndərrəm çapar,
Harda olsa, onu axtarar, tapar.
On dörd maldan dördü qalıb, yığ apar,
Tez qayıt, Gəncədə sat, qadan alım.

## MƏN

Şövq əhliyəm, əldə yoxdu fürsətim,
İstəkli dostlardan aralıyam mən.
Qəhrli aslanam qəm libasında,
Seyraqub sözündən yaralıyam mən.

Düşəndə yadıma günün keçmişi,
Mənə yer eləyir fələyin işi.
Görüm viran qalsın belə gərdişi,
Bir soruşan yoxdu haralıyam mən.

Az qanan insana pis söz kar etməz,
Namərdə yalvarma, dadına yetməz.
Mərdlər dost yolundan kənara getməz,
Dost ucundan başı bəlalıyam mən.

Alçaq dağlar başda qarı saxlamaz,
Mərd iyidlər miras varı saxlamaz.
Laçın qaynağında sarı saxlamaz,
Tərlan ovlağından aralıyam mən.

Cavanlıq vaxtından üzüm gülmədi,
Qohum-qardaş, dost yanıma gəlmədi,
Ha yana əl atdım, iş düzəlmədi,
Əzəldən iqbalı qaralıyam mən.

Mən Bəşirəm, yalan gəlməz dilimə,
Bülbül təki həsrət qaldım gülümə.
Baxtımın kitabı keçə əlimə,
Oxuyub adımı qaralıyam mən.

## SƏHƏR ERTƏ

Axşamdan nə yesən, xub keçər gedər,
Qonağın qaydına qal səhər ertə.
Qonaqlar qanandı, güzaran edər,
Olsa qaymağınan bal səhər ertə.

Olsa bizim kimi tələsik qonaq,
Tez ver naharını, üzün olsun ağ.
Bir az pendirinən, bir az kərə yağ,
Qənddən istəkana sal səhər ertə.

Bəşirəm, doymaram mən ləzzətindən,
Kor Söyün yeznənin bu hörmətindən.
Düyü pilovundan, çolpa ətindən
Gətirginən dalbadal səhər ertə.

## TƏZƏ

Sübhün çağı gördüm çeşmə başında,
Burda canlar alan bu yazdan təzə.
Eybi yox əndamda, nə göz-qaşında,
Sərasər geyinmiş ətlazdan təzə.

Dedim: niyə mayıl-mayıl gəzirsən?
Eyləyib ağlımı zayıl, gəzirsən.
Qul olum, eyləsən qayıl, gəzirsən,
Deyim qurban, nəzir-niyazdan təzə.

Can alanım, canım alan gəzirəm,
Həmi xürrəm, həmi nalan gəzirəm.
Axtarıram, elə oğlan gəzirəm,
Necə ki ay çıxar ay yazdan təzə.
...............................................
(*şeirin davamı əldə olunmayıb*)

## OLMASA
(nöqtəsiz)[9]

Daha könlüm murad almır,
Aləmdə var olmasa;
Olar gəda, gələr gülər
Ürəkdə ar olmasa.
Mərd dura ərsədə gərək,
Səd vura öldürməyə;
Hər kəs gəlsə, həm kam alar,
Əgər kor-kar olmasa.

Al gəlirəm, gördüm harda
Mərd var olsa, mərd görəm;
Əldə var dava gəlirəm,
Vuram harda dərd görəm;
Allahi Məhəmməd əla
Vali Məhəmməd görəm;
Mahı harda görmək olar,
Gər mədətkar olmasa.

Dədəm gəlmir, əmim gəlmir,
Dostlarım harda gələr!?
Görərik ki, qohum harda
Olsa da, darda gələr.
Mərdi-mövla olmasa,
Ölsəm, mur-kar da gələr.
Əməllərim gülə-gülə
Əldə hasar olmasa.
...........................................
*(Şeirin davamı əldə olunmayıb)*

---
[9] Nöqtəsiz – Ərəb əlifbası ilə şeirdə nöqtə işlədilmədiyinə işarədir.



## AŞIQ QURBAN
(1870-1915)
**(şəkil şərtidir)**

Aşıq Qurban Aşıq Ələsgərin qardaşı Məşədi Salahın oğludur. O, 1870-ci ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olmuşdur.

Gözəl səsə, bədahətdən şeir söyləmək qabiliyyətinə malik olan Aşıq Qurban həm də simaca çox yaraşıqlı bir aşıq imiş. O, saz havaları ilə yanaşı, muğamların da gözəl ifaçısı olmuşdur.

Aşıq Qurban Aşıq Ələsgərin ən sevimli şəyirdi, həm də qızı Gülnisənin əri idi. Aşıq Talıbın və digər qohumların söyləmələrinə görə, Aşıq Qurbanın vəfatı böyük ustada elə məyusluq gətirmişdir ki, bu hadisədən sonra o, bir daha əlinə saz almamışdır.

Aşıq Qurbanın şeirləri unudulmuşdur. Əldə edilən nümunələr Aşıq Talıbın və Aşıq Ağayarın hafizəsindən qələmə alınmışdır.

Aşıq Qurban 1915-ci ildə qəflətən vəfat etmişdir.

## *QOŞMALAR*

## GETMƏSƏM, OLMAZ

Ata, vallah, bu dərd məni yandırır,
Verdiyim ilqara getməsəm, olmaz.
Seyraqublar gedər yaman qandırar,
Ollam üzü qara, getməsəm, olmaz.

Huri, qılman olmaz yarın təhrində,
Mən yanıram qəm odunun qəhrində.
Əgər Mansır kimi Hələb şəhrində
Çəksələr də dara, getməsəm, olmaz.

Mən Qurbanam, öz canımdan doymuşam,
Xəncər alıb, bağrım başın oymuşam.
Öz dilimnən doğru ilqar qoymuşam,
Həsrət, intizara getməsəm, olmaz.

## YETİRSİN

Aşiq gərək məşuqundan dönməsin,
Vədə versə, düz ilqara yetirsin.
Qasid yoxdu, mən bir namə göndərim,
Ərzi-halım nazlı yara yetirsin.

İlqar saxlamışam iman içində,
Ümid bəsləmişəm güman içində,
Gövhər qalıb dərya, ümman içində,
Qəvvas gərək bir kənara yetirsin.

Yazıq Qurban sirrin əyan eyləsin,
İstəkli dostuna bəyan eyləsin,
Dost gərək dostuna dərman eyləsin,
Nə ki, zülm əliynən yara yetirsin?!

### *TƏCNİS*

## AY ANA DÜŞƏR

Qürbət eldə baş yastığa gələndə,
Qəribin yadına ay ana düşər.
Əcəl yetirəndə, vaxt təng olanda,
Ona haqq rizası əyana düşər.

Könül sim axtarar, nə zərə gələr,
Pərdəli gəzməyən nəzərə gələr.
Elə ki, Əzrayıl nəzərə gələr,
Boşalar qolların, a yana düşər.

Mən xəstəyəm, gəl ələ ha al əli,
Sərraf gözüm xub tanıyır ha ləli.
Yazıq Qurban, ha sızılda, ha ləli,
Görək ki, əlinə, aya, nə düşər!?

### *MÜXƏMMƏS*

## YARAŞIR

Qiyasbəyov Həsən bəyə
Bir yaxşı dastan yaraşır.
Qurşasın kəmərini
Ol Şahi-Mərdan, yaraşır;
Şəninə şikar alan
Alıcı tərlan yaraşır;
Səxavətdə Hatəm kimi,
Hökmü Süleyman yaraşır;
Layiqdi bu oğlana,
Qafqaza sultan yaraşır.

Atası Səməd ağanı
Eşidib hər yan, bilirəm;
Kəlməsinin qiyməti yox,
Bağlayıb çox qan, bilirəm;
Çoxunu dardan qurtarıb,
Eyləyib ehsan, bilirəm;
Peyğəmbər bərat eləsin
Cənnəti-Rizvan, yaraşır.

Qaynayır samavarı,
Yanında ağır yığnağı;
Gümüş qab, xas istəkanı
Dəstində gəzdirir sağı;
Erkək kəsir, şülən çəkir,
Quburnat, sərdar qonağı;
Təmkini padşahyana,
Müxtəsəri, sözün sağı;
Günbəgündən artıq olsun
Bu qurğu, dövran yaraşır.

Ata-babadan tanıram,
Kişinin əsli, zatı var;
Çiynində süzən tüfəng,
Altında köhlən atı var;
Padişahdan talğası,
İlahidən baratı var;
Qırantlar mərmər daşında.
Behişt kimi büsatı var;
Mehman otağa layiqdi,
Otağa mehman yaraşır.

Cəmi bəylərin bəyidi,
Yüz yaşasın Həsən ağa!
Aşıq gördüyünü deyər,
Dilinə yoxdu qadağa;
Bir belə mərd iyidin
Yolunda sərim sadağa;
Kəlməsinə onluq verir,
Aşığı gəlir damağa;
Qulluğunda söhbət açır,
Eləyir dövran, yaraşır.

Yetiyəm xəsyətinə,
Yaxşıdı halı, söylərəm;
Dürrü gövhər kəlməsi var,
Ləldən bahalı söylərəm;
Zəfəranlı ağ plovu,
Əmliyi, balı, söylərəm;
Hər yerdə bəhsin salıb,
Gəzib mahalı, söylərəm;
Vəsfini dastan eyləyib
Bu yazıq Qurban, yaraşır.



# ŞAİR ƏBDÜLƏZİM
(1873-1943)

Şair Əbdüləzim Aşıq Ələsgərin ortancıl oğludur. O, 1873-cü ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olmuşdur.

Kiçik yaşlarından Aşıq Ələsgərin evindəki saz-söz məclislərinin iştirakçısı olan Ədüləzim də aşıq şeiri səpkisində düzüb-qoşmağa maraq tez oyanmışdır, həmin təsirlə də müxtəlif şəkilli sənət inciləri yaratmışdır.

Şair Əbdüləzim təhsil görməmişdir. Lakin onun əldə edilmiş bir sıra şeirləri savadlı bir şairin yaradıcılığı təsirini bağışlayır.

Şair Əbdüləzimin əsas məşğuliyyəti dülgərlik idi. O, həm də çox işgüzar bir rəncbər olmuşdur.

Şair Əbdüləzim 1934-cü ildə Kəlbəcərin Yanşaq kəndinə köçmüş və 1943-cü ildə vəfat etmiş, Aşıq Ələsgərin qəbrinin yanında dəfn olunmuşdur.

## *QOŞMALAR*

## ÇƏKƏ BİLMƏZ

İstəyirəm gedəm diyarbadiyar,
Könül vətənindən əl çəkə bilməz.
Gərək bülbül çəkə gülün qəhrini,
Bülbülün qəhrini gül çəkə bilməz.

Yad olubdu qohum, qardaş, el mana,
Yaxın ikən uzaq düşüb yol mana,
İlahim veribdi dərdi bol mana,
Yükləsəm, bir qatar fil çəkə bilməz.

Gün xoş keçər, əgər dövlət, var olsa,
Zərrəcə nəzəri-kirdigar olsa,
Şahlar şahı bir kişiyə yar olsa,
Yığılsa ayağın el çəkə bilməz.

Əbdüləzim dərdü-qəmin dustağı,
Çəkibdi sinəmə dağ üstən dağı.
Bu dərdi, möhnəti, belə fərağı
Mən çəkirəm, heç kəs, bil, çəkə bilməz.

## GÖSTƏRİR

Üsuli-din beş kəlmə, əvvəli tohid,
Dəlilində bir Allahı göstərir.
İkinci, Ədldi, yəni ədalət,
Ədl adil padşahı göstərir.

Üçüncü nübüvvət, haqdı peyğəmbər,
Adəmdən xatəmə verilir xəbər.
Yazılıb ayələr, olub mötəbər,
Quran bizə doğru rahı göstərir.

Dördüncü bərhaqda on iki imam,
Zahirdi, yəqindi, bilmirəm tamam.
Aqibət dərdimə eyləyib əncam,
Məhəmmədi, din pənahı göstərir.

Beşinci, məaddı: ölmək-dirilmək,
Bizlərə vacibdi bunları bilmək.
Əməlin əlində məhşərə gəlmək,
Həm savabı, həm günahı göstərir.

Əvvəl sovmü-salat vacibdi bizə,
Bərhaqda Xaliqim, görünməz gözə.
Orucsuz, namazsız təharət sizə
Məşhər günü nurullahı göstərir.

Əbdüləzim, çəksən zar ilə zillət,
Çaşmasın xəyalın, eyləmə küdrət.
Bu zari-fənada nə qədər möhnət,
Hər nə görsən, bir İlahi göstərir.

## KEÇDİ

Nagah badi-siyah əsdi üzümə,
Qaraldı könlümün çırası keçdi.
Çarxı-fələk bir od atdı sinəmə,
Sağalmaz məhşərə yarası, keçdi.

Gecələr sübhədək yatmıram yerdə,
Fəğanım ucalır pərdəbəpərdə.
Yazıq canım düşüb belə bir dərdə,
Bulunmaz dərmanı, çarası keçdi.

Üstümüzə qəm binası qoyuldu,
Təzələndi, köhnə yaram, soyuldu.
Ürəyim dəlindi, bağrım oyuldu,
Xəyalımla işin harası keçdi!?

Mən sana neylədim, söyləsən, bilək,
Açırsan başıma gündə min kələk.
Sübut eylə görüm, ay çarxı-fələk,
Denən, xoş gününün burası keçdi.

Əbdüləzim nəyə baxsın, öyünsün,
Məhşərədək qəmdən libas geyinsin.
Daha yadlar desin, gülsün, söyünsün,
Bizim deyib-gülmək sırası keçdi.

## MƏN OLDUM

Əl maddımı, göz dustağı, günahkar,
İl xəstəsi, zarü-müztər mən oldum.
Qohumun, qardaşın, dostun yanında
Üzü qara puzi-məhşər mən oldum.

Mənim üçün daha şadlıq yalandı,
Qəm əlindən cavan ömrüm talandı.
Xəstə canım ataşlara qalandı,
Həm pərvanə, həm səməndər mən oldum.

Ha yana baxanda gözüm öyünməz,
Könül qəmdən qeyri libas geyinməz.
Əli bayramında kafər söyünməz.
Söyünmədim, əsl kafər mən oldum.

Bu dünyada şad olmayan, gülməyən,
Sağalmaz azara düşən, ölməyən.
Dindirəndə özün, sözün bilməyən,
Huşu çaşqın, ağlı sərsər mən oldum.

Əbdüləzim dastan olub dillərə,
Axdı eynim yaşı, döndü sellərə.
Məcnun dərd əlindən düşdü çöllərə.
Həmi Məcnun, həm qələndər mən oldum.

## *TƏCNİSLƏR*

### QALA, SƏN QALA
(dodaqdəynməz)

Niyə şərik çıxdın şeytan şərinə,
Nahaqdan qarışdın qala, sən qala.
Eşq atəşin saldın aşıq sərinə,
Səngisə, ətəklə, qala, sən qala.

Dindirirsən deyir: – yaxşı, – canana,
Həsrətik cahanda yaxşı canana.
Gedə yetişəsən yaxşı canana,
Əylənə yanında qalasan, qala.

Əbdüləzim keçdi qeyrət, az ardan,
Dil həsrətdi, canan gələ, a Zardan.
Hicranın qəhrindən, dərddən, azardan
Çəkdin cəsədinə qala, sən qala.

## SƏDRİNƏ SƏRDİ

(dodaqdəyməz cığalı təcnis)

Səhər-səhər canan seyrə çıxanda,
Dərdi lalə, nərgiz, sədrinə sərdi.
        Aşıq deyər, sərinə,
        Canan əldə səri nə?
        Qış aranda can saxla,
        Yayda çıxar sərinə.
Çən çəkildi, çıxdı dağlar sərinə,
Sərin-sərin yellər sədrin əsərdi.

Xəstə dildə zikr eyləyər az ayə,
Çaşqın gəzsən, ağlın gedər a zayə.
        Aşıq deyər, az ayə,
        İlqar eylə az, ayə.
        Əcəl gələr, can gedər,
        Canan gələr azayə.
Dərd yığılar, ağrı gələr azayə,
Gələn dərd əlindən sədrin əsərdi.

Əbdüləzim, çək dəstini, nakəsdən,
Dil cahanda incik deyil nakəs dən?
        Aşıq deyər, nakəsdən,
        Dan yelləri nakəs dən.
        İndiyədək kişiydin,
        Daha indi nakəsdən.
Saqın gəzsə, hərcayıdan, nakəsdən,
Sədəqə iyidin sədri, nə sərdi.

## *DİVANİLƏR*

### BEŞ
(qıfılbənd)

Bu dünyada o nədir ki,
Bədəni bir, başı beş?
Hər başında dörd gözü var,
Hər gözündə qaşı beş.
O bədənin cəm gözündə
İyirmidi kirpiyi,
Ağlayanda qətrələnir
Hər kirpiyin yaşı beş.

Həm yeyilir, həm yeyilmir,
Həm şirindir, həm acı;
Cümlə aləm gözün tikib,
Olub onun möhtacı;
Dağı dəlir, daşı yarır,
Alır ondan xaracı;
Simü-zərdən cəsədinin
Çəkibdi nəqqaşı beş.

O bədənin hesabınan
Canda yüz damarı var;
Hər tərəfə yolu işlər,
Çox açıq bazarı var;
Hər kim ilə ülfət qılsa,
Ona xeyir-karı var;
Mən istərəm, qoy sinəmə
Dəysin onun daşı beş.

Nə ölüdü, nə diridi,
Nə əti var, nə qanı;
Bəni-insan cəmisində
Gedər gəzər hər yanı.
Əbülfəzim deyər, hər kəs
Tapsa bu müəmmanı,
Çox dərindən fikrə düşər.
Eyləyər təlaşı beş.

## MƏNİM
(qıfılbənd)

Əvvəlinci imamımdı
Ol Şahi-Mərdan mənim;
Oxunan yüz on dörd surə,
Ayeyi-Quran mənim;
Nəcəf mənim, Məkkə mənim,
Şahi-Xorasan mənim;
On bir övladıynan bərhəq
On iki imam mənim;
Cəmi müşkül işlərimi
Sən eylə asan mənim!

Otuz üçnən dörd məqamı
Bağlayıbdı, yol gəlir;
Altı iki on ikiynən
Onu yəqin bil, gəlir;
İyirmi dörd səkkizinən
Gör necə müşkül gəlir;
Yeddi iyirmi dördünən
Bizə şirindil gəlir;
On iki qırx səkkizinən
Cəm olub tamam mənim.

İyirmi dörd on beşinən,
Altısı can üstədi;
Üç beşinən səkkiz tamam
Durubdu can üstədi;
Dörd üçünən altı biri
Bəlli bəyan üstədi;
Yeddi iyirmi dördünən
Hesabı on üstədi;
Yüz iyirmi iki üçnən
Qurğunu quran mənim.

Dörd padişah, üç qulamı,
Hər qulamın dörd əli;
Doxsan iki ilən gəzir,
Nədi onun əngəli?
Altısında səkkiz ayaq,
Altı yeddiynən gəli;
Əbülfəzim bu hesabdan
Baş tapmır, olub dəli;
Yaxşı bilər dərdlərimi
Oxuyub qanan mənim.

## ŞİRİN
(qıfılbənd)

Bu dünyada o nədi ki,
Dövlətdən, maldan şirin;
Zəhməti zəhərdən acı,
Ləzzəti baldan şirin?
Hansı bağda neçə ağac-
İki cür meyvəsi var;
Kalı dəymişindən şirin,
Dəymişi kaldan şirin?

Bu dünya o dünyadı ki,
Dolu gələn, boş gedər;
Əcəl gələr, ağrı yetər,
Ağıl çaşar, huş gedər.
Yaranandan ölənədək
İnsanata xoş gedər;
Dalı qabağından şirin,
Qabağı daldan şirin.

Əbdüləzim, deməynən ki,
Dünya sənə qalacaq;
Canı verən borc veribdi,
Axır bir gün alacaq;
Soyacaqlar libasını,
Gül irəngin solacaq;
Beş arşın ağ olar sana
Yaşıldan, aldan şirin.



## AŞIQ ƏSƏD
(1874-1951)

Göyçə ədəbi mühitində yetişən, özünün ifaçılıq məharəti ilə şöhrət qazanan aşıqlardan biri də Aşıq Əsəd olmuşdur. O, Göyçənin Böyük Qaraqoyunlu kəndində təxminən 1874-cü ildə dünyaya göz açmışdır. On iki yaşında atadan yetim qalmış Əsəd bir müddət nökərlik və muzdurluq etməyə məcbur olmuşdur.

Qüvvətli səsi olan Əsəd Aşıq Ələsgərə şəyirdlik eləmiş, saz sənətinin sirlərini ondan öyrənmişdir. Özünün etirafına görə, o, on il böyük ustada qulluq eləmişdir.

Aşıq Əsəd otuzuncu illərdə Tovuza köçmüş və ömrünün sonuna qədər orada yaşamışdır.

Azərbaycan aşıqlarının birinci və ikinci qurultaylarındakı çıxışlarına görə şöhrət qazanan Aşıq Əsəd 1938-ci ildə Moskvada keçirilən Azərbaycan incəsənəti ongünlüyündə "Şərəf nişanı" ordeni ilə təltif edilmişdir.

Aşıq Əsədin yaratdığı şeirlərin böyük bir qismi Sovet dövlət quruluşuna, onun yeritdiyi siyasətin təbliğinə həsr edilmişdir. Aşığın Vətənə, onun gözəlliklərinə, ləyaqətli övladlarına həsr etdiyi şeirlər də az deyildir.

Xalqın bu sevimli nəğməkarı 1951-ci ildə Tovuzda vəfat etmişdir.

*QOŞMALAR*

## ON İL QULLUQ ETDİM MƏN ƏLƏSGƏRƏ

On il qulluq etdim mən Ələsgərə,
Sidqimi bağladım etiqadına.
Hər nə desə, qəbul etdim sözünü,
Məni də yetirdi haqq baratına.

On il qulluğunda dayandım, dözdüm,
Dilindən nə çıxdı, sinəmə yazdım.
Qırx beş il dünyanı dolandım, gəzdim,
Bələd oldum yerin yeddi qatına.

Yaxşını götürdüm, yamandan qaçdım,
Oxudum, sinəmin dəftərin açdım.
İyirmi beş yaşında qaynadım, coşdum,
Otuz yaşda mindim eşqin atına.

Eşqin səməndini hər yana çapdım,
Mərd ilə namərdi axtarıb tapdım.
Heç könül yıxmadım, çox könül yapdım,
Göz qoydum dünyanın hər büsatına.

Əsəd deyir, ustada son qoyanın,
Pünhanda laf edib, özün öyənin,
Ustad sözün öz adına deyənin
Lənət gəlsin onun əsli-zatına!

## GƏLİNCƏ

Dostum, mənə vədə verdin, gəlmədin,
Çox çəkərəm ahü zarı gəlincə.
Xəstə kimi sızıldaram sübhədək,
Yata bilməm gecə yarı gəlincə.

Gözəl gərək sirr saxlaya dərində,
Ağlı, huşu, etibarı sərində.
Məcnun kimi durram vədə yerində,
Gözləyərəm düz ilqarı gəlincə.

Bir namə vermişəm sübhün badına,
Yoxsa mən düşmərəm onun yadına?
Yanar cismim, atəşinə, oduna,
Çəkər könlüm intizarı gəlincə.

Ruhum bağlı qalıb siyah telində,
Zənbur bal bağlayıb şirin dilində.
Əsəd deyir, gözüm qalıb yolunda,
Çıxır canım bizə sarı gələncə.

## SƏN MƏNİ

Sənə neyləmişdim mən bəxti qara,
Niyə saldın bu azara sən məni!?
Hər nə desən, əmirindən qaçmıram,
Qul adına çək bazara sən məni.

Yusif də qul oldu o Züleyxaya,
Kərəm Əsli deyə girdi kilsaya.
Onlar kimi məni saldın sevdaya,
Tüccar etdin ahü zara sən məni.

Bağban oldum, bağda barı gözlədim,
Vaxt addatdı, gecə yarı gözlədim,
Doğru sözü, etibarı gözlədim,
Bənd eylədin düz ilqara sən məni.

Gözüm qaldı gözlərinin məstində,
Cəllad qaşın durub canım qəsdində.
Xəstənin dərmanı sinən üstündə,
Həsrət qoydun bir cüt nara sən məni.

Niyə qoydun yana-yana Əsədi?
Yetirmədin bir dərmana Əsədi.
Eyləyibsən bir pərvana Əsədi,
Yandırırsan, ay Sitara, sən məni.

## YADIMA DÜŞDÜ

Şanlı məktubunu oxuyanda mən,
Çalmalı dağları yadıma düşdü.
Təndir torpağının alma çiçəyi,
Lilpar bulaqları yadıma düşdü.

Dalı Gödək güney, qabağı Çatar,
Fermanın dövləti dağları tutar.
Ömürlər uzadar, mətləbə yetər,
Bu gözəl çağları yadıma düşdü.

Başı Çalmalıdı, ayağı düzlər,
Toyda oynayırmı gəlinlər, qızlar?
Oxuyub çalırdım sədəfli sazlar,
Gözəl yığnaqları yadıma düşdü.

“Göyçənin qonağa çoxdu hörməti”,
Təzə cavanların var məhəbbəti.
Qayğanaq, qəysəfə, əmliyin əti,
Eyvan-otaqları yadıma düşdü.

Əsəd bu fanidən köşüb üqbaya,
Dəli könül yenə qalxıb havaya.
Qoçdaşın düzləri, Buxarlı qaya,
Tərlan ovlaqları yadıma düşdü.

## *GƏRAYLILAR*

## KİMDƏN ÖYRƏNDİN

Oğrun-oğrun daldalardan
Baxmağı kimdən öyrəndin?
Qafildən könlüm evini
Yıxmağı kimdən öyrəndin?

Gül xəcildi yanağına,
Bal bələnib dodağına.
Qızıl üzük barmağına
Taxmağı kimdən öyrəndin?

Mail oldum qələm qaşa,
Sədəf kimi incə dişə.
Əsədin canın atəşə
Yaxmağı kimdən öyrəndin?

## YOL ÜSTÜNDƏ
## DURAN GÖZƏL

Yol üstündə duran gözəl,
Söylə görüm, haralısan?
Yaranıbsan bir qətrədən,
Hansı yerin maralısan?

Yaradıb Cabbarü Cəlil,
Bədnəzəri olsun zəlil!
Nə baxırsan məlul-məlul,
Yoxsa yardan yaralısan?

Əsəd deyir, intizaram,
Açılmış güllərin dərəm.
Hər gün sənlə seyrə varam,
Heyif, bizdən aralısan.

## *TƏCNİSLƏR*

## DÜRÜST OLMAMIŞ

Kamil ovçu durub ov bərəsində,
Atmaz xədəngini dürüst olmamış.
Sərraf olan seçər ləli, gövhəri,
Arayıb dəstində dürr üst olmamış.

Əgər qəvvas isən, axtar adamı,
Göydən yerə neysan yağar, a damı.
Dürüst adam gəzər dürüst adamı.
Nadürüst axtarar dürüst olmamış.

Əsəd bəhri-mühit çaylar toxuna,
Qayıq üzə, ləpə gələ toxuna.
Cürbə istər gölə, şirə toxuna,
Elmi cəm eyləyib dürüst olmamış.

## NƏ QARA SƏNİ

Dedim, könül, durma dağ zirvəsində,
Bir gün düçar edər nə qara səni.
Dilin çatmaz nə bir elə, obaya,
Bürüyər nə ağ gün, nə qara səni.

Yetişməz dostların heç vaxt haraya,
Deyən olmaz, görüm getdi haraya?
Gözün dikmə hər həftəyə, hər aya,
Nə Əli axtarar, nə Qara səni.

Təbib gərək, sinəsini o yara,
Açıb ürəyini, eylər o yara.
Uzaqdadı, əli çatmaz o yara,
Əsəd heyran etdi nə qara səni?

## *DİVANİLƏR*

## EYLƏMƏZ

Ağlı olan namərd ilə
Əhdi-ilqar eyləməz;
Nəfəsinə tabe olub,
Seyri-güzar eyləməz;
Mərifətlə səfa sürsə,
Beş gün ömrü xoş olar;
Ruzi haqdan bərqərardı,
Baxtın şikar eyləməz.

Bəxt əyilib, xəyal dönsə,
Baxtın, olmaz ilhamın;
Ruhun ölər, gözün görməz,
Artar dərdü ələmin;
Şükür zikrin qəbul etməz
Xaliqi-rəbbül-aləmin;
Etiqadın düz olmasa,
Sirrin aşkar eyləməz.

Aşıq Əsəd, xəyal ilə
Gəşt elə, dünyanı gəz;
Müxənnətə sirrin vermə,
Əsli düz olanı gəz;
Zər qədrini zərgər bilər,
Mətahın alanı gəz;
Hər nadana sözün satma,
Qalsa, zərər eyləməz.

## OLMASA

Ağlı olan çox danışmaz,
Dərdi hazar olmasa;
Heç kimsənə xəstə yatmaz,
Canda azar olmasa.
Axtarıram, yoxdur təbib
Dərdə dərman eyləyə:
Çox çalışmaq əfsanədi,
Haqdan nəzər olmasa.

Dərdi olan tüccar kimi
Yuklə hər yana gedər;
Söylər dərdin dərd bilməzə.
Özü əfsanə gedər;

Axırında Məcnun olub,
Bər-biyabana gedər;
Qan ağlamaz, sızıldamaz,
Canda azar olmasa.

Dərdi olan yad olmasın
Ol mövlanın dərdindən;
Daima əlin çəkməsin
Mərd igidlər sirrindən.
Qəlb əyilsə, bulmaz şəfa,
Duman getməz sərindən;
Şahi-Mərdan-Şiri-Yəzdan
Dilində car olmasa.

Vaqifin ol gözəllərə
Tərif büsatı deyim;
Ələsgər, Xəstə Qasımda
Var etiqadı deyim;
Şirin deyib qaya çapdı
Yazıq Fərhadı deyim;
Kərəm oda yanmaz idi,
Çeşmi-xumar olmasa.

Aşıq Əsəd xırd eləsin
Daim öz mətahını.
Həqiqətin, mərifətin
Gözlə bəndərgahını.
Doğru, düzgün, qeyrət ilə
Saxla dost irahını;
Dost dostundan kənar olmaz
Mərdiməzar olmasa.

## *MÜXƏMMƏSLƏR*

## AĞRIN ALIM

Ay qaraqaş, ay yaşılbaş,
Qarşıda süz, ağrın alım;
Cilvələnib eşqə bələn,
Telini düz, ağrın alım;
Dildə kəlam, əldə qələm
Dərdimi yaz, ağrın alım;
Firqətindən, həsrətindən
Oldum nasaz, ağrın alım;
Al hava, gətir dəva,
Eyləmə naz, ağrın alım.

Boyu bəstə, oldum xəstə,
Mən yazığa sən rəhm elə.
Üz qəmər, müşkü ənbər
Xub yaraşır siyah telə;
Altından al, bir qumaş şal
Dolayıbsan nazik belə;
Alma yanaq, qaymaq dodaq,
Göz önündən getmə hələ;
Gətirim saz, ol xoşavaz,
Ay Sərvinaz, ağrın alım.

Bir şəhla göz, bir belə qız
Görməmişəm bu dünyada.
Etmir hesab, bu nainsaf
Aşiqini salmır yada.
Salma çölə, insaf elə,
Mən xəstəyə versin bada.
Əldə gülü, şirin dili
Mən görmüşəm Minayada.
Keç başa, qıl tamaşa,
Mən çalım saz, ağrın alım.

Ay mələk, qurma kələk,
Gözlərini süz, bəri bax!
Gəl mərdana, bu gərdana
Saçlarını düz, bəri bax!
Bu gün yazım, şeir düzüm,
Olaq üzbəüz bəri bax!
Bu səhər, qoynun bahar,
Açılıbdır yaz, bəri bax!
Daranıb, xub yaranıb
Belə şahbaz, ağrın alım.

Ay gülüm, şən bülbülüm,
Cəh-cəh vurub etmə haşa;
Alma yanaq, büllur buxaq,
Bal bələnib dilə, dişə.
Sayıl olub, mayıl olub
Hər kəs görsə mayıl qaşa.
Bu bazardan, bədnəzərdən
İllər boyu uzaq yaşa.
Əsəd deyir, vəsfin yazır
Bir belə qız, ağrın alım.

## XIRDACA QIZ
(Aşıq Ələsgərə nəzirə)

Naz ilə gəldin otağa
Leylinişan Xırdaca qız!
Tovuz kimi cilvələnib,
Artırır şan Xırdaca qız.
Biri huri, biri pəri,
Biri də sən, Xırdaca qız!
Gözləri cəllada dönüb,
Qəmzəsi qan Xırdaca qız.

Məclisə o əmr eləyib,
Aşiqini saz eləsin;
Davud kimi nəfəs çəkib,
Bir də xoş avaz eləsin:
Bülbül kimi cəh-cəh vurub,
Zimistanı yaz eləsin;
İşvə, qəmzə canım alır,
Daha bizə az eləsin;
Mən ki sənin aşiqinəm,
Eylə güman, Xırdaca qız!

Gəzmişəm hər ölkəni,
Belə canan görməmişəm;
Boylananda durna sayaq,
Qaşı kaman görməmişəm;
El-obada, ay hazarat,
Allah, aman görməmişəm;
Mənim kimi eşq əlindən
Oda yanan görməmişəm;
Yaraların məlhəmisən,
Öldür, aman, Xırdaca qız!

Cahıl, ahıl, qarasaqqal
Görüb, sənə mail olub.
Didarından ayrı düşən
Ağlı gedib, zayıl olub.
Sən Leylisən, mən bir Məcnun,
Çölə düşüb, zayıl olub;
Hər nə fərmayiş buyursan,
Hamı ona qail olub;
Əmrinə baş əyiblər,
Buyur fərman, Xırdaca qız!

Gəzmişəm mən, görməmişəm
Sənintək qaşı qəməri;
Belin nazik, gərdən nazik,
Bağlayıb qızıl kəməri;
Tər-təzə ağ qoftanın
Üstündən geyib məxməri.
Əsəd sənə qurban deyib
Bu əziz can ilə səri.
Bir gün ola, güzar düşə,
Ola mehman, Xırdaca qız.



## AŞIQ NƏCƏF DAŞKƏNDLİ
(1876-1919)

Aşıq Nəcəf Allahverdi oğlu 1876-cı ildə Göyçə mahalının Daşkənd kəndində anadan olub. Nəcəf olduqca yaraşıqlı, boylu-buxunlu, qəddi-qamətli adamıymış.

Mükəmməl bilik, dərin hafizə, möcüzəli səs sahibi olan Aşıq Nəcəf səliqə-səhmanı, ədəb-ərkanı ilə həmişə diqqəti çəkər; aşıqdan çox bəyə, bəyzadələrə oxşayarmış.

Aşıq Nəcəf Aşıq Ələsgərə on il şəyirdlik edib, onunla ağır məclislər yola salıb. Aşıq Nəcəf Dədə Ələsgərin ən çox sevdiyi şəyirdlərindən olmuşdur. Onun səsi Aşıq Əsədin səsi ilə uyğun gəldiyindən hər ikisinə məsləhət görərmiş ki, siz daim bir yerdə olun, bir yerdə çalıb oxuyun. Yüksək səs tempirinə görə Aşıq Nəcəflə Aşıq Əsəd otuzluq lampanı dəfələrlə toy məclislərində söndürərmişlər. Aşıq Nəcəflə, Aşıq Əsəd 1910-cu ildə İran səfərində olarkən Təbriz aşıqlarının ustadı onlara hörmət və ehtiram əlaməti olaraq hər birinə on telli saz bağışlamışdır. Bu saza "Xətai sazı" da deyilir, qolunun içi boşdur.

Aşıq Nəcəfin Şəmistan, Şəmiddin, Mikayıl, Astan və İsmayıl adında beş oğlu olmuşdur.

1919-cu ildə ermənilərin Göyçə mahalına silahlı basqını zamanı Nəcəf əsir düşmüş, "Küllü təpə" deyilən ərazidə belinə odlu samovar bağlayaraq və beş oğlu ilə birlikdə vəhşicəsinə öldürülmüşdür.

## *QOŞMALAR*

## KƏLMƏSİN

Oyandım yuxudan azan səsinə,
Təkrarladım "Allah, Əkbər" kəlməsin.
Allahın məsəli, – Əla Məhəmməd,
Rəsulu ol Əkrəm Muxtar kəlməsin.

Qulfəllahu Əhəd öyrəndim, dedim,
Həm Allahus Səməd öyrəndim, dedim,
İləm, vələm, yuləd öyrəndim, dedim,
Söylədim: yet dada Qəhhar kəlməsin.

Aşıq Nəcəf haqdan umur mərhəmət,
O, kərəm sahibi verəndi nüsrət.
Salmaram dilimdən: Allah, Məhəmməd,
Həsən, Hüseyn, Fatma, Heydər kəlməsin.

## ƏRZİM VAR

Gedən getmə, mən də gəlim yetirim,
Sən getdiyin Kərbəlaya ərzim var.
Düldülün sahibi, Qəmbər ağası,
Şiri Yəzdan Mürtəzaya ərzim var.

Sənətkartək gəzdim neçə elləri,
Tapdamadım çiçəkləri, gülləri.
Fərat kənarında düşən qolları,
Həzrət Abbas binəvaya ərzim var.

Nəcəf deyər, özüm qaldım hədəfdə,
Ha çalışdım açılmadı kələf də.
Arzum idi gedəm qalam Nəcəfdə,
Səcdəgahım, bir Xudaya ərzim var.

## AĞLASIN

Hacı Rəhim,[10] sən Əsədə deginən,
Bir mənim qeydimə qalsın, ağlasın.
Arif məclisində, alim yanında,
Hərdən bir yadına salsın, ağlasın.

Fələk qış eylədi güllü yazımı,
Eşidən ağlayar xoş avazımı.
Sinəsi sədəfli telli sazımı,
Ələsə deginən çalsın, ağlasın.

Kəpəz, Murov, Murğuz, Çalmalı dağı,
O yerlərdən keçir elin yığnağı.
Meçidlinin, Taxta yurdun yaylağı,
İllər boyu viran qalsın, ağlasın.

Özüm yaxındayam, könlüm uzaqda,
Fələk məni nakam qoydu bu vaxtda.
Gəncədə, Şəmkirdə, Tovuz, Qazaxda,
Yaralı "Dilqəmi" çalsın, ağlasın.

Köhlən at belində gəzdiyim dağlar,
Dumana, çiskinə dözdüyüm dağlar,
Nəcəfəm, əlimi üzdüyüm dağlar,
Laləzar çiçəyin solsun, ağlasın.

---

[10] Daşkəndli Hacı Rəhim

## VARIYDI

Yatmışdım qəflətdə gördüm Heydəri,
Cəmi xublar məclisində varıydı.
Özü Şiri-Yəzdan aləm sərvəri,
Mübarək dəstində Zülfüqarıydı.

Bir insan Heydərdi – Qəşəmşəm adı,
Darda qalanların odur fəryadı.
Şahi Mərdan ilə on bir övladı,
Qəmbər qabağında qulamkarıydı.

Biçarə Nəcəfin haqdır gümanı,
O pənc əl-əbadır dini, imanı.
İçlərində bir Kərbəla sultanı,
Əlil Fəzil Abbas əlamdarıydı.

## BİR XƏBƏR GƏTİR

Könül quşu, uç get Vətən elinə,
Mənə o ellərdən bir xəbər gətir.
Yetir əhvalımı nər igidlərə,
Qasımı, Ziyadı bir təhər gətir.

Görsən nələr çəkir çarəsiz ana,
Deginən: ömürü getdi bəd-fəna.
Düşmənin gülləsi dəyməsin mana,
Daşkənddən içməyə bir zəhər gətir.

Nəcəf bilmir, harda qaldı Gülüstan,
Şəmsəddin, Şəmistan, Mikayıl, Astan.
İsmayıl körpəydi, çıxmadı yasdan,
Xudam, sən üzünə xoş səhər gətir.

## YETİR

Kainatı, yeri, göyü yaradan,
Dərdlərə dərman ver, bir ayə yetir.
Ağbirçək analar fəğan eyləyir,
Bax aha, amana haraya yetir.

Dolanır tərsinə dünya gərdişi,
Pozulmaz olubdu millətin işi.
Mehracda, Hatifdə danışan kişi,
Özün kərəm eylə, buraya yetir.

Qurtar bu milləti əzabdan, dardan,
Nəcəf ayrı düşüb qohumdan, yardan.
Sidq ilə çağırram, – ya Şahi-Mərdan!
Bağışla yüz on dörd surəyə yetir.

## *DİVANİ*

### BAX

Ay insafsız, qatil olma,
Göz aç girdikara bax!
Yeri, göyü yaradana,
Bir pərvərdigara bax!
Zülm edirsən, qan tökürsən
Yerə, göyə sığışmaz.
Aldanıb dünya malına,
Olma üzü qara bax!

Yaranmış hamı öləcək,
Hərənin bir vaxtı var;
Sorğu-sual, polu-sirat,
Qabaqdadı, haqdı, var.
Haqqın özü divan edər,
Ədalət bir təxti var.
Seçərlər günahkarları,
Yandırarlar nara bax!

Axtarır həsrət gözlərim,
Qohum-qardaş hardadı.
Ala gözlü nazlı yarım,
İndi ahu-zardadı;
Yet dadıma, Şahı Mərdan,
Yazıq Nəcəf dardadı!
Kərəm eylə, tut dəstindən,
Sən çıxar kənara bax!



## AŞIQ TALIB
(1877-1979)

Aşıq Talıb Aşıq Ələsgərin sonbeşik oğludur. O, 1877-ci ildə Göyçə mahalının Ağkilsə kəndində dünyaya gəlmişdir.

Aşıq Talıb aşıqlıq sənətinə böyüyüb, boya-başa çatdığı evdə, atasının yanında yiyələnmişdir. O, Qurbanidən başlayaraq, dövrümüzə qədərki məşhur aşıqların yaradıcılığını, xalq dastanlarının, demək olar ki, hamsını hafizəsində cəmləmişdi. Aşıq Talıb yazı-pozu bilməsə də, çox kəskin hafizəsi var idi.

Aşıq Ələsgər ədəbi irsinin üzə çıxmasında Aşıq Talıbın xidməti əvəzsizdir. O, ayrı-ayrı şeirlərin deyilmə səbəbləri barədə maraqlı xatirələr söyləmişdir ki, bunlar böyük sənətkar haqqında yazıya alınmış dastan-rəvayətlərin əsasını təşkil edir.

Aşıq Talıb həm də bacarıqlı bir rəncbər idi. Yaz və yay aylarında əkin-biçinlə, digər təsərrüfat işləri ilə məşğul olurdu.

Aşıq Talıbın əldə edilmiş şeirləri onun şairlik qabiliyyətini göstərir. Çox təvəzökar olan bu el nəğməkarı məclislərdə öz şeirlərindən oxumaz, necə deyərlər, şairliyini gözə soxmağa çalışmazdı.

Aşıq Talıb 1979-cu ildə 102 yaşında vəfat etmişdir. Aşıq Talıbın folklor deyimlərə aid aşağıdakı şeirləri vardır.

## *QOŞMALAR*

### AYRIM QIZI

Bəlkə ilahidən belədi yazı,
Eşit mətləbimi, qan, Ayrım qızı!
Qəlbim sınmağına olma irazı,
Mən yanan odlara yan, Ayrım qızı!

Nə durmusan sərpdə, enginən düzə,
Qənşərdi, qorxuram gələsən gözə.
Sən mana "çor" desən, layiqdi bizə,
Mən sənə deyərəm "can", Ayrım qızı!

Talıbam, Məcnuntək salma çöllərə,
Dərdim dastan olar, düşər dillərə.
İrazılaş, gedək bizim ellərə,
Sən xanım ol, mən də xan, Ayrım qızı!

### BAŞINA DÖNDÜYÜM

Yığınan başına gözəl dəstəsin,
Yavaş-yavaş gəl, başına döndüyüm.
Qaldırdın ayağa illər xəstəsin,
Ver əlimə əl, başına döndüyüm.

Gözəllər cəm olub solu sağına,
Könül çox müştaqdı ağ buxağına.
Ala gözlərinə, gül yanağına,
Xub yaraşır tel, başına döndüyüm.

Talıb deyər, gedək bizim ellərə,
Seyrə çıxaq çəmənlərə, çöllərə.
Qurban olum şirin-şirin dillərə,
Söylə, danış, gül, başına döndüyüm.

## GÖRMÜRƏM

Kəpəz, Murov, Muşov, Murğuz, Sarınər...
Nə müddətdi, o dağları görmürəm.
Daşgələn, Qaraxaç, Yalyurd baxarı
Ağır elli yaylaqları görmürəm.

Gədikləri, bələnləri aşardım,
Cığırların bəzisini çaşardım,
Görüşüb, öpüşüb, qucaqlaşardım,
Həsrətiyəm, o dostları görmürəm.

Bir zaman ellərdə gəzdim sərəfraz,
Dilimdə nəğmələr, sinəm üstə saz,
Hərlənirdi dörd yanımda quba-qaz,
Yaşılbaşlı sonaları görmürəm.

Çağırram, haraya yetişmir qardaş,
Bu dərdə dözürəm, mən bağırı daş.
Ürəkdən yanıram, görünmür ataş,
Keyvir sulu bulaqları görmürəm.

Talıbam, gəzirəm dəstimdə çəlik,
Can ağrısı fələk verib üstəlik.
Öz-özümü girləyirəm hələlik,
Gözüm kəsmir, uzaqları görmürəm.

## GÜLƏ-GÜLƏ

Yenə könül mindi eşqin atına,
Göründü gözümə yar gülə-gülə.
Düzübdü buxağa nərgiz, bənövşə,
Tutubdu dəstində nar gülə-gülə.

Camalını gördüm, ay təzələndi,
Çeşmələr duruldu, çay təzələndi,
Zimistan addadı, yay təzələndi,
Gətirdi bağçalar bar gülə-gülə.

Talıbam, yolunda keçmişəm candan,
O mana artıqdı sultandan, xandan.
Mənim meylim dönməz belə bir candan,
Nə qədər ki ömrüm var gülə-gülə.

## XOŞ GƏLİB

Minnətdarlığımı bildirirəm mən
Bizim gələn qonaqlara, xoş gəlib!
Gül gülü çağırır, çiçək çiçəyi,
Könlümdəki nobahara xoş gəlib!

Yön çevirək bizim ulu dağlara,
Qoyunlu, quzulu, göy yaylaqlara.
Dişləri göynədən buz bulaqlara,
Qüzeydə görünən qara xoş gəlib!

Talıbam, qonağa hörmətimiz var,
Hər zaman dostlarnan ülfətimiz var,
Açıq süfrə, şirin nemətimiz var,
Kim gəlirsə bu diyara, xoş gəlib!

## QADAN ALIM

A bimürvət, vədə verdin, gəlmədin,
Düzüldü yollara köç, qadan alım.
İşarədən dərdi-dilim bilmədin,
Əgər ki, sərrafsan, seç, qadan alım.

Huş dağılıb, ağıl gedibdi sərdən,
Soruş əhvalımı görəndə hərdən.
Günahım olsa da, salma nəzərdən,
Mənim təqsirimdən keç, qadan alım.

İnsafdımı, dost dostundan yad gedə,
Zülm olar, cəsəd qala, can gedə.
Layıq deyil sana mal qurban gedə,
Talıb qurban verir baş, qadan alım.

## TAPMIRAM

Qəza kəməndinə olubdu düçar,
Axtarıram hər bir yanı, tapmıram.
Ürəyimdə sağalmayan yaram var,
Nə həkim var, nə loğmanı tapmıram.

Qara keçdi qışı, bəd gəldi yazı,
Necoldu söhbəti, necoldu sazı!
Hamıya xoş gələn sözü, avazı,
Qumru kimi xoş lisanı tapmıram.

Talıbam, dağılıb şövkətim, şanım,
İşləmir mətahım, yoxdu meydanım.
Ölüb Ələsgərim, itib İmanım,
Axtarıram bir cavanı, tapmıram.

## YOL VER, DAĞLAR, KÖNÜL VƏTƏN ARZULAR

Bir yanım dumandı, bir yanım qardı,
Yol ver, dağlar, könül Vətən arzular.
Bir yanım gədikdi, bir yanım qardı,
Yol ver, dağlar, könül Vətən arzular.

Bəd ürüzgar məni bəndə salıbdı,
Qara qayğı ürəyimi alıbdı.
Qohum-qardaş gözü yolda qalıbdı,
Yol ver, dağlar, könül Vətən arzular.

Talıb qürbət eldə düşdü zindana,
Boran qeyzə gəlib, səyriyir qana.
Sizi and verirəm Şahi-Mərdana,
Yol ver, dağlar, könül Vətən arzular.

## *GƏRAYLILAR*

### BU DAĞLARDA

Səksən iki olub yaşım
Bu dağlarda, bu dağlarda.
Ağarıb saqqalım, başım
Bu dağlarda, bu dağlarda.

Leyli gəzibdir bu dağı,
Məskən edib göy yaylağı.
Məcnun gözləyib bulağı
Bu dağlarda, bu dağlarda.

Şirin burda mətləb aldı,
Eşqin dəryasına daldı.
Yazıq Fərhad külüng çaldı
Bu dağlarda, bu dağlarda.

Bir qoy deyim, ərzimi qan;
Bulamadı dərdə dərman.
Nalə çəkdi qəmli Sənan
Bu dağlarda, bu dağlarda.

Sinəsində dərd ilə qəm,
Tale ona verdi sitəm,
Əsli deyin yandı Kərəm,
Bu dağlarda, bu dağlarda.

Hər yanı tutubdu səsi,
Düşməndən alıb qisası,
Qalıb Koroğlu nərəsi
Bu dağlarda, bu dağlarda.

İgiddi Gəncə mahalı;
Qatır Məmməd, Nağı, Alı...
Çox olubdu qalmağalı
Bu dağlarda, bu dağlarda.

Neçə şair yola salıb,
Sual verib, cavab alıb,
Səməd Vurğun qonaq qalıb
Bu dağlarda, bu dağlarda.

Talıb, bu dünyadı fanı;
Dünyaya gələnlər hanı?!
Ələsgər deyib dastanı
Bu dağlarda, bu dağlarda.

## ÜSTÜNDƏN

Sərt havada yolum düşdü
Yenə bu dağlar üstündən.
Xəzan vurub, güllər solub,
Tökülübdü xar üstündən.

Görsənir payızın qarı,
Yığılır bağların barı.
El tərk edib yaylaqları,
Köçüb bulaqlar üstündən.

Dağda qalıb keçi, təkə,
Kəklik gəzir səkə-səkə.
Birdən ovçu gəldi bəlkə,
Çəhlim düşüb qar üstündən.

Talıb, axtardığın hanı?
Boş qalıb mərdin meydanı.
Müxənnət tutub dünyanı,
Açıbdı bazar üstündən.

## *TƏCNİSLƏR*

## AY AĞASINA

Ağa nökərini yaxşı saxlasa,
Nökər can yandırar ay ağasına.
Ürəkdə təpər çox, dizdə taqət yox,
Az qalır, qalxanda ayağa sına.

Ha çağırram, cavab vermir ayarım,
Deyən məni gözdən salıb a yarım.
Saxlamışam namus, qeyrət, ay arım,
Salmaram heç yerdə, ay ağa, sına.

Bahar olcaq dağda bitər lala hey,
Qumru dillər qismət oldu lala hey.
Mail olub gözlərinə Lala, hey,
Talıb dəxil düşüb ay ağasına.

## SƏN DƏ YAN

Naqafildən bir od saldın canıma,
Alışıram, gəl, oduma sən də yan.
Sənin sirrin ürəyimdə əyandı,
Mənim sirrim olarmı səndə əyan?

Tifildi, ağlayır, şir gəzir, alı,
Əlində xədəngi, şir gəzir Alı.
Mən görrəm, bu yanda şir gəzir, alı,
Sən görmürsən, qoy mən atım, sən dayan.

Aşıq gərək bir dinləyə, bir dinə,
Neçə şeylər vacib olub bir dinə.
Aşıq Talıb, inanıbsan bir dinə,
Möhkəm saxla, dolanmaynan sən də yan.

## *DİVANİLƏR*

### DURUR

Həcvü hədyan nə lazımdır,
Qarşıda insan durur;
Həqiqətə aç zəbanın,
Arif var, qanan durur.
Əzəl gündən sığınmışam
Haqqın mən bir adına;
Batində verib dərsimi,
Görünmür, pünhan durur.

Bu dünyada mənəm deyən
Rüstəmi-Zal hanı?!
Cəm eylədi Şəhri-Zəri,
Ol Dal ibni-Dal hanı?!

Şəddat hanı, Nəmrud hanı?!
Fironu Salsal hanı?!
Onlar qalmadı dünyada,
Aləmi quran durur.

Aşıq Talıb, sidqi-dilnən
Çağır şahlar şahını;
Müşkül işi həll eyləyən
Mərdlərin pənahını.
Zaval yoxdu o şəxsə ki,
Tutub haqq pənahını;
Əyri gedən kimsələrə
Nar durur, niran durur.

## MƏNİM

Dar günümdə dadıma yet,
Ya Şahi-Mərdan mənim;
Beş-pəncaliəba düz,
On iki imam mənim;
Salıb şəhadət barmağın
Xeybər qoparan mənim;
Əntər bölən, əjdər yaran,
Odu insan pənahı;
Üç yüz altmış büt sındırıb
Eyləyən viran mənim.

Beş kimsənə olmasaydı,
Dünya tutmazdı qərar;
Cəbrailə ustad oldu
Su üstündə aşikar;
Musaya kəlmə öyrətdi
Heydəri-düldülsüvar;

Mehracda təam eylədi
Rəsulnan barabar;
Əl uzadıb gül dəstinnən
Almanı alan mənim.

Dolanıram bu dünyanı,
Gəzirəm əfsanə mən;
Yüz söyləsəm həqiqətdən,
Çatmaram imana mən;
Sidqi-dilnən sığınmışam
Ol Şahi-mərdana mən;
Atı Düldül, qulu Qənbər
Ol şiri-yəzdan mənim.

## *MÜXƏMMƏSLƏR*

### DOLANIR

Bugünkü məclisimdə
Gəlib bir cavan dolanır;
Görəni eşqə salıb,
Eyləyib heyran dolanır;
Adını xəbər aldım,
Dedilər "Reyhan" dolanır;
Hər kimə üz çevirsə,
Qəlbində şeytan dolanır;
Ahılı, cahılı saymır,
Onundu meydan, dolanır.

Belində gümüş kəmər,
Qolunda zər düyməsi var;
Tərpənəndə zey-zey edir,
Qomrovların zil səsi var.
Yazıya pozu yoxdu,

Yaxşı-yaman bir kəsi var.
Hər kimə “bəli” desə,
Çox bahalı müjdəsi var;
Bu mahalda ona layiq
Yoxdu bir oğlan, dolanır.

Talıb deyər, gözəl çoxdu,
Bu cür canan görməmişəm;
Eldən elə çox gəzmişəm,
Belə bir can görməmişəm;
Gözləri canlar alan,
Qaşı kaman görməmişəm;
Bu ki gözəllər şahıdı,
Özgə sultan görməmişəm;
Sanasan ki, ərş üzündən
Enibdi qılman, dolanır.

## GÖRMÜŞƏM

Bu günkü səfərimdə
Gözəl bir insan görmüşəm;
Gözləri canlar alır,
Qəmzəsində qan görmüşəm;
Sanki Misir bazarında
Yusifi-Kənan görmüşəm;
Kamalı camalından göyçək,
Züleyxanişan görmüşəm.

Bilirəm, Əslidən ötrü
Oda düşdü, yandı Kərəm;
Mən gördüm, dözə bilmədim,
Bəs necə dayandı Kərəm!?

Dəhanından atəş qalxdı,
Alışdı, odlandı Kərəm;
Bu gün mən də öz qəlbimi
Alışıb yanan görmüşəm.

İşıq salıbdı hər yana
Aynaqabaq aydı gözəl;
Bəşərə bənzətmək olmaz,
Mələklərə taydı gözəl?
Şükür haqqın kəraminə,
Kimə yazan paydı gözəl?
Ləblərinin busəsini
Talıba dərman görmüşəm.



## AŞIQ MEHDİ
(1878-1968)
**(şəkil şərtidir)**

Aşıq Mehdi təxminən, 1878-ci ildə Göyçə mahalının Qanlı kəndində anadan olmuşdur. Gənc yaşlarında aşıqlıq sənətinə həvəs göstərən Mehdi Aşıq Alının şəyirdi olan Aşıq Qulunun yanında bir il qalmış, kamil bir sənətkar kimi yertişmişdir.

Aşıq Mehdi hafizəsində minlərlə şeir, onlarla dastan cəm eləmiş zəngin biliyə malik olan aşıqlarımızdan biri olmuşdur.

Şeirlərindən əldə edilən nümunələr Aşıq Mehdinin həm də şair olduğunu göstərir. Təəssüf ki, onun yaratdıqları müxtəlif şəkilli sənət incilərinin böyük bir qismi itib-batmışdır.

Ömrünün son illərində Aşıq Mehdinin gözləri tutulmuş, dünya işığına həsrət qalmışdır. O, 1968-ci ildə, 90 yaşında doğma kəndi Qanlıda vəfat eləmiş və orada torpağa tapşırılmışdır.

## *QOŞMALAR*

### ÇƏKMƏYƏ

İnsan xəlq olanda yüzə yetirə,
Bu dünyada intizarı çəkməyə.
Yükləyə qatırı ləlü gövhərdən,
Sarvan olub, qəm qatarı çəkməyə.

Yaşaya dünyada xoş iqbalınan,
Övladınan, dövlətinən, malınan.
Qaysava, qayqanaq, yağü balınan,
Xəstə olub, dərd-azarı çəkməyə.

Mehdiyəm, çağırram: "Ya Şahi-Heydər!"
Həmişə dilimdə eylərəm əzbər.
Sin içində, bəlkə, ola irəhbər,
Canım cəhənnəmdə narı çəkməyə.

### DƏYMƏMİŞ

Bağbanlar bağ bəslər, xoryadlar dərər,
Həsrət bağban əli nara dəyməmiş.
Üç ay zimistanda gülün qəhrini
Bülbül həsrət çəkər xara dəyməmiş.

Məcnun "Leyli", – deyib, bu dağı gəzər,
Xəstə meyl eyləyər, budağı gəzər.
Nakamil bostançı tağından üzər,
Bostanda şamama, xıra dəyməmiş.

Çoxunun qəlbindən keçir xocalıq,
Mehdinin qəlbini əyir qocalıq.
Arada qalıbdı bircə gecəlik,
Astaca aralan, ara dəyməmiş.

## GƏRƏK

Yük bağlayıb bir diyara gedəndə,
Mətahın satmağa bir bazar gərək.
Naşı sərraf qiymətinə yetirməz,
Gövhəri seçməyə xiridar gərək.

Nə uyma qəflətə, yuxuda yatma,
Ov keçib bərədən, oxunu atma.
Hər yetənə sən özünü dost tutma,
Dostun arasında düz ilqar gərək.

Mehdi, qocalırsan, vaxtın keçəcək,
Əcəl şərbətini hamı içəcək,
Bu dünya fanıdı, gələn keçəcək,
Ustaddan şəyirdə yadigar gərək.

## İÇİNDƏ

Aldanma dünyanın simü zərinə,
İnsan ol bu qədər insan içində.
Çalış səndən sonra təmiz ad qazan,
Günəş kimi parla duman içində.

Həmişə yaxşı ol, yamandan seçil,
Zülmə kəfən olma, haqqa don biçil,
Özündən böyüklər görəndə, kiçil,
Qətrə bil özünü ümman içində.

Miskin Mehdi, meylin yara bağla sən,
Məhəbbət arzunu yara bağla sən,
Dosta yara vurma, yara bağla sən,
Ömrü bada vermə güman içində.

## OLMAZ, OLMAZ

Mərifət insanın özündə gərək,
Kənardan deməklə ay olmaz, olmaz.
Binadan olmasa, kökdən olmasa,
Hər axar bulaqlar çay olmaz, olmaz.

Hərənin yüz fikri, min xəyalı var,
Bir kimsə yerində tutarmı qərar!?
Namərdin gülləsi qəlbində olar,
Mərdin ömrü-günü zay olmaz, olmaz.

Mehdi az görmədi dünyada nə var;
Laçına tay olmaz yapalaq, nə sar.
İnsandan insana nəsihət olar,
Ağıldan ağıla pay olmaz, olmaz.

## VƏDƏSİNDƏ

Cəhd elə evindən çıxma kənara,
Yolların dumanlı, toz vədəsində.
Axtarma, çillədə çiyələk olmaz,
Hər şeyi dərərlər öz vədəsində.

Sevmə gəl dünyada vəfasız yarı,
Düz çıxmaz ilqarı, nə etibarı.
Qardan qala yapsan, buzdan hasarı,
Əriyər, tez gedər yaz vədəsində.

Mehdi, bu sözlərin yadigar qalar,
Dünyada qəhərdən daş da qocalar.
Hər sözü yerində demək düz olar,
Kəsərli olmazmı söz vədəsində!?

## *DİVANİ*

## GÖRMƏDİM

Dünya, sənin gərdişində
Doğru canan görmədim;
Can deyib, can eşidən
Canı yanan görmədim.
Bivəfaya can deməkdən
Canımda can qalmadı,
Əməyim zayə getdi,
Doğru insan görmədim.

Söyüddən sandal olmaz,
Bəsləsən, əfsanadı;
Nakəsdən mömin olmaz,
Qibləsi meyxanadı;
Məkəsdən dövlət olmaz,
Mənzil biyabanadı;
Kəlbdən sürü bağlana,
Qurddan çoban görmədim.

Gəl, biçara Aşıq Mehdi,
Neylərsən dünya sirrin;
Sən ki qəvvas deyilsən,
Axtarma dayaz, dərin;
Nakəsdə mürvət olmaz,
Çağır mərdlərin pirin;
Başı ərşə bülənd olsa,
Gədadan xan görmədim.



## ZODLU AŞIQ AĞAYAR
(1880 – 1978)

Zodlu Ağayar (Ağayar Xəlil oğlu Xəlilov) 1880-ci ildə Göyçə mahalının Zod kəndində anadan olub. O, Aşıq Ələsgərin son şəyird-lərindən olaraq onun bütün yaradı-cılığını mənimsəyib. Özünəməxsus oxu tərzi və şirin danışığı ilə seçilən Ağayar Xəlil oğlu dastanlarımızın bilicisi və mahir ifaçısı kimi də böyük şöhrət qazanıb.

1964-cü ildə oğlu Hüseyn vəfat etdikdən sonra o, bir daha əlinə saz götürməyib. Sinəsi söz kürəsi olan Aşıq Ağayar özü də şeirlər yazıb. Onun üç şəyirdi olub: Qən-bər, Şahkərəm və Pənah.

Zodlu Ağayar 1978-ci ildə vəfat edib.

Aşıq Ağayarın da şeirləri olub, lakin əldə etdiyimiz yeganə şeirini bu antologiyada təqdim etmək məcburiyyə-tində qaldıq.

## *QOŞMA*

## SİNƏMDƏ GETDİ

Aşıq Ələsgərin söz dəryasının,
Ləl gövhər qiyməti sinəmdə getdi.
Ölçüyə sığışmaz, çəkiyə gəlməz,
Möhnəti, hikməti sinəmdə getdi.

Bir neçə aşığa mən oldum ustad,
Qəmli könülləri çox eylədim şad,
Görüm səni olnan, ey dünya, bərbad,
Elin məhəbbəti sinəmdə getdi.

Həmişə söylənir dillərdə adım,
Daha qocalmışam, yoxdu imdadım,
Mən ölsəm ağlayar qohumum, yadım,
Yurdumun ülfəti sinəmdə getdi.

Aşıq Ağayaram, mən sinədəftər,
Ötmədi günlərim, mənasız, hədər,
Novrəstə İmannan çox etdim səfər,
Onun sədaqəti sinəmdə getdi.



# XƏSTƏ BAYRAMƏLİ
(1898-1952)

Xəstə Bayraməli Göyçə mahalının Hüseynquluağalı kəndində (indiki Nərimanlı kəndi), təxminən 1898-ci ildə anadan olmuşdur.

Yeddi yaşında atadan yetim qalan Bayraməli bir müddət varlıların qapısında nökərlik, muzdurluq eləməyə məcbur olmuşdur.

Bayraməli gənc yaşlarından aşıq şeiri səpkisində şeirlər qoşmağa başlamışdır. Bəzi əsərlərində "xəstə" sözünü adından əvvəl işlədən Bayraməli əslində, xəstə deyildi, bu sözü "dərdli" mənasında işlətmişdir.

Kənddə əkin-biçinlə məşğul olan bu el şairi Böyük Vətən müharibəsi illərində döyüşən orduda xidmət eləmişdir.

Xəstə Bayraməli 1952-ci ildə doğma kəndində vəfat etmişdir.

## *QOŞMALAR*

### AĞLAYIB

Bir cavan ölübdü qürbət diyarda,
Vətənin torpağı, daşı ağlayıb.
Bir bağ saralıbdı bahar çağında,
Aqil nalə çəkib, naşı ağlayıb.

Nə ucuzmuş bu dünyanın vəfası,
Bir ömrün yoxluğu, bir elin yası.
Dumandan geyinib matəm libası,
Qocaman dağların başı ağlayıb.

Atalıq niyyəti yetməmiş sona,
Üç körpə taleyi yaxılıb şama.
Kişnəyib buludlar, tutulub səma,
Tökülüb gözünün yaşı, ağlayıb.

Bayraməli, sən də "igidəm", – deyə,
Çox da bel bağlama namərd fələyə,
"Mənəm" – deyənləri salıb lərzəyə,
Çoxlarının qələm qaşı ağlayıb.

### DARIXDIM

Sən mənim pöhrəmsən ilk baharımda,
Zövqünü yaşatdın arzularımda.
Şimşəklər sayrışdı ümmanlarımda,
Çıxışın yadıma düşdü, darıxdım.

Ötən günlərimiz keçildi bir-bir,
Vüsal çağlarımız seçildi bir-bir.
Məhəbbət vərəqim açıldı bir-bir,
Naxışın yadıma düşdü, darıxdım.

Qayğılar gölündə yordum özümü,
Sənin xəyalından sordum özümü,
Yenə gözlərində gördüm özümü,
Baxışın yadıma düşdü, darıxdım.

Gecələr dayanıb yorğun, ahəstə,
Doğma balamızın beşiyi üstə,
Öz ana laylanı ilkin həvəsdə
Oxuşun yadıma düşdü, darıxdım.

Bayraməli gəzər Məcnunsayağı,
Mətanətdir yaman günün dayağı.
Sinəmdə qaynadı eşqin bulağı,
Axışın yadıma düşdü, darıxdım.

## KÖNÜL

İşində sayıq ol, sözündə kamil,
Ariflər içində söyülmə, könül!
Qoy səni qananlar tərif eyləsin,
Nadanlar dilində öyülmə, könül!

Bəxş etsə təbibə neçə min barat,
Gərək müxənnətə bulmasın nicat.
Nə çox zalım olub kimsəni ağlat,
Nə çox zəlil olub döyülmə, könül!

Dünya arsızındı, hicranı tərgi,
Ya şah ol, ya qul ol, tərg elə fərqi.
Bayraməli bir qonaqdı gedərgi,
Namərd qabağında əyilmə, könül!

## QƏRİBLİK

Bir söz sərrafıydım bu zamanənin,
Qəflətən qarşıma çıxdı qəriblik.
Ana yurdu qucaqlamaq istədim,
Qəlbimi pünhanca sıxdı qəriblik.

O gündən ki, bir gözələ vuruldum,
Xəzan vurdu, budağımdan qırıldım.
Mən vüsalı haraylayıb yoruldum,
Bu minvaldan çox uzaqdı qəriblik.

Oyananda müxənnətin səsindən,
Ürəyim bulandı qiyafəsindən.
Küskün taleyimin pəncərəsindən
Gizlicə boylanıb baxdı qəriblik.

Xəyal məhvərində dumanlı sərim,
Yüz dəfə atmışam, yek verib zərim.
Çox da oxunmasın həyat dəftərim,
Qəm sətirli bir varaqdı qəriblik.

Bayraməli düşüb min qilu-qala,
Payimaldı əl çatmayan vüsala.
Boylandı, durnalar qayıdan yola,
Həsrət dənizimdə axdı qəriblik.

## MƏN SƏNİ GÖRDÜM

Əzəldən bağçasız bir bahar idim,
Dünyaya sığmayan intizar idim,
Məcnunlar evindən çox kənar idim,
Uydum bu fəryada, mən səni gördüm.

İnsana təsadüf gələr qəflətən,
Ağlayar qəflətən, gülər qəflətən.
Aldı yer üzünü sular qəflətən,
Bu sonsuz dəryada mən səni gördüm.

İndi keçməsə də ömür nəşəli,
Eşqimizin qoy sönməsin məşəli.
Bayraməli deyər, eşqə düşəli,
Hər gecə röyada mən səni gördüm.

## NİŞANƏDİ

Hüsnün tamaşadı, ay mina gərdən,
Camalın şövqünə ay nişanədi.
Aşıqsız, çalğısız, meysiz, məzəsiz,
Sən olan məclisə toy nişanədi.

Mətləbim şirindi dillərin kimi,
Təbim çox nazikdi əllərin kimi.
Könlüm pərişandı tellərin kimi,
Qaşların tağına yay nişanədi.

Bayraməli dərdi pünhanda çəkər,
Hökmünlə qapında işlərəm nökər.
İnsafın, mürvətin yoxdumu məgər?
Gözlərim yaşına çay nişanədi!

## OXUMAQLA BÜLBÜL OLMAZ SƏRÇƏLƏR

Oxumaqla bülbül olmaz sərçələr,
Budaq kölgəsində daldalansa da.
Aslanın öz adı, öz hünəri var,
Tülkülər yekəlib lovğalansa da.

Yüz də qürrələnsə, tox dura bilməz,
Elə gərdən çəkib, şax dura bilməz,
İtirər ağlını, çox dura bilməz,
Qartal qayasına qarğa qonsa da.

Bayraməli, batma qəm dəryasında,
Gədanı görsən də bəy libasında.
Hər kəsin adı var el arasında,
Nadanlar arifi naşı sansa da.

## OLMUŞAM

Mən elə kimsəyəm aşiqə bənzər,
Könlüm əhli-haldı, dilim dərdi-sər,
Səndən ayrılalı, a nazlı dilbər,
Sanki səmaları dansız olmuşam.

Sədaqətin töhfəsidir bu halım,
Can evində səninlədir vüsalım,
Varlığınla tamamlanıb xəyalım,
Ümmanlar içində sonsuz olmuşam.

Bir nəğmədi ürəyimin hər simi,
Ellər məclisində qurur kürsümü.
Gəlsin deyim Məcnunlara dərsimi,
Mən eşqimdə çox amansız olmuşam.

Bayraməli yaranıbdı dözümlə,
Surətini gəzdirirəm gözümlə.
Məclisləri bəzəyərkən sözümlə,
Həsrətindən pasibansız olmuşam.

## ŞİRİNDİR

Eşit sözlərimi, əziz qardaşım:
Çarəsiz xəstəyə dərman şirindir.
Nə şöhrət istərəm, nə var, nə dövlət,
Səadət nəğməli bir nan şirindir.

Çoxdur mərd igidi, nazlı afəti,
Baş tutar şairi, sevir sənəti.
Tükənməz dastanı, sözü, söhbəti,
Göyçənin ləhcəsi yaman şirindir.

Xəyalım enməmiş asimanından,
Doyunca içərəm namərd qanından,
Xəstə Bayraməli keçər canından,
Gəl bizim ellərə, mehman şirindir.

## YAXŞIDIR

Can qurban eyləsən, layiqdir, yenə
O gözəl qədrini bilsə, yaxşıdır.
Dodaqları qönçə, yanağı lala,
Hər gün sənə qonaq gəlsə, yaxşıdır.

Bir mərmər sinəli, bir mina gərdən,
Sənlə ülfət qıla, otura hərdən,
Küsüb-barışmaqdan, nazdan, qəmzədən,
Şirin-şirin deyib-gülsə yaxşıdır.

Bivəfa əlində tez qocalınca,
Qədirbilməz ümidinə qalınca,
Bədəsil gözələ urcah olunca,
Xəstə Bayraməli ölsə, yaxşıdır.

## YENƏ SƏN OLDUN

Əhsən qeyrətinə, anam gəlini,
Dar gündə vəfalı yenə sən oldun!
Son addımda mənim məğrur könlümün
Məqsədi, amalı yenə sən oldun!

Adını könlündə bəsləyən də mən,
Hərdən inciyən də, səsləyən də mən.
Bu eşqin yolunda büdrəyən də mən,
Əhdimin kamalı yenə sən oldun!

Sənin varlığında adi həyatam,
Sonsuzluq içində bir kainatam.
Yuxuma girmişdi müqəddəs atam,
Onun ilk sualı yenə sən oldun!

Həsrəti var səndən uzaq könlümün,
Qayğılar evində qonaq könlümün,
Zülfün zəncirinə dustaq könlümün
Arzusu, xəyalı yenə sən oldun!

Kim versə ömrünü bir təmiz ada,
Məhəbbət yolunda qalmaz piyada.
Dedin:-Bayraməli təkdi dünyada,
Bəxtimin iqbalı yenə sən oldun!

## *GƏRAYLILAR*

## DAĞLAR

Bahar fəsli əskilməyir
Güneylərdən lala, dağlar.
Kaş ki, elə bu gözəllik
Səndə hər vaxt qala, dağlar.

Dərələrdən keçəm bir-bir,
Gəzəm, söhbət açam bir-bir,
Çeşmələrdən içəm bir-bir,
Əlimdə piyalə, dağlar.

Yenə nə müddətdən bəri
Dolandıqca bu yerləri,
Ürək istər, Ələsgəri
Səndən xəbər ala, dağlar.

Kəsmə könlümdən gümanı,
Qurbanın, Nəcəfin hanı!?
Vətəndən Novrəs İmanı
Təkmi saldın yola, dağlar!?

Bayraməli deyər gerçək,
Bir dərmandı hər cür çiçək.
Vəfan varsa, gəl əncam çək
Bu pərişan hala, dağlar.

# YAR AŞİQİ
# HƏSRƏT ÇƏKƏR

Yar aşiqi həsrət çəkər,
Pərvanələr oda yansa.
Məcnun olar dəli könlüm,
Leyli deyib, dağ dolansa.

Namərd keçsə ixtiyara,
Tərlan möhtac olar sara.
Mərd igid çəkilər dara,
Gədə durub lovğalansa.

Möhtac olsam tülkülərə,
İstərəm, yem olum şirə.
Bayraməli dönər Kürə,
Şair təbi dalğalansa.

## *TƏCNİSLƏR*

## BİRİSİ NƏ

Aşiqlərdə gərək üç şey cəm olsun,
Birsi sazdı, birsi sözdü, birsi nə?
Oğurluq etməsin şairəm deyən,
Şeir yazsın sinəsindən birsinə.

Bağban olub, bağça sən əgər əksən,
Bəsləyəsən, becərəsən gərək sən.
Yaxşı dosta yaman gündə gərəksən,
Qiymət qoysan bu sözlərin birsinə.

Bayraməli anlamazı nə danlar?
Hərcayı nə eşidər, nə də anlar!
Dinə bilməz meydanımda nadanlar,
Yer axtarar hər görəndə bir sinə.

## SAYASAN

Mərd igidlər nə nişanda bəllidi,
Arifsənsə, gərək doğru sayasan.
Səxavətdə, şücaətdə ad ala,
Mən söyləyim, sən astaca say asan.

Halalsansa, vermə ömrün nə bada,
Nə şərab çək, al əlinə nə badə,
Pis adama yön çevirmə nəbadə,
Binamusu, nanəcibi sayasan.

Bayraməli, əzbər eylə, oxu nan,
Qəm ləşkəri dəldi bağrım oxunan.
Ey taleyi ilahidən oxunan,
Gedərgisən, günlərini sayasan.

## *MÜXƏMMƏS*

## ELƏDİ

Ay ağalar, bu ilki qış
Nə bekar adət elədi.
Azar düşdü mal-qoyuna,
Yaman qiyamət elədi.
Soraq gəldi hər tərəfdən,
Yetən şikayət elədi.
Nə yaxşı ki, Şahi-Mərdan
Bizə mərhəmət elədi.

Dabaq olmuş bir öküzün
Qıldım tədbirini yazdan.
Söylədilər səd afərin,
Gəlib-gedən bir ağızdan.
Bircə cüt danam varıydı,
Rəhmətə getdi payızdan.
Nə məndən ələf istədi,
Nə də ki zəhmət elədi.

Kasıb, varlı, hər ocaqda
Ət qazanı aşdı, daşdı;
Olan qonşu olmayana
Ucuz qiymətə yollaşdı.
Kimi də səbrini basıb,
Quran-kitaba sallaşdı;
Yön çevirdi mollalara,
Yalvardı, minnət elədi.

Kimi başladı fəryada,
Kimi bəxtindən küsməyə;
Zülm elədi bu naxoşluq
Gah öküzə, gah inəyə.

Kimiyə tamah güc gəldi,
Qıymadı payız kəsməyə;
Arıq saldı, murdar oldu,
Başına töhmət elədi.

Nəbiynən Qalayçı Söyün
Saldılar gönlərin bəhsin;
Məhəmmədlə də kömıəkli
Sürüdük birdən ikisin;
Üstündən yaxşısın saldıq,
Altından döşədik pisin;
Alıcılar bircə yerdən
Götürdü, qiymət elədi.

El arandan dağa köçdü,
Qış ötüşüb, yaz düşəndə;
Yenə şənləndi obalar,
Karvan çəkib, biz düşəndə.
Hər yaylaqda, hər məclisdə,
Bir mahalda söz düşəndə,
Bayraməli bu əhvalı
Danışdı, söhbət elədi.



# ŞAİR AQİL
(1900 – 1943)

Şair Aqil (Qafarov Niftalı Qafar oğlu) Göyçə mahalının Ağbulaq kəndində anadan olmuşdur. O, ilk təhsilini həmkəndlisi olan Məşədi Molla Əlinin açdığı mollaxanada almışdır.

Sovet hakimiyyəti illərində Leninakan (Gümrü) Pedaqoji texnikumunu bitirən Niftalı 1923-cü ildə öz kəndlərində müəllimlik fəaliyyətinə başlamışdır. O, ailəsi ilə birlikdə 1940-cı ildə Gədəbəyin İvanovka kəndinə köçmüşdür.

Böyük Vətən müharibəsi illərində əsgəri xidmətə çağrılan Niftalı bir daha geri qayıtmamışdır.

Niftalı gənc yaşlarında şeir yazmağa başlamış və "Aqil" təxəllüsünü qəbul etmişdir. Onun müxtəlif şəkildə şeirləri aşıqların repertuarında özünə yer tutmuşdur. Bu kitabda oxuculara təqdim etdiyimiz şeirlərini onun yaxın qohumu olan Aşıq Məhərrəm Hacıyevin hafizəsindən qələmə almışıq.

## *QOŞMALAR*

### YARAŞIR

Bəzənib, naz ilə seyrə varanda,
Zərif qədəminə yollar yaraşır.
Qönçə dəhanına, ləli-ləbinə
Danışanda şirin dillər yaraşır.

Hərdən-hərdən biz tərəfə gəzəndə,
Qaş oynadıb, gözlərini süzəndə,
Şanə alıb tellərini düzəndə,
Ay qabağa siyah tellər yaraşır.

Yüz il ömrün ola, mən yazam dəftər,
Vəsfin tamam olmaz, ay mələk mənzər.
Söz tamama yetir, budur müxtəsər,
Sənə Aqil kimi qullar yaraşır.

### OYNASIN

Toya xoş gəlmisiz, toy adamları,
İzin verin deyim, kimlər oynasın.
Qoşa xallı, yüz xəyallı filankəs,
Ay qabaqda siyah tellər oynasın.

Geyimi əlvandı, kəlağay qara,
İnsafdımı, həsrət baxsın yar yara!?
"Şalako" çalınsın, bir də "Tamara",
Cərgə dursun, xub gözəllər oynasın.

Təbiət çox gözəl yaradıb onu,
Əyninə yaraşır libası, donu.
Dəstə-dəstə şabaş verin çirvonu,
Havalansın, nazik əllər oynasın.

Onu görcək şövqüm artır dəmadəm,
Yanağı qızılgül, üstündə şəbnəm.
Vəsfini yazmağa fəxr edir qələm,
Aqilin dəstində dəftər oynasın.

## ÜÇ SÖZÜM VAR, GƏRƏK DOSTA DEYƏSƏN

Üç sözüm var, gərək dosta deyəsən,
Birin oxu, birin öyrən, birin yaz.
Aşiq olan üç sitəmdən usanmaz,
Biri işvə, biri qəmzə, biri naz.

Canan gəlib göz önündən ötəndə,
Müjgan oxun sinəm üstə atanda,
Üç əhdim var, dost, hasilə çatanda,
Biri qurban, bir təsəddüq, bir niyaz.

Sənin guyin mənə cənnət qoxuyar,
Nə zaman ki ləbim ləbə toxuyar.
Aqil vəsfin üç sövq ilə oxuyar,
Biri "segah", bir "çahargah, bir "hicaz".

## GƏLMİŞDİ

Bu şənbə günündə, axşam zamanı
İstəkli bir dostum bizə gəlmişdi.
Alma yanaq, büllur buxaq, gül üzü,
Gətirmiş ləbində məzə, gəlmişdi.

Bahar olcaq bağlar atar barını,
Bülbül çəkər gülün ahü zarını.
Əyninə geymişdi toy paltarını,
İşvəyə, qəmzəyə, naza gəlmişdi.

Aqil dərdin xalqa söylər hər zaman,
Sirr sözün heç kəsə eyləməz bəyan.
Qoymadı danışaq qarı biiman,
Güman ki, söhbətə, saza gəlmişdi.

## BU GÜN BİR QIZ GÖRDÜM, HAZAR EYLƏDİM

Bu gün bir qız gördüm, hazar eylədim,
İstədiyim dostlar onu görməsin.
Yönüm düşüb, qəfil güzar eylədim,
Görüm, Allah, onu safa sürməsin!

Xəbər aldım, onun adı Süsənbər,
Boyu uzun, ağlı gödək, kəmhünər.
Qoy utansın onu əkən nərə xər,
Övladına pis tərbiyə verməsin.

Gül iyisin bulmaq olmaz soğanda,
Ölsün ana pis övladı doğanda.
Kəndin ayağında, İnəkboğanda,
Fikrinizə özgə yerlər gəlməsin.

Aqil, nəsihəti vermə nadana,
Gen dünyada nə qanıbdı, nə qana.
Mərifətsiz ata, abırsız ana,
Övladını gödək bağla, hürməsin.

## *GƏRAYLI*

## GƏLİN

Səhər-səhər sərvi boylu,
Oğrun-oğrun baxar gəlin.
Yüz xəyallı, min fikirli,
Bir gün evim yıxar gəlin.

Nazü qəmzən bildirirsən,
Göz yaşımı sildirirsən,
Gündə yüz yol öldürürsən,
Bir yol öldür, qurtar, gəlin!

Aqil vəsfin yazar, doymaz,
Fikirin fikirimə uymaz.
Dövran səni belə qoymaz,
Ahım səni tutar, gəlin!

## *MÜXƏMMƏSLƏR*

## XORUZU

Dincəlin, a qonşular,
Yediniz mərcan xoruzu;
Pipiyi qan qırmızı,
Tükləri əlvan xoruzu;
Əti məcun kimiydi,
Dərdlərə dərman xoruzu;
Tapsaydıq bir də əgər,
Kəsərdim qurban xoruzu;
Salamat qoymaz idim
Bir saat, inan, xoruzu.

Poyezd kimi qışqırırdı,
Fitə bənzəyirdi səsi;
Saat kimi vaxt bilirdi,
Günün hansıdı vədəsi.
Bir yanı Qarbulaq,
Bir yanı Ağsu dərəsi;
Toyuqlara püh verirdi,
Qığ-qığısı, züm-züməsi.
Yas saxlayın, çil fərələr,
Bürüdü al-qan xoruzu.

Ayın onunda yoxladıq,
İçəriyə girmiş idi.
Quyruğu şeşpər idi,
Dimdiyi də lap şeş idi.
Yəqin ki, ay caamat,
Belə iş arvad işidi;
Əgər arvad deyilsə,
Arvadabənzər kişidi;
Yüz nə deyim, min, nə çıxar,
Apardı filan xoruzu.

Abırsızlar, həyasızlar
Eləməyib ar, yedilər;
Belə orucluq ayında
Etdilər iftar, yedilər.
Ağzında ağı dadsın,
Olsun zəhrimar, yedilər;
İsa deyil, göyə çıxa,
Lap açıq-aşkar, yedilər;
Tülkü, çaqqal da yox idi,
Apara tardan xoruzu.

Utanın, ay oğrular,
Fermanın danası deyil;
Koprətivin kəsilməsi
Ölkəyə sığası deyil;
Kərimin yağ küpəsi,
Məmişin buğdası deyil;
Hansı növünü mən deyim,
Axı, qurtarası deyil;
Yalvarıram Aqilə mən,
Eləsin dastan xoruzu.

## GÖZƏL

Qaşı qara, gözü qara,
Həm də zülfü qara gözəl!
Ey mahitab, etmə kabab
Qəlbimi odlara, gözəl!
Ey cananım, çıxdı canım,
Yandı cismim nara, gözəl!
Ey sitəmkar, bu xun ciyar
Olub hazar para, gözəl!
Ey əhli-dil, dərdimi bil,
Qıl dərdimə çara, gözəl!

Allah, aman, çıxdı bu can,
Halıma bir yan, gözəlim!
Ərzimi al, qeydimə qal,
Eyləmə peşman, gözəlim!
Gözəl çoxdu, fəqət yoxdu
Sən kimi insan, gözəlim!
Ey Həbibə, ey nəcibə,
Dərdlərə dərman, gözəlim!
Xəstəyəm, yol üstəyəm,
Rəhm elə bimara, gözəl!

Ay seyid, eylə qeyd
Dəftərinin bucağına;
Etmə cuda, olum fəda
Cəddinizin ocağına!
Bu gül yanaq, qönçə dodaq,
Yusif düşüb sorağına;
Eyləmə səs, sən məni kəs,
Qurban eylə ayağına;
Canım ala, nəzər sala,
Bəlkə bu mahpara gözəl.

A qardaşım, a yoldaşım,
Hanı cahanda beləsi;
Təbriz, Maku, Tiflis, Bakı –
Yoxdu heç yanda beləsi;
Sinəsi qar, məməsi nar,
Bizim zamanda beləsi;
Çox aranıb, tək yaranıb
Azərbaycanda beləsi;
Zülfü kəmənd, Aqil pəsənd
Tən edir Xumara gözəl.

## XƏNGƏLİN

İki gündü danışılır,
Vardı bənası xəngəlin;
Sizə deyim, fikir verin,
Çoxdu cəfası xəngəlin;
Ununa çovdar qarışıb,
Yoxdu vəfası xəngəlin;
Evinizə vayna düşər,
Qopar davası xəngəlin;
Aləmə yayılacaq
Səsi, sədası xəngəlin.

Müqəssir Hümmət oldu,
Axtardı yağı, dolandı;
Qonşulara elan edib,
Saldı sorağı, dolandı;
Eşitmədi nəsihətim,
Həm solu-sağı dolandı;
Ayrımdan gələn yağın
Sinəmdə dağı dolandı;
Əvvəlindən mən bilirdim,
Nədi sonrası xəngəlin.

Biləyini çirmələyib.
Xamrını Savat yuğurdu;
Başında var havası,
Özü dul arvad yoğurdu;
Əcdadından təlim alıb,
Olubdu ustad, yoğurdu;
Pambığı, qılı, yunu
Qatdı da hər zad yoğurdu;
Qarışmışdı bir-birinə
Ağı, qarası xəngəlin.

Axşamdan başladılar,
Dönə-dönə duz tökdülər.
Gün batdı, ay da çıxdı,
Yayınca ulduz, tökdülər;
Sayın-hesabın bilmədim,
Əlli töküb, yüz tökdülər;
Kilosun on beş qəpiyə
Gördülər, ucuz tökdülər;
Sinəmdə nişan qaldı
Dağı, yarası xəngəlin.

Gündüzdən asılan qazan
Gecəyə davam elədi;
Nə qaynadı, nə də bişdi,
Lap bizi bədnam elədi.
Uşaqlar ağlaşdılar,
Qiyamət qiyam elədi;
Mən özüm də mürgülədim,
Yuxumu haram elədi.
Guya, haqdan enmişdi
Bəzi bəlası xəngəlin.

Gəzmişdim bu Qafqazı,
Belə əngəl görməmişdim;
Bəlkə, indən belə görüm
Bundan əvvəl görməmişdim;
Nə hörrədi, nə də xaşıl,
Belə xəngəl görməmişdim;
Aqil deyər, heyran oldum,
Qaldım mətəl, görməmişdim;
Yapışmışdı bir-birinə
Tamam arası xəngəlin.

## ELƏDİ

Bu gün gördüyüm gözəl
Halımı yaman elədi;
Ala gözü, qələm qaşı
Qətlimə fərman elədi;
Kirpiyi keçdi sinəmdən,
Bağrımı şan-şan elədi;
Ruhum tərk etdi bədəni,
Canımı candan elədi;
Mənim günahım nə idi?!
Niyə nahaq qan elədi.

Zülfünün bir muyunu
Şəki, Şirvana verməràm;
Qafqaza bütün dəyər,
Külli-irəvana vermərəm.
Nə sayım, sadalayım,
Billah, heç yana vermərəm;
Qoynundakı bir cüt narı
Bağı-rizvana vermərəm;
Heyif oldu, nadan dərdi,
Bostanı viran elədi.

Dost deyilən çətin gündə
Çəkilib yana getməsin.
Eşşək gəlib at yerinə
Mənzil meydana getməsin.
Çərxi dönsün pis insanın,
Uzaq zamana getməsin.
Birillahım, irəhm eylə,
Yaxşı yamana getməsin.
Məni zalımın balası
Lap Şeyx Sənan elədi.

Aqil, qəm eyləmə sən,
Hər leylinin naharı var;
Hər gecənin bir gündüzü,
Hər çillənin baharı var.
Dara düşsək, dada yetər,
Bizi yaradan Tanrı var.
Yusif quyudan çıxacaq,
Misir də xoş bazarı var;
Yusifin köynəyini
Yaquba dərman elədi.



**AŞIQ NƏCƏF**
(1900-1968)

Aşıq Nəcəf 1900-cü ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olmuşdur. O, Aşıq Ələsgərin qardaşı Xəlilin oğludur.

Ailənin böyük uşağı olan Nəcəf on altı yaşında atadan yetim qalmış, ailəni dolandırmaqda bir çox çətinliklərlə üzləşmişdir.

Aşıq Nəcəf mollaxana təhsili görmüş, aşıqlıq sənətinə isə Ələsgər ocağının sazlı-sözlü dünyasında yiyələnmişdir.

1918-ci ildə ermənilər Göyçəni viran edəndə o, ailəni Kəlbəcərə köçürmüş, əmisi Şair Məhəmmədin ailəsi ilə birlikdə orada yaşamışdır.

1925-ci ildən aşıqlığa başlayan Nəcəf həmin vaxtdan da şeir yazmağa həvəs göstərmişdir.

Aşıq Nəcəf Böyük Vətən müharibəsi illərində ordu sıralarında xidmət etmiş, sonra isə iki il Ağkilsə kəndində kolxoz sədri vəzifəsində işləmişdir.

Aşıq Nəcəf 1968-ci ildə dünyasını dəyişmiş və Ağkilsə kəndinin şərqindəki qəbiristanlıqda dəfn olunmuşdur.

## *QOŞMALAR*

### AŞİQ OLMUŞAM
(qoşayarpaq)

Bir vəfalı yara, zülfü şahmara,
Dü çeşmi xunxara aşiq olmuşam.
Olsam da sədpara, gəldim qərara:
Çəksələr də dara, aşiq olmuşam.

Qalmışam avara, mən bəxti qara,
Könlüm olub yara, gəlmişəm zara.
Rəhm et intizara, getmə kanara,
Qız, qoynunda nara aşiq olmuşam.

Təbibimsən, ara, elə bir çara,
Gəzdim vara-vara sizin diyara.
Gözləri xumara, səntək dildara
Nəcəfəm, aşkara aşiq olmuşam.

### AY QƏLƏM, DƏRDİMİ

Əvvəl mənim qəm dəftərin başına
Xoş xəttinən yaz, ay qələm, dərdimi.
Oxuyub ariflər, olsun aşina,
Heç görməsin göz, ay qələm, dərdimi.

Qəm-qüssə ayrılmır mən bağrı daşdan,
Könül dərddən doymur, gözlərim yaşdan.
Dostdan, müsahibdən, qohum-qardaşdan
Bilən yoxdu düz, ay qələm, dərdimi.

Mahalım Göyçədi, Nəcəfdi adım,
Ələsgər, İmandı mənim ustadım.
Yüklənibdi ərşə ahım, fəryadım,
Bilirsiniz siz, ay qələm, dərdimi.

## KƏNARINDA

Dedim könül, namərdlərdən kənar gəz,
Gəşt eylə həmişə mərd kənarında.
Müxənnət soruşub dərdini bilməz,
Yüz də dolanasan dörd kənarında.

Gövhər sözüm məclislərdə oxuna,
Arif qana, nəsyət ola çoxuna.
İqbal üz döndərib, gəlmir yaxına,
Çəkilib durubdu sərt kənarında.

Bivəfa üzündən çox çəkdim bəla,
Hər zaman dilimdən kəsilməz nala.
Yığılıbdı qat-qat, olubdu qala
Şikəstə Nəcəfin dərd kənarında.

## QARDAŞ

Nanəciblə ülfət qılma, kənar gəz,
Əysik işlərinə güləndi, qardaş!
"Yüz il keçsə, qohum səndən yad olmaz",
Dar gündə dadına gələndi, qardaş!

Dünya bir gözəldi, adam aldadar,
Çox da bel bağlama, gəl dolan kənar.
Toplayıb varından vursan da anbar,
Axırda dünyada qalandı, qardaş!

Yaralı qəlbimi yandırar ataş,
Dözürəm hər dərdə, mənəm bağrı daş.
Baldız bacı olmaz, qayın da qardaş,
Desələr inanma, yalandı, qardaş!

Nə lazım mətləbi bunca uzatmaq,
Çətindi fələyin işinə çatmaq.
Qohumu unudub, qardaşı atmaq,
Ha vaxt bu, tarixdə olandı, qardaş!

Küskün oldu, sınıq könlüm almadın,
Şikəstə Nəcəfi yada salmadın.
Dar günündə bir yanına gəlmədin,
Aylar keçdi, illər dolandı, qardaş!

## QOYUB FƏLƏK

Dünya bivəfadı, gələn əylənməz,
Arası kəsilməz köç qoyub fələk.
Bilirəm, mən ilə qəlbi düzəlməz,
Sübutsuz boynuma suç qoyub fələk.

Kimini ucaldıb, cah-cəlal verib,
Yüksəldib göylərə, pərü bal verib,
Doldurub başına, huş-kamal verib,
Mənim də ağlımı çaş qoyub fələk.

Biçara Nəcəfin artıb sitəmi,
Günbəgün çoxalır, azalmır qəmi.
Xalqa işrət verib, mənim sinəmi
Hicran oxlarına tuş qoyub fələk.

## QURTARASAN

Namərdə, nakəsə etibar yoxdu,
Vaxtında yanından qaç, qurtarasan.
Müxənnətlik edər qovğa günündə,
Çətindi salamat baş qurtarasan.

Səxasız qohumdan, ürəyi daşdan,
Söyləyən qonşudan, zəvzək yolaşdan,
Tökülməmiş zəhlən, olmamış başdan,
Bir istəsə, verib beş, qurtarasan.

Bir adamda bu nişanlar var ola;
Diş seyrək, gözü göy, rəng sarı ola,
Müxtəsəri, hərif bədnəzər ola,
Salam ver, yanından keç, qurtarasan.

Çox giley-güzarlı, pinti arvaddan,
Küllüklü məhlədən, küləkli kənddən,
Qatırdan, şütürdən, ulaqdan, atdan,
Yüklə barxananı köç, qurtarasan.

Dərin dəryalara dalan, ay Nəcəf!
Hər vaxt qəm sazını çalan, ay Nəcəf!
Qəzanın qəhrində qalan, ay Nəcəf!
Olacaqmı bir gün heç, qurtarasan!

## MƏNİ

Xaliqiləmyəzəl, qadiri-qəffar
Yazmayıb dəftərə, varağa məni.
Özündən, özünə şikayətim var,
Piltətək yandırıb çırağa məni.

Şikəstə gəzirəm xalq arasında,
Təəccübəm bunun mən burasında;
Qoşmayıbdı duram el sırasında,
Çıxarıb kənara, qırağa məni.

Tarixi misaldır, atalar deyib:
“Allah qarğıyanı peyğəmbər döyüb”,
Yaradan nəzəri Nəcəfdən əyib,
Salıbdı gözündən irağa məni.

## YARAŞIR

Yaşasın bağbanı, genişdi bağı,
Bağ bağbana, bağban bağa yaraşır.
İşləyib hər yana qolu, budağı,
Budaq qola, qol budağa yaraşır.

Səs salır hər yana bağın bülbülü,
Şirindi ləhcəsi, şirindi dili,
Gözəldi yarpağı, gözəldi gülü,
Yarpaq gülə, gül yarpağa yaraşır.

Düşübdü aləmə bu bağın səsi,
Görənlərin gəlir şövqü həvəsi.
Dadlıdı dahanda tağın meyvəsi,
Tağ meyvəyə, meyvə tağa yaraşır.

Baxdıqca bağbanın bağı gözəldi,
Silinib qarası, ağı gözəldi,
Səfalı, işrətli çağı gözəldi,
Çağ işrətə, işrət çağa yaraşır.

Nəcəf deyər, heç solmasın bu bağı,
Yayılıb hər yana çatıb sorağı,
Həmdəm eyləyibdi aranı, dağı,
Dağ arana, aran dağa yaraşır.

## *GƏRAYLILAR*

## DAĞLAR

Mürvət eylə, insafa gəl,
Yol ver, səndən aşım dağlar!
Çox çəkmişəm cövrü cəfa,
Qovğalıdı başım, dağlar!

Zirvə, gədiklərin qardı,
Mən çəkdiyim ahü zardı.
Gözü yolda intizardı,
Gözləyir yoldaşım, dağlar!

Güzarım düşübdü səndən,
Üzünü döndərmə məndən.
Xeyli müddətdi, vətəndən
Atılıbdı daşım, dağlar!

Harda qalıb vəfalı yar,
Gülər üzlü nazlı nigar?
Neysan kimi olubdu car,
Axır gözdən yaşım, dağlar!

Qəza kəməndini atıb,
Hər yandan Nəcəfi tutub;
İqbal dönüb, bəxtim yatıb,
Düz gətirmir işim, dağlar!

## YOXDU

Xəstə düşdüm qürbət eldə,
Sorub dərdim bilən yoxdu.
Baş yastıqda, gözüm yolda,
Bir yanıma gələn yoxdu.

Əl üzmüşəm bu dünyadan,
Səbəbini bilməm nədən.
Bir bölük obadan, eldən
Məni yada salan yoxdu.

Kəmtaleyəm əzəl başdan,
Seçilmişəm taydan, tuşdan.
Nəcəfəm, qohum-qardaşdan
İncimişəm, yalan yoxdu.

## *TƏCNİSLƏR*

## BİR İNCƏSİNƏ

Xublar məclisinə güzar eylədim,
Göründü gözümə bir incəsinə.
Dərd tüğyan eylədi, həddini aşdı,
Könül mayıl oldu bir incəsinə.

Bağ salıb becərdim, ayə, nə dərdim?!
Kimsəm yox, gətirəm əyanə dərdim.
Artıbdı canımda, ay ana, dərdim,
Olubdu dağların birincə sinə.

Çox eylər Nəcəfə, ay ağa, bu kar,
Olmaya, əzəldən, ay ağa, bu kar?
Yuyar qəssal qəddim, ay ağa bükər,
Aparıb qoyarlar bir incə sinə.

## DARA, SƏN DARA

Bağlama hər dosta sən etibarın,
Axtar xəyalında ara, sən də ara.
Tökülüb gərdənə zülfü-şahmarın,
Al şana dəstinə dara, sən dara.

A bimürvət, heç demirsən bu da ərdi,
Mən çəkirəm, heç kim çəkməz bu dərdi.
Mən dərvişəm, mənzilgahım bu dərdi,
Sən Şahi-Cəmşidsən, Darasan, Dara.

Al bıçağı, gör dərdimi nədi, yar,
Sakit əyləş, nə el axtar, nə diyar.
Qoy boynuna təqsirini nədi, yar!
Sonra çək Nəcəfi dara, sən dara.

## SƏNƏ DAL

A bimürvət, mən ha candan olmuşam,
“Əlif” qəddim eyləmisən sən a “dal”.
Bilsə idim etibarın belədi,
Bel bağlayıb, çevirməzdim sənə dal.

Var sərimdə heç kəsilməz a qalım,
Vaxtım çatıb, sin qazdırım, ağ alım,
Bir qul olum, qulluğunda a qalım,
İnanmırsan, gəl dilimdən sənəd al.

Yazıq Nəcəf, günün keçdi azınan,
Cəng əzərdi, indi kəsmir azı nan.
Bel bağlayıb, bu fələyə az inan,
Hiylə qurub, axır eylər sənə də al.

## *DİVANİ*

### GƏL

Əgər mərdsən, bu meydana
Saz götür, mərdana gəl.
Həqiqətdən kəlmə kəsək,
Danış, xoş zəbana gəl.
Mərifətlə məclis apar,
Görənlər əhsən desin;
Hərcayıyla aşna olma,
Sirr vermə nadana, gəl.

Səhrayısan, sərin gəzdir
Qeyrətinən, arınan;
Sərrafsan, aç mətahını,
Sərf et xiridarınan.
Sən ki ovsunçu deyilsən,
İşin nədi marınan?
Sarsaqlayıb, sayaqlayıb,
Danışma əfsana, gəl.

Göyçəli Aşıq Nəcəfəm,
Aşkar edim elimi:
Məşhurdu əsli-nəslim,
Aləm bilir halımı.
Bir ləhzədə nitqə gəlib,
Açar olsam, dilimi,
Ünüm yetər Alosmana,
Səs sallam cahana, gəl.

## *MÜXƏMMƏSLƏR*

## QIRMIZI

Ay gözəl, gəl dolanaq,
Seyr edək bağı qırmızı.
Bir axşam, bir də səhər,
Günorta çağı qırmızı.
Göz görüb, könül sevib
Gülgəz yanağı qırmızı.
Xəstəyəm, ver ağzıma,
Əmim dodağı qırmızı.

Dərdini daldalama,
Dərdü qəmim həddən aşır;
Bəhrtək dalğa vurur,
Qaynayır, dəryatək daşır,
Fəhm edin diqqətinən,
Görün necə xub yaraşır,
Geyinib qamətinə
Ağ üstən ağı, qırmızı.

Belə gözəl Alosmanda.
Siz bilən, İranda da yox;
Hayastan, nə Gürcüstan,
Bu Azərbaycanda da yox;
Şəki, Şirvan, Şamaxı,
Külli-Dağıstanda da yox;
Gəzmişəm, görməmişəm,
Edib sorağı qırmızı.

Alnına baxan kimsə
Ağlı çaşır, zayıl olur;
Qaşları canlar alır,
Fəhmi sərsəqayıl olur;

Qəddini, qamətini
Görən necə mayıl olur;
Açılıb lalə kimi
Büllur buxağı qırmızı.

Gəzmişəm hər bir yanı,
Belə bir can görməmişəm;
Aşkara, yer üzündə
Huri, qılman görməmişəm;
Sözlərim həqiqətdi,
Eşit, inan, görməmişəm;
Nəcəfəm, sinəm üstə
Çəkibdi dağı qırmızı.

## SUMAYA

Xudam səni xəlq eləyib
Gözəllərə xan, Sumaya!
Ya hurisən, ya pərisən,
Ya da ki qılman, Sumaya!
Ləblərin şəhdi-şəkər,
Xəstəyə dərman, Sumaya!
Üzün görən Məcnun olur,
Əlindən aman, Sumaya!

Yön çevir, bu gözəlin
Yanağının alına bax.
Dahanında Abi-həyat,
Ləblərinin balına bax.
Fəhm elə, diqqət ilə
Zənəxdanın xalına bax.
Cəlladı, canım alır
Bu qaşı kaman Sumaya!

Ay gözəl, camalını
Görən kimsə candan olar.
Dərdindən xəstə düşər,
Dərmanı ha yandan olar?
Ya Fərhad, ya da Kərəm,
Ya Şeyx Sənandan olar.
Unudar din-imanı,
Bilməz yol-ərkan, Sumaya!

Harda var belə gözəl,
Canına canım sadağa.
Görəni divanə edib,
Məcnun kimi salır dağa.
Aşıqlar tərif eyləyir,
Yoxdu dilinə qadağa;
Gedəndə hansı yana,
Söylər hər zaman, Sumaya!

Ay Nəcəf, diqqət ilə
Bu gözəlin qaşına bax.
Düzülüb dahana inci,
Mərcan kimi dişinə bax.
Süzgün baxış canım alır,
Bu zalımın işinə bax;
Hər görəndə, sanki verir
Qətlimə fərman, Sumaya.



## ŞAİR BƏHMƏN
(1901-1976)

Bəhmən İbrahim oğlu Qarayev 1901-ci ildə Göyçə mahalının Hüseynquluağalı (indiki Nərimanlı) kəndində yoxsul kəndli ailəsində anadan olmuşdur. Hələ beş yaşında ikən atadan yetim qalan Bəhmən çox əzab-əziyyətlə günlər keçirmişdir.

Şair Bəhmən 1928-ci ildən aşıqlığa başlamışdır. Bəhmən hər hansı bir ustad yanında dərs almamışdır; o, sənətə özünün istedadı sayəsində yiyələnmişdir.

Şair Bəhmən mollaxanada təhsil almışdır. Gənc yaşlarından şeir yazmağa başlayan aşıq xalq arasında "Şair Bəhmən" adı ilə tanınmışdır.

Şair Bəhmənin yaradıcılığı zəngindir, onun "Bəhmən və Humay" (1940) adlı dastanı da vardır.

Şair Bəhmən 1976-cı ildə doğma kəndlərində vəfat etmişdir.

Şair Bəhmənin şeirlərindən ibarət kitab nəşr olunduğunu nəzərə alıb, burada bir neçə şeirlərini və Həsən Xəyallı ilə deyişməsini oxuculara təqdim edirik.

## *QOŞMALAR*

## AY HAYIF, HAYIF

Gəşt eylədim, bu dünyanı dolandım,
Oldum bəxti qara, ay hayıf, hayıf!
Mən əl çəkdim, bu dünyadan usandım,
Yoxdur dərdə çara, ay hayıf, hayıf!

Şamlar şölə verər yağın içində,
Şamama bəslənər tağın içində,
Qızılgül əkərlər bağın içində,
Qismət oldu xara, ay hayıf, hayıf!

Yazıq Bəhmən deyir, gör nələr oldu,
Axdı eynim yaşı, qan ilə doldu.
Gen dünya başıma, gör, nə dar oldu,
Həsrət qaldım yara, ay hayıf, hayıf!

## BƏRİ

Düşmüşəm eşqidən şövqü həvəsdən,
Könlümün çırağı sönəndən bəri.
Atadan, babadan gəda olanlar,
İndi kişi olub, dünəndən bəri.

Zivərim, zinətim, şanü şövkətim,
İşrətim, şöhrətim, şirin söhbətim.
İzzətim, ismətim, varım, dövlətim,
Dostlarım yad olub dönəndən bəri.

Mərizi xəstəyəm, bax, mənim özüm,
Bu dərdü möhnətə dözürəm, dözüm!
İsbata keçmədi həqiqi sözüm,
Əlimdən ixtiyar gedəndən bəri.

Artıbdır möhnətim, qəm-küdurətim,
Həmişə xiffətim, fikri-firqətim,
Dilimdə həsrətim getdi hörmətim,
Qohumum, qardaşım itəndən bəri.

Bəhmənəm, gəzirəm, ərd aşığıyam,
Məclislər içinin mərd aşığıyam,
Müddətdi çəkirəm, dərd aşığıyam,
Fələk bu zülmünü edəndən bəri.

## EY PUL

Dünyada hamının gözü səndədi,
Xeyir-şər işləri tutansan, ey pul!
Yaxşılıq, yamanlıq var əlindədi,
İnsafı, vicdanı satansan, ey pul!

Onun hökmündədir, hər işin görür;
Kimini alçaldır, kimini hörür.
Kimsələrdən kəsir, kimsəyə verir,
Qarın doyduransan, yırtansan, ey pul!

Adama, görürsən, quyu qazdırır,
Qətlinə hökm edir, fərman yazdırır.
Alimi aldadıb, yoldan azdırır,
Bilmirəm, sən nəsən, yamansan, ey pul!

Düşmənindən keçib, dosta çatdırır,
Nahaq qan eyləyir, qanlar yatırır.
Qeyllər qaldırır, qallar yatırır,
Ara düzəldənsən, qatansan, ey pul!

Sel kimi daşlanır, yel kimi əsir,
İnsanı özünə eyləyir yesir.
Daşı mum eyləyir, qılınctək kəsir,
Dağları kökündən atansan, ey pul!

Hərə özü üçün bir şey qazanar,
Kimi yaxşı, kimi yaman dolanar.
Dövlətli dostusan, olmazsan kənar,
Kasıbın əlindən pırtansan ey pul!

## GƏRAYLILAR

### AY AQİLƏ

Duran gözəllər içində
Sənsən əla, ay Aqilə!
Gözlərinin şöləsi var,
Yanaq lalə, ay Aqilə!

Büllur buxaq, ayna qabaq,
Dahan sədəf, dodaq qaymaq,
Dişlər incə, dil nə səyaq,
Bənzər bala, ay Aqilə!

Ay üzündə durub qoşa,
Eylədim ona tamaşa.
Yenə təbim gəldi coşa,
Baxdım xala, ay Aqilə!

Mən də oldum sizə mehman,
Eyləməyin özgə güman,
Yenə düşdü Şair Bəhmən
Bu xəyala, ay Aqilə!

*TƏCNİS*

## BİR ÜZÜM, ÜZÜM

Payızda yetişən meyvə içində
Dəhanda ləzzətli bir üzüm, üzüm!
Bəslənər bir boyda, bəstə biçimdə,
İstədim, bu bağdan bir üzüm üzüm.

Könlümün xanəsi bağı ə dərdi?
Yolçu, naşı bağban, bağdan nə dərdi?
Sevgi çatsa sevgisinə, nə dərdi,
Dəymədi canana bir üzüm, üzüm.

Bəhmənə açılar bağlı dər indi,
Kamil bağban, meyvə dəydi, dər indi.
Eşqin bəhrin, mən gəzmişəm, dərindi,
Qəvvasıyam, indi bir üzüm, üzüm.

## NƏRİMANLI BƏHMƏNLƏ HƏSƏN XƏYALLININ DEYİŞMƏSİ

**Nərimanlı Bəhmən**
Səndən xəbər alım, ay şair Həsən,
Dünyaya ilk dəfə kim şəfəq saçdı?
İllər ilə bağlı qalmış qapının,
Sirli qıfılını kimiydi, açdı?

**Həsən Xəyallı**
Al cavabın, deyim, eşit, a Bəhmən,
İlk nuru dünyaya Məhəmməd saçdı.
İllər ilə bağlı qalmış qapının,
Sirli qıfılını Əliydi, açdı.

**Nərimanlı Bəhmən**
O, kimi idi, Allah ona qarğadı?
Dad bilmədi, qaçdı, ağzının dadı.
Yerlə göy gərdişi nəyə bağlıdı?
Kimiydi qovuldu, behişdən qaçdı?

**Həsən Xəyallı**
Şeytanıydı – Allah ona qarğadı,
Ol səbəbdən qaçdı ağzının dadı.
Yerlə göy gərdişi löhə bağlıdı,
Adəmdə qovuldu, behişdən qaçdı.

**Nərmanlı Bəhmən**
Bəhmən də inanır, həqiqət vardı,
O kimdi, dar gündə kimsəyə yardı?
Məhəmmədə gələn nə xiridardı?
O nəyi endirdi, nəyi ucaltdı?

**Həsən Xəyallı**
Həsənin əzəldən aşkardı sözü,
Xızırdı – dar gündə köməkdi özü.
Məhəmmədə gələn Qurandı, düzü,
Endirdi nahaqı, haqqı ucaltdı.



## NOVRƏS İMAN
(1903 – ?)

Novrəs İman Aşıq Ələsgərin qardaşı Məşədi Salahın oğludur. O, 1903-cü ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olmuşdur. İman təhsilini Göyçənin Hüseynquluağalı (Nərimanlı) kəndində mollaxanada almışdır. Bundan sonra o dövrdə diqqəti cəlb edən dini, bədii və tarixi kitabları mütaliə yolu ilə çox zəngin bilik əldə etmişdir.

Sovet hakimiyyəti qurulduqdan sonra İman bir müddət Kəlbəcər rayonunun Seyidlər kəndində kənd sovetinin katibi vəzifəsində işləmişdir. Lakin bütün varlığı ilə Allaha, dinə bağlanan İman din xadimlərinin təqib olunduğunu, məscidlərin dağıdıldığını, Qurani-Kərimin yandırıldığını görəndə, bu quruluşa qarşı onda kəskin bir nifrət yaranmış və tutduğu vəzifəni tərk etmişdir.

Gənc yaşlarından şair kimi tanınan İman 1925-ci ildən saz götürüb aşıqlıq eləməyə başlamışdır. Dini mövzuda olan şeirlərin məclislərdə oxunması yasaq edilməsi İmanı daha da bədbinləşdirmiş, “Mənim mətahım daha burada işləmir; bu ölkədən baş götürüb gedəcəyəm” – deyərək, sazını daşa çırpmışdır. O, şeir yazdığı dəftərləri də təndirə töküb yandırmışdır. İmanın belə hərəkətlərini bir çoxları onun “başına hava gəlməsi” kimi izah edirdilər.

Novrəs İman belə əsəbi halda 1930-cu ildə Göyçədən Azərbaycana gəlmiş, 1932-ci ildən isə yoxa çıxmışdır.

“Novrəs” təxəllüsü ilə şeir yazan bu nakam şairin əsərlərini hamı sevir və əzbərləyirdi. Son zamanlar Tovuz rayonunun Aşağı Ayıblı kəndindən İmanın öz əlilə yazdığı bir dəftəri tapılmışdır. İndi əlimizdə olan dörd min misradan ibarət müxtəlif şəkilli şeirləri vardır.

## *QOŞMALAR*

## AY MARAL

Çarxı-fələk məni yaman oxlayıb,
Axır yaralardan qanım, ay maral!
Mən də sənin kimi yaman dərdliyəm,
İnildəmə, çıxdı canım, ay maral!

Tifil ikən ustad oldum dünyada,
Bir Şirinə Fərhad oldum dünyada,
Çöl-biyaban, səhra oldum dünyada,
Yoxdu elim, nə məkanım, ay maral!

Göyçə sakiniyəm, adımdı İman,
Könlüm çox sınaqda, halım pərişan.
Hər nə ki sirrim var, eylədim bəyan,
Dedim sana hər nişanı, ay mara!

## ÇƏTİNDİ

Gəldi Məhərrəmlik, kəsdi qabağı,
Çıxmaq olmaz bir kənara, çətindi.
İstəkli qohumlar, vəfalı dostlar,
Sizdən uzaq düşsə ara, çətindi.

Məlul könlüm düşüb qəm dəryasına,
Əridir cismimi nar havasına.
Gərəkdi, əyləşəm Əkbər yasına,
Ağlamasam Ələmdara, çətind.

Hər an zikrimdədi ol şahi-əbrar,
Bahar buludutək yaş eylərəm car.
Həsrətin çəkirəm, bir səfərim var,
Orda olmaq üzü qara, çətindi.

Mətahım dürrüdü, alan yox, satam,
Hüseyni-şəhidin matəmin quram.
Oğul yolu gözlər binəva atam,
Həsrət çəkir o biçara, çətindi.

Bu dünyanı görən, özün öyməsin,
Yaralı qəlbimə ellər dəyməsin.
Tanrı heç kimsədən nəzər əyməsin,
Düşsə İman kimi dara, çətindi.

## DEYƏRSİZ

Hələ qəflətdəsiz, yatmısız belə,
Sayıb məni bir divana deyərsiz.
Cəfanız çox olar, yəqin, il-ilə,
Dərdinizi ruhi-cana deyərsiz.

Sərsəri fənada qırılar canlar,
Tökülər yaxandan çox nahaq qanlar.
Seçilməz haqq-nahaqq yolu qananlar,
Məəttəlik bu divana – deyərsiz.

Ucalar dillərdə ah ilə fəryad,
Bir tərəfdən olmaz eyləyən imdad.
İstəkli dost dostun etməyəcək yad,
Kəc dolanıb bu zamana – deyirsiz.

Yanmaz, gecə çox çıraqlar qaralar,
Gərdiş eli bir-birindən aralar.
Pozular bağçalar, güllər saralar,
Səfər edib biyabana deyərsiz.

Ömrə vəfa yoxdu, çoxdu cəfası,
Bəhrəm olsun bu dövranın əsası.
Novrəs İmandakı dərdin binası
Qurulubdu doğruyana,-deyirsiz.

## DƏRD ÜZ VERİB, NİTQİM SÖYLƏR KƏLAMI

Dərd üz verib, nitqim söylər kəlamı,
Bəlkə, sözüm yatanları oyada.
Səs gəlsə guşuna, alar salamı,
Kişi gərək baxsın dost ilə yada.

Qəlbi doğru olan keçəmməz üzdən,
İnsan çox inciyər tənəli sözdən.
Biqeyrət oğuldan, binamus qızdan
Sonsuzluq yaxşıdı fani dünyada.

Tərbiyə gərəkdi ata-anadan,
Mərifət lazımdı əvvəl binadan.
Yüz də cəhd eyləsən, olarsan nadan,
Xidmətin olmasa kamil ustada.

Özgə zəhmətindən dövlət, var olmaz,
Kimsəyə bir zərrə xeyir-kar olmaz,
Kasıblığı kişi üçün ar olmaz,
Bu şərt ilə doğru çıxa üqbada.

Arif olan, huş ver sən bu sözlərə,
Namərd hər bəlanı gətirər sərə.
Kimdi səyyah olub düşə çöllərə,
İman kimi gəzə dərin dəryada.

## DOYUNCA

Əziz ata, itgin gedən fərzəndin
Ağla hey düşəndə yada doyunca.
Mənim gərdənimdə çərxin kəməndi,
Dolandırır bu dünyada doyunca.

Məndən dost-qohuma azca gileylə,
Nə qarğa, dalımca nə hədyan söylə.
Əl götür duaya, minacat eylə,
Bəlkə, yetəm bir murada doyunca.

Halal qıl İmanı, qohum-qardaşım,
Çeşmim ağlar, qaranlıqdı günəşim.
Əgər bir ilahi düzəltsə işim,
Şad olaram Kərbəlada doyunca.

## GÖRÜNÜR

Həyat bir dövrandı, iki üzlüdü,
Qarası görünür, ağı görünür.
Hər sözün, söhbətin öz məqamı var,
Çürüyü görünür, sağı görünür.

Bir barlı bağçaydım, karım kəsildi,
Vaxtsız xəzan əsdi, karım kəsildi,
Vətənimdən etibarım kəsildi,
Qürbət ellər mənə yağı görünür.

Novrəs İman haqdan istər payını,
Dərdə düşsün müxənnəti, xayını.
Yemə çörəyini, içmə çayını,
Namərd süfrəsində ağı görünür.

## VAR

Ey mələk simalım, qəddi minalım,
O sərxoş baxışda əlamətin var.
İsgəndər cəlallım, Hatəm səxalım,
Eşqindən başımda qiyamətin var.

Dilimin kəlməsi – Ayeyi-Quran,
Telinə sadağa varımdı bir can.
Yaraşır şəninə bu külli-cahan,
Yusifi-Kənana şəbahətin var.

Dəhanın çeşmeyi-Abi Səlsəbil,
Verib qüdrətindən cəbbarü cəlil.
Ədalətdə sənsən, söyləsən dəlil,
Məhşərdə möminə şəfaətim var.

Yüz desəm vəsfini, gəlməz hesaba,
Cəbinin təşbehdi qövseyniqaba.
Qədəmindən öpən batar savaba,
Yazılmış sinəmdə hekayətin var.

Səni xəlq eləyib qadiri-sübhan,
Cəmi gözəlliyin nişanbanişan.
Pərtövü cəmalın şövkəti-rizvan,
İmantək quluna hidayətin var.

## *TƏCNİSLƏR*

### A YARA, MƏNDƏN

Vaxt dolandı, gəldi keçdi zamana,
Niyə əl çəkmədin, a yara, məndən?
Nə əcəl gəlmədi, yetişəm cana,
Nə xəbər yetmədi a yara məndən.

Can deyən Fərhaddı, Şirin daha nə?
Əsb əlində söylər şirin dəh ana.
Gəlibdi ləblərin şirin dahana,
Görmüşəm ləzzətin, a yar, əməndən.

İman qələm çalır, nə xoş səfadı,
Nə nizam yoxumdu, nə xoş səf adı.
Pərişan xəyalım naxoş səfadı,
Xain bəd qandırar a yara məndən.

### QALA, YAR, QALA
(dodaqdəyməz)

Nə keçdi cəsədin çətin çəngələ,
Gər canın ataşa qala, yar, qala.
Həsrətindən dərdin yazan dal-dala,
Çəkər sənin təki qala, yar, qala.

İgid girsə, cəng içində at alar,
Xədəngini cəng içində atalar.
Çəkər dərd əhlinin dərdin atalar,
Çətindi zindanda qala, yar qala.

Çarx hərləndi, qara gəldi sənə yaz,
Xətalı gərdişdən axtar sən ay az.
Novrəs İman dərdin desin sənə, yaz,
Həsrəti sinəndə qala, yar, qala.

## NƏ QALA SƏN, SƏN
(dodaqdəyməz)

Gəldi sərin cəngə, titrər əzalar,
Nə dərdə gələrsən, nə qala sən, sən.
Sinən eşqin ataşından az alar,
Nə dincəl, ətəklə, nə qala sən, sən.

Dərs alanlar zikr eyləyir hər aya,
Gedəcəkdi, gedəcəksən haraya.
Çağırar ağasın, yetər haraya,
Nə qala ləşkərin, nə qalasan sən.

İman, səni kəndi çəkər ay ala,
Alar canın, həsrət qalar əyala.
Nə səngisən, nə səngərsən a yala,
Nə hasar deyilsən, nə qala sən, sən.

## SƏNƏM, AL

Ay təzə şahbazım, həm sərvinazım,
Qulluğuna bir ərzim var, Sənəm, al!
Yolunda sadağa candı niyazım,
Layiq deyil qurban kəsim sənə mal.

Götürmüşəm çox sağalmaz yara mən,
Qəm çəkərmi ləblərindən, yar, əmən?!
Layiq olsam qulluğunda yara mən,
Geydirərəm al üstündən, Sənəm, al.

Novrəs İman, günün gəldi nə qara!
Bad əsdi, zimistan oldu nə qara.
Çarxı-gərdiş yenə çaldı nağara,
Ay, gün kəmənd atdı, qurdu sənəm al.

## *DİVANİLƏR*

## GƏRƏK

Kişi üçün əzəl gündən
Başda çox kamal gərək;
Sərf etməyə doğru yola,
Əsəldən zülal gərək.
Həqiqətdən əxz eyləyə,
Mərifətdən anlaya;
Məhşər günü olmayacaq
Ona dövlət-mal gərək.

Kimi alar hökmranlıq,
Ədalətdən danışar.
Mərdin əli açıq olar,
Səxavətdən danışar.
Kimi məlul-müşgül gəzər,
Şikayətdən danışar.
Bu işlərə qərar qoyan
Həyyi-layəzal gərək.

Mala, mülkə bel bağlayıb,
Kiminin var həvəsi.
Həcv eləyib yoxsullara,
Tutma ac ilə bəhsi.
Cəhənnəmdən betər olur
Bu dünyanın tənəsi.
Qurulanda haqq divanı,
Verə bir macal gərək.

Novrəs İman, cəfa çəkmə,
Bu dünyadı bivəfa.
Vaxt yetişsə, mələk əl-mot
Bircə gəlməz insafa.

Açıq söylə kəlmələrin,
Sat mətahın sərrafa;
Qədirbilən qiymət qoyub
Ala dalbadal gərək.

## PƏRVƏRDİGAR

Xəlq eləyib, nitq verib
İnsanı pərvərdigar.
Göstəribdi doğru yolu,
Ərkanı pərvərdigar.
Hər nə tutsan, dəftərində
Cəm olunur, bil,yəqin;
Çəkəcəkdi həmsəvabı,
Üsyanı pərvərdigar.

Necə ki, bu dünyamız var,
O dünya da həqqdir;
Cənnət var, cəhənnəm var,
Bilmək olmaz kim gedir.
Hər kimsə ki, yoldan azıb,
Din-islamı tərk edir;
Əməlinə baxıb, verər
Fərmanı pərvərdigar.

Nütfəsindən nöqsan olan
Haçan haqdan ar elər?!
Öz-özünə böhtan deyib,
Danışmağı xoş bilər.
Cəsəd gedər dar məzara,
Əməl əldə cəm gələr;
Özün saxla pənahında
İmanı, pərvərdigar!

## ŞAİRLƏRDƏ ƏSƏR ÇOXDUR

Şairlərdə əsər çoxdur,
Hər biri bir yanədir.
Hökmi-şəri isbat edən
Sidqimiz Quranədir;
İstəyirsən, əbcəd axtar,
İyirmi səkkiz hərf var;
Min dil ilə vəsf qılsan,
Məhz bir sübhanədir.

“Əlif” – əvvəl, ismi – Allah,
Etqad et, səndə qan;
“Be” – birliyin izah edir,
Bundan axtar, bil, inan;
“Te” – təbarək, təkdi onun
Hikmətində insü can;
“Se” – sabitdi, sübutu var,
Bilməyən biganədir.

“Cim” – cəlildi, həm cabbardı,
Çox ucadı cəlalı;
“He” – halıdı hər əhvaldan,
Bilir, haram, halalı;
“Xe” – xaliqdi, xidmətində
Yoxdu xofu xəyalı;
“Dal! – dəlalət, dəlil verib,
Doğru din, ərkanədir.

“Zal” – zül gərək, zati-pakı
Zaliki olmaz zəlil;
“Re” – rəhmətdi, rəhm eyləyib,
Rayət raha səbil;

"Ze" – zavala getməz özü,
Zay eylər zəhmətlə, bil;
"Sin" – salamət, səhl sanma,
Sualın əyanədir.

"Şin" – şamildi, şəms gedib,
Şəm olub gərdişdə gər;
"Sad" – sadiqdi, səhhət verib
Söhbətlərə səbr edər;
"Zad" – zəlalət yoxdu onda,
Zamindi, olsa verər;
"Ta" – tahirdi, tələb eylər,
Qəlbdə yeganədir.

"Za" – zalımlıq yoxdu onda,
Zahir olmuş büsatı;
"Eyn" – adil padişahdı,
Eyndə var isbatı;
"Ğeyn" – rəffar, famil deyil,
Hər zamandı həyatı;
"Fe" – fanidir, fəna eylər,
Nisbəti dövranədir.

"Qaf" – qadirdir, qəhhar deyil,
Qüdrəti var, qəhr eylər;
"Kaf" – "kün" deyib kani-kərəm,
Qərar tutmuş bəhrü bər;
"Lam" – ləngərdi, leyli-nəhar
Hər yana eylər nəzər;
"Mim" – müdrikdir, mütəkəllim,
Mürüddü bir xanədir.

"Nun" – nisbəti yoxdur onun
Nə cismə, nə cövhərə;
"Ha" – hamildi, hamı gəlir
O gün ruzi-məhşərə;
"Vav" – varlığı şəbahətdə
Yəni nuri-ənvərə;
Laməlifla laşərikdir,
Məhz laməkanədir.

"Ye" – yaradıb yoxdan yeri.
Göyləri tarı, yəqin;
Xəlq eləyib, nitq verib
Məxluqata, bil, həmin;
Gecə-gündüz, ayilən il
Dörd fəsil olmaz kəmin;
Bu isbata inanmayan
Aşikar, divanədir.

Novrəs İman, bir mövlanın
Ətəyindən çəkmə əl;
Nakəs ilə kəlmə kəsmə,
Yar olma nadana, gəl;
Gər istəsən oxuyarsan
Hər növi şerü qəzəl;
Hamsına bais olan
Kəc gələn zəmanədir.



## HƏSƏN XƏYALLI
(1903-1966)

Həsən Xəyallı (Hacıyev Həsən Məhərrəm oğlu) 1903-cü ildə qədim Göyçə mahalının Daşkənd kəndində dünyaya göz açmışdır. O, məhşur el qəhrəmanı (erməni generalı Sülikovun başını kəsən), dayısı Hacı Rəhimdən dini təhsil almış, eyni zamanda şəxsi mütaliə yolu ilə dərin bilik qazanaraq xalq arasında islam dininin bilicisi və təbliğatçısı kimi geniş şöhrət tapmışdır.

Həsən Xəyallı fərdi yaradıcılıqla məşğul olmaqla bərabər, həm də şifahi xalq ədəbiyyatı nümunələrini, xüsusən aşıq şeirlərini toplamağa təşəbbüs göstərmişdir.

Aşıq Ələsgər sənətinə və şəxsiyyətinə böyük ehtiram göstərən Həsən Xəyallı bu ocağın nümayəndələri ilə ünsiyyətdə olmuş, Novrəs İmanla, Aşıq Musa ilə, Aşıq Nəcəflə (Ələsgərin qardaşıoğulları) səmimi dostluq işlətmiş və ölənə qədər biri digərinin evindən ayaq kəsməmişdir.

Həsən Xəyallı 1966-cı ilin yazında (aprelin 10-da) doğma Daşkənd kəndində vəfat etmiş və orada dəfn olunmuşdur.

## *QOŞMALAR*

### GEDƏR

Qəvvas olan dərinləri axtarar,
Naşılar həmişə dayaza gedər.
Bayquşun məskəni xarabalıqdı,
Bülbül gül eşqilə avaza gedər.

Nadanlar sözündən inciməmişəm,
Namərd süfrəsindən nan yeməmişəm.
Atalar sözüdür, mən deməmişəm:
"Təkə təklənəndə güdaza gedər".

Ay Həsən Xəyallı, ömür nəzilər,
Əcəl çatar, əlin əldən üzülər.
Aşiqin görəndə, gözlər süzülər,
Gah işvəyə gedər, gah naza gedər.

### ARASINDA

Nadan nə dərd qanar, nə qəlbi yanar,
Görsə bir səqir var yol arasında.
Olmaz düz etibar, nə namus, nə ar,
Hərcayı söz saxlar dil arasında.

Özündən çox deyən olar kəmhünər,
İş dara düşəndə, sözündən dönər.
Hamının yerinə məclisdə dinər,
Hörmətdən tez düşər el arasında.

Sözüm təsir etməz ağıldan kütə,
Varlısan, lağ etmə kasıba, lütə.
Mərifət ot deyil, hər yerdə bitə.
Yetən taya vura kol arasında.

Dünya vəfasızdı, nahaq qan eylər,
Könlümü yaralar, nəmnişan eylər,
Bülbül cəfa çəkər, ah-fəğan eylər,
Xar isə kef çəkər gül arasında.

Xəyallı, sən qazan elin hörmətin,
Çox qaçma dalınca varın, dövlətin.
Alimlik asandır, insanlıq çətin,
Dərsini mərdlərin al arasında.

## OLAR

Yaxşıda çəkilər yaxşının adı,
Yamanın "qazancı" lənətdə olar.
Aqil bir kəlməylə min könül yapar,
Hərcayı hərcayı söhbətdə olar.

Mərifət anlayan çox zilə çıxmaz,
Səmtinə düşməsə, heç su da axmaz.
Pələng pəncəsindən ovu buraxmaz,
Tülkünün bəyliyi xəlvətdə olar.

Kimə məlum deyil yaltağın işi,
Bir sözü düzdürsə, yalandı beşi.
Qurd çəni axtarar, quzğunlar leşi,
Qarışqa həmişə zəhmətdə olar.

Yaxşı qonşu qonşuluğa yol salar,
Yaman qonşu aralığa qal salar,
Xain, xəbis ürəyinə xal salar,
Gecəsi, gündüzü qeybətdə olar.

Gözləmə namərddən xoş xasiyyəti,
Nanəcib al qurar dosta xəlvəti.
Həsən Xəyallının sözü, söhbəti
Ariflər yanında qiymətdə olar.

**AXTAR MƏNİ**
***(oğlum Şiruyəyə)***

Bir az da geciksən, ay əziz balam,
Evdə yox, məzarda gəl axtar məni.
Ötsə son nəfəsim, çatmasan əgər,
Bu qara torpağı dəl, axtar məni.

Qəlbim paralanıb, hər diyardadı,
Biri intizarda, biri dardadı.
Soruşsa uşaqlar: "qağam hardadı?"
Axıt gözlərindən sel, axtar məni.

Nə qədər çalışdım yaşayam bir az,
Atalıq yükünü daşıyam bir az,
İndi görürəm ki, naşıyam bir az,
Yığılıb üstümə el axtar məni.

Səni yandırmasın söhbətim, sözüm,
Xətrinə dəymişəm, peşmanam özüm.
Tez gəl, yollarına dikilib gözüm,
Mənəm xəstə yatan, bil, axtar məni.

Həsən Xəyallıyam, keçib zamanım,
Kəsilib el üstdən şirin zəbanım.
Daha sağalmağa yoxdu gümanım,
Dərd salıb sinəmdə yol, axtar məni.

***8 aprel 1966-cı il,***
***Göyçə, Daşkənd***

## ƏLƏSGƏR

Sən oldun dünyada söz ümmanının,
Əşrəfi, incisi, ləli, Ələsgər.
Götür telli sazı Səhnabanının,
Ayağı altında ləli, Ələsgər.

Ey sənət ustadı, ey söz ustadı,
Sən qaldırdın zirvələrə bu adı!
Dost bildin qohumu, dost bildin yadı,
Üzmədin ətəkdən əli, Ələsgər.

Səni dahi bildi bütün bəndələr,
Aşıqlar, şairlər, həm xanəndələr,
Sənət meydanında çox danəndələr,
Dedi kamalına "bəli", Ələsgər.

Arif məclisində dedin bir xanə,
Hər ürəkdən qala yapdın bir xana.
Baş əymədin bir ağaya, bir xana,
Dedin adlarına "zəli", Ələsgər.

Mərdlər meydanında olmusan ulu,
Arayıb, axtarıb həqiqət yolu.
Dost bildin özünə lütü, yoxsulu,
O, fəqir, füqara eli, Ələsgər.

Hacılara nökər oldu əzəlin,
Dedin – könül, bu sənətdən üz əlin!
Şahmara bənzətdin oğrun gözəlin,
Hörüb, bağladığı teli, Ələsgər.

Yüz yol dedin: a nanəcib, a nadan,
Mərd oğultək halal süd əm anadan.
Yad oldu könlünə əzəl binadan,
Koyxaların gəlhagəli, Ələsgər.

Kim yıxılsa, yetdin onun dadına,
Pərvanətək yandın elin oduna.
Xəsislərin, acgözlərin adına,
Dastan qoşdun nə gülməli, Ələsgər.

Həcv yazdın, şahlar qəlbin dağladın,
Dar ayaqda qürurunu saxladın.
Azad, xoşbəxt bu həyata bağladın,
Ağır ayı, ağır ili, Ələsgər.

Dövr edirsən ürəklərin qanında,
Hər ömürün dəyqəsində, anında.
Xəyallıyam, qanan, sərraf yanında,
Min il keçsə, vəsfin qalı, Ələsgər.

## *GƏRAYLILAR*

### DAĞLAR

Qoy görünsün zirvələrin,
Dağıt duman – çəni, dağlar!
Yetir əlim nazlı yara,
Ağlar qoyma məni, dağlar!

Yazda səsə səs eyləyən,
Qışda kəsəkəs eyləyən,
Bir-biriynən bəs eyləyən
Ay ətəyi sini dağlar.

Yarı görsən, belə de ki:
Yenə sənsən ürəkdəki.
Ölməyəydim, o qədər ki,
Görəydim o günü, dağlar!

Gör hardadı, soraq eylə,
Yarı yardan iraq eylə.
Üz döndərmə, qonaq eylə,
Xəyallı Həsəni, dağlar!

### ELƏDİN

Zalım fələk, bilirsənmi,
Kimi kimə yar elədin.
Ayrı saldın yarı yardan,
Göz yaşını car elədin.

Qəmi qəmə düzən oldun,
Dəm qoynunda gəzən oldun,
Əli əldən üzən oldun,
Siyah saçı qar elədin.

İtirdin üzü xallını,
Hüsnü günəş camallını.
Yazıq Həsən Xəyallını
Axır, günahkar elədin.

## *TƏCNİSLƏR*

### DALDALA

Nanəcibə dost deməklə dost olmaz,
Aman, könül, sirrin demə, daldala.
Əzəl gündən seyraqubun əlindən,
Sinəm üstə sökək durub dal dala.

Ocaq sönüb, səngiyibdi di yanmaz,
Ömür keçər, bir mənzildə dayanmaz.
Dar ayaqda namərd zərbə dayanmaz,
Mərd igidlər cərgə tutar dal-dala.

Xəyallıyam, canım qurban, ay Ağa!
Min Düldülü, qalx üstündə ayağa.
Vur, kafərin başı düşsün ayağa,
Çəksin supayını İbni-Dal dala.

### MİN ADA MƏNİ

Sahili görünməz bir ümman idim,
Bölüb eylədilər min ada məni.
Qafil oldum, sirr söylədim nadana,
Zalım təşbeh çəkdi min ada məni.

Bağlayıb ciyərim yara, demişəm,
Təbib neştər vura, yara, demişəm.
Başımı pəyandaz yara demişəm,
Kəsələr qurbanlıq Minada məni.

Bilən varmı nədi “əlif”, nədi “nim”,
Qalmayıbdı nə imanım, nə dinim.
Xəyallıyam, nə danışım, nə dinim,
Deyirlər, bəyənmir Mina da məni.

## BİR SİNƏ

Səyyad gərək bərə seçə özünə,
Fürsət tapa, bir ovlaya, bir sinə.
Aşıq deyər, bir sinə,
Yüz hicrandı, bir sinə.
Yazıq canım yetməyib
İstəyindən birsinə.
Eşit, dərdim qoy söyləyim birbəbir,
Əhd bağlayıb, könül verdim birsinə.

Dedim, yarım, bəlkə, məni yarıda,
Vəfasız eşqimi qoydu yarıda.
Aşıq deyər, yarıda,
Yolum qaldı yarıda.
Dar gündə sınamışam
Qohumu da, yarı da.
Uzaq etdi məndən dostu, yarı da,
Namərdləri yetişməsin bir sinə.

Xəyallıyam, ha çağırram ağamı,
Müşkülləri asan edən ağamı!?
Aşıq deyər, ağamı,
Rəngim bənzər ağamı?
Harayıma hay verməz
Ha səsləsəm ağamı.
Qəssal bükdü cəsədimi ağamı,
Onda billəm, qoyacaqlar bir sinə.



**AŞIQ MUSA**
(1909-1948)

Aşıq Musa 1909-cu ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olmuşdur. O, Aşıq Ələsgərin qardaşı Məşədi Salahın kiçik oğludur.

Gənc yaşlarından aşıqlıq sənətinə maraq göstərən Musa az bir zaman içərisində püxtə bir aşıq kimi yetişmişdir.

Ara-sıra şeir yazan Musa şairliyi ilə deyil, mahir ifaçılığı ilə xalq arasında şöhrət qazanmışdı. Bir çoxları, o cümlədən Aşıq Hüseyn Cavan bir neçə il Aşıq Musaya şəyirdlik eləmiş, saz havalarının incəliklərini ondan öyrənmişdir. Təəssüf ki, Aşıq Musanın çaldığı saz havalarından, heç olmasa, bircə nümunə belə nə vala, nə də maqnitafon lentinə yazılmamışdır. Əldə olan iki şeirini sizə təqdim edirik.

Aşıq Musa 1948-ci ilin yayında avtomobil qəzası nəticəsində həlak olmuşdur. Onun qəbri Ağkilsə kəndinin şərqindəki qəbiristanlıqdadır.

## *QOŞMA*

## QARDAŞ

Qəlbim qan ağlayır, didəm yaş tökür,
Gözlərəm yolunu, gələrmi qardaş?!
Həsrəti, möhnəti bu canım çəkir,
Bəs, dərdi olan da gülərmi, qardaş!?

Əzizim, sənsizəm, olmuşam xəstə,
Gözüm yollardadı, qulağım səsdə.
Üzünü görəydim bu son nəfəsdə,
Daha özgə dilək dilərmi qardaş!?

İtirmişəm, axtarıram maralı,
Ovçu bərəsindən getdi yaralı.
Qəm çəkənlər mənim kimi saralı,
Təbib olsa, dərdim bilərmi, qardaş?!

Çağır, şahlar şahı yetişsin dada,
Qüssə-kədər olsa həddən ziyada.
Fələk məni ağlar qoydu dünyada,
Gözümün yaşını silərmi, qardaş?!

Musa məhbəsdədi, yoxdu həyanı,
Neylədin İmanı, ay kərəm kanı?!
Mən onsuz dünyada neylərəm canı,
Tükənməz dərdimi bölərmi qardaş?

## *TƏCNİS*

## AY AĞA, SİNƏ

Ömür istəmirəm, xudaya, səndən,
Yetir haqq evinə, ay ağa, sinə.
Fələk bu zülmünü almadı məndən,
İnsaf deyil, yaxşı, ay ağa, sinə.

Səndə bir etibar haşa, görmədim,
Qəza qəhrin həddən aşa, görmədim.
Kimlər dövran sürdü başa, görmədim,
Çoxları yalvardı ay ağasına.

Musanın da dərdi sinayə qaldı,
Yetmədi mürdələr, sin, ayə, qaldı.
Oxudu dərsini, “sin” ayə qaldı,
Qoymadın yetişə, ay ağa, “sin”ə.



# AŞIQ İSLAM YARPIZLI
(1910-1943)

Əmirzadayev İslam Məhəmmədəli oğlu 1910-cu ildə Göyçə mahalının Yarpızlı kəndində anadan olub. Anası Qaratel mahalın Daşkənd kəndində yaşamış "Dərzilər" nəslindən Məsimin qızı olmuşdur. Daşkəndli el şairi Muxayıl Göyçəli (1918-1944) Aşıq İslamın dayısı Budağın oğludur. Qeyd olunan qohumluq əlaqələrinə görə Aşıq İslam Daşkəndlə sıx təmasda olmuş, həftələrlə kənddə qalmış və toy məclisləri, el şənlikləri keçirmişdir. Elə bu səbəbdən də ustad aşıqlardan biri olan Aşıq İslam Yarpızlı Daşkənddən Aşıq Abbasəli Xəlilovun (1913-2007) və Aşıq Abbasəli Nəzərovun (1919-1992) ustadı olmuş, onların aşıq kimi yetişməsində əvəzsiz rol oynamışdır. Aşıq İslam Muxayıl Göyçəliyə də saz havalarını öyrətsə də, o aşıq kimi yox, el şairi kimi tanınmışdır.

Aşıq İslam 1943-cü ildə Böyük Vətən müharibəsinə səfərbər olunmuş, İrana göndərilən hərbi hissənin tərkibində İrana getmiş və bir daha geri qayıtmamışdır.

Daşkəndli el şairi Muxayıl Göyçəli ilə Aşıq İslamın 20 yanvar 1941-ci il tarixdə yaranan "Əzizim" rədifli deyişməsi ilk dəfə 2008-ci ildə Araz Yaquboğlunun "Daşkənd aşıqları və şairləri" adlı kitabında, divaniləri isə "Ozan dünyası" (№1(4), 2011) jurnalında nəşr olunmuşdur.

# *DİVANİLƏR*

## YOX

Bir ağacda beş budaq var,
İksinin meyvəsi yox.
Üç budaqda altı nar var,
O narın dənəsi yox.
Üç budaqda yetmiş iki,
Haçasın aydın gördüm.
Doxsan altı bülbüldü,
Heç birinin nəfəsi yox.

Hər bülbüldə bir almaz var,
Əl vurma dəsdin kəsər,
Hər budaqda bir yarpaq var,
Gecə-gündüz hey əsər;
Otuz cansız zərif gördüm,
Budaqları hey bəzər.
Hər budaqda şah əyləşib,
O şahın libası yox.

O şahları görmək üçün,
İki yüz on altı yolu var.
Hər yolun da bir haramı,
Haramın qannan xalı var;
Vəsf eyliyir Cavan İslam,
Budaqların qilu-qalı var.
Pəhlivanlar alt olubdu,
Heç birinin səsi yox.

## BAĞLIDI

Səng içində cüt şirin quş,
Onlar döş-döşə bağlıdı.
Bir şəhərə iki dərya bağlanıb,
Quşnan baş-başa bağlıdı.
Qırx nədi bu dünyada,
Altısı qələm çalır;
Beş nə deməkdi,
Beş də beşə bağlıdı.

Hansı dəryada səng var,
Səngin içində nə?
Nə yeyər, nə deyər,
Nə rəngin içində nə?
Nə ayağında, ay arif,
Nə təngin içində nə?
Hansı dəryada çarx hərlənir,
Harda daş-daşa bağlıdı?

Ay arifəm – deyənlər,
İslamın azarı nədəndi?
Bir məqama səbər eylədi,
Düşdü güzarı nədəndi?
Qapı, bacasız xanə gördüm,
Onun açarı nədəndi?
Sirdaş oldum bir işə,
İş də işə bağlıdı.

## *DEYİŞMƏ*
## ƏZİZİM

*Muxayıl*
Məndən salam olsun, cavan İslama,
Alışır cəsədim nara, əzizim.
Sən arifsən, hər mətləbi qanarsan,
Mən olmuşam bil avara, əzizim.

*Aşıq İslam*
Gecə-gündüz ahu-fəqan eylərəm,
Mən oldum sinəsi yara, əzizim.
Sirr sözümü anlayana söylərəm,
Mən demərəm biilqara, əzizim.

*Muxayıl*
Kamil bağban, narı bağdan üz barı,
Qəvvas təki dəryalarda üz barı,
İgid olan sözün söylər üzbarı,
Müxənnətlər salar tora, əzizim.

*Aşıq İslam*
Dağlarda əhdini bahar-yaz qana,
Aşığın dərdini telli saz qana,
Bir adam ki, çox deyəndə az qana,
Bil ki, qalar o avara, əzizim.

*Muxayıl*
Muxayılın pənahı Xeybər alandı,
Qəm atəşi sinəm üstə qalandı.
Bir yaxşılıq insan üçün qalandı,
Ləl çəkərəm xiridara, əzizim.

*Aşıq İslam*
İslam deyər, dost dostunu atmasın,
Qara bəxtim məni ucuz satmasın.
Seyraqublar heç kamına çatmasın,
Tərlan da uymasın sara, əzizim.



## ŞAİR HƏŞİM
(1912-1989)

Şair Həşim Aşıq Ələsgərin nəvəsidir (Bəşirin oğludur). O, 1912-ci ildə Göyçə mahalının Ağkilsə kəndində anadan olmuşdur.

Orta təhsil almış Həşim 1930-cu illərdə öz kəndlərində və qonşu Böyük Qaraqoyunlu kəndində müəllim işləmişdir. 1940-cı ildə əsgəri xidmətə çağrılmış, Böyük Vətən müharibəsi döyüşlərində ağır yaralanmış və 1942-ci ildə ordudan tərxis olunmuşdur.

Həşim uzun müddət kənd sovetinin sədri, kolxoz sədri və digər rəhbər vəzifələrdə işləmişdir.

Şair Həşim gənc yaşlarından saza-sözə maraq göstərmiş və şeir yazmağa başlamışdır, şeirlərində "Mahir" təxəllüsü işlətmişdir.

Təqaüdə çıxmış Həşim ermənilərin törətdikləri milli ixtilafla əlaqədar olaraq, doğma yurdu tərk eləməyə məcbur olmuşdur. O, əvvəl Qazax rayonunun Musaköy kəndində, sonra isə Daşkəsən rayonunun Bayan kəndində yaşamış və 1989-cu il noyabr ayının 3-də orada vəfat etmişdir.

## *QOŞMALAR*

## BƏSDİ, BƏS

Cəsəd tab gətirmir, ay qara baxtım,
Can dayanmır bu yaraya, bəsdi, bəs.
Əgər vaxtımdırsa, köçür üqbaya,
Ya da yetir bir davaya, bəsdi, bəs.

Dərdim əzalarda məskən salıbdı,
Mürği-xəyal qəm bəhrinə dalıbdı.
Qoca anam gözü yolda qalıbdı,
Tab gətirmir ahü-vaya, bəsdi, bəs.

Ey xudaya, necə bədbəxt insanam,
Mənim ki həyatda yoxdu təmənnam.
Zəlalətdə qalan bir müsəlmanam,
İmdad elə, gəl haraya bəsdi, bəs.

Çəkibsən sinəmə dağ üstən dağı,
Kəsibsən bərəni, bəndi, ovlağı.
Yediyim taama qatırsan ağı,
Naləm çatır ərş-əlaya, bəsdi, bəs.

Qəmnak yaranmışam, çəkirəm qəmi,
Mən ki görməmişəm söhbəti, dəmi.
Sağ göstərdin mənə sən cəhənnəmi,
Tüstüm qalxır bax havaya, bəsdi, bəs.

Hər arzu-diləyim qaldı gözümdə,
Qurtarıbdı söhbətim də, sözüm də.
Həyatıma nə deyim ki özüm də,
Həşim düşüb çox bəlayə, bəsdi, bəs.

## QƏLƏM

Könlümün sirdaşı, həm köməkdarım,
Dediyim sözləri yazırsan, qələm!
Sənə qurban olsun dövlətim, varım,
Yazmağa hər ləhzə hazırsan, qələm!

Ürəyimdən keçənləri bilirsən,
Ağlayanda göz yaşımı silirsən,
Nə zaman gülürəm, sən də gülürsən,
Mənimlə hər yanı gəzirsən, qələm!

Bərabərin deyil dünyanın varı,
Heç vaxt unutmursan əhdi, ilqarı,
Dərdimi, qəmimi bölürsən yarı,
Ağrıma, acıma dözürsən qələm!

## OLA

Kimdi mənim kimi cavanlığından
Ağara saqqalı, qəddi xəm ola?!
Keçirə həyatın ahü fəğanla,
Huşu çaşa, ağlı sərdə kəm ola.

Əl çək məndən, bəsdi, ay acı həyat!
Baxtım, oyan, bu qəflətdə sən az yat!
Kərəmkanı mənə eyləyə barat,
Qardaşlarım ətrafımda cəm ola.

Qədimlə Yadullah və Əsədullah,
Bunlardı dərdimin dərmanı, billah.
İbadullah, Feyzi, Zöhrə, Eynullah,
Can varkən görüşəm, xoş matəm ola.

Həsrətdi mənimlə görüşsün ana,
Doğurdan, şirindi ana insana.
Həşim istəyir ki, gələ zamana,
Yemək-içmək ola, söhbət, dəm ola.

## YARAŞIĞI

Bu mələk misallı, həbəşi xallı,
Hara ceyranıdı çöl yaraşığı?
Ağ yanağı xallı, ləbləri ballı,
Sular sonasıdı, göl yaraşığı.

Geyinib naxışdı, maral baxışdı,
Gözümə sataşdı, xəyalım çaşdı,
Dərdim həddən aşdı, dilim dolaşdı,
Hörüklər gərdəndə bel yaraşığı.

And verdim ilqara, olmadı çara,
Oldum baxtı qara, qaldım avara.
Vurdu mana yara, o mahipara,
Qəmər üzdən alır tel yaraşığı.

Bir eşit Mahiri, a nazlı pəri,
Sərraf seçər zəri, tanı müştəri,
Üzün çevir bəri, oldum sərsəri,
Qoy alsın hüsnündən el yaraşığı.

## *TƏCNİSLƏR*

## AY ATA, SƏNSƏN

Həyatım varlığı, didəmin nuru,
Qəlbimin çırağı, ay ata, sənsən.
Gərək gözləyəsən, çata məqamı,
Ovu bərəsində ay atasan sən.

Çox çəkibsən dünya dərdü bəlasın,
Ana olan çox istəyər balasın.
Şərbət qoyun, başın üstən bal asın,
Bəlkə, şirin yuxu a yatasan sən.

Həşim, urcah oldun dərdə, azara,
Daha məni sən az axtar, az ara.
Yetişibsən, budu, qalıb az ara,
Suvar olacaqsan ay ata sən, sən.

## QAR QARA

Sənə dedim, get şikara, ov gətir,
Demədim ki, tərlan itir, qarqa ara.
Təbiət sirrinə bir nəzər yetir,
Kim görübdü göydən yağa qar qara.

Dərdim artıb, tab eyləmir sər indi,
Dər gülləri, sədrin üstə sər indi.
Bizim yerin havası çox sərindi,
Qalır köhnə qar, qarışır qar qara.

Eşq ucundan yenə tapıb sər əsər,
Can verənə, Mahir can ver sərə-sər.
Qocalıqda əl titrəyər, sər əsər,
İstər yaza “qar”, yazılar “qar” “qara”.

## YAR GÖZLƏ MƏNİ

Çarxı – fələk dərdim yüzə yetirdi,
Gedirəm qürbətə, yar, gözlə məni.
Müxənnətlər vətənimdən itirdi,
Məndən qeyri ləbin, yar, gözlə əməni.

Vəfalı dilbərim, həyalı gəl gəz,
Geyin altdan-üstən hey alı, gəl gəz.
Mən yaylaqda, sən də ha yalı gəl gəz,
Deyəsən görmürsən yar gözdə məni.

Mahir səndən küsübdümü yar, aya,
Canım tab gətirməz dərdə, yaraya.
Cəmalının bənzəri var, yar, aya,
Təbibsən, öldürmə, yar, gözlə məni.

## *MÜXƏMMƏSLƏR*

### DƏRDİN ALIM

Şeirə maraqlısan,
Yazıram al, dərdin alım.
Nə desən, sən haqlısan,
Dərin kamal,dərdin alım.
Buxağı büllur kimi,
Mələk misal, dərdin alım.
Hüsnünə mayıl olub
Bu el, mahal, dərdin alım.
Yanağı dağ lalası,
Qaşı hilal, dərdin alım.

Mən necə yazım yaraşa
Sənin hüsnü camalına;
Sən məni gətiribsən
Divanələrin halına;
Məcnundan gözəl sorsalar,
Leyli gələr xəyalına;
Fərhad keçdi canından
Yetə Şirin vüsalına;

Sənanı, Əsli, Kərəmi
Bir yada sal, dərdin alım.

Molla Cuma kimi sənin
İsmini pünhan deyirəm;
Sən mənə hər nə desən,
Cavabına “can” deyirəm;
Bir dəfə görüşməyə
Gör neçə qurban deyirəm;
Kərəm et, sən Mahirin
Qeydinə qal, dərdin alım.

## YAZIM

Qələmi alım ələ,
Başlayım həyatı yazım,
Yaxşı günə şükr səna,
Pisinə bayatı yazım;
Cəfanı həm səfanı,
Ax-vayı, heyhatı yazım;
Ağılı, mərifəti,
Elmi və savadı yazım;
Çarxı-fələyin mən ilə
Açdığı büsatı yazım.

Mən ki, deyib – danışmadım,
Gülmədim necə bir cavan;
Fələk başımdan od tökdü,
Dəmadəm əmr eylədi yan;
Axır saldı qürbət elə,
Dedi, davam gətir, dayan;
Bu hər dərddən betər oldu,
Yanımda olmadı həyan;
Neçə il çalışım ki,
Belə əhvalatı yazım?!

Çox şükür dərgahına,
Xaliq, var qohum-qardaşım;
Ətrafımda cəm görərdim
Əgər ağrısaydı başım;
Eşidən saat gələrdi
Tayım, tuşum, arxadaşım;
Qaranlıq meşələr yerim,
Ağaclar oldu sirdaşım;
Sağlığıma səbəb oldu
Sağ olsun Bozatı, yazım.

Yaranmış yanır oda,
Kimdi günahkar, a fələk?!
Tarixdə görünübmü
Heç belə azar, a fələk?!
Günahsız fağırların
Ol üstündə yar, a fələk!
Günahkarın tufanasın
Elə tarimar, a fələk!
Günahsız qırılmağın
Varsa de isbatı, yazım.

Narkomdan əmr olundu,
Suvari gəlsin davıya;
Tumarladıq, yəhər qoyduq
Hər bir arıq yavıya;
Verildi kalbas, suxarı,
Aldıq, bükdük məhrəbıya;
Sidq-dilinən sığındım
Məhəmməd əl-Mustafaya;
Yar oldu üstümdə mənim,
Verdi çox nicatı, yazım.

Xülasə, həmin günü
Vağzalda dolduq maşına;
Axırıncı məktub yazdı
Hərə qohum-qardaşına;
Bir neçə əyripilan
Ağı qarışmış aşına!
Kəsdi yolu, bombaladı,
Saldı çataçatı yazım.

Heç yana baxmalı deyil,
Hər tərəf viran görünür;
Hesabsız torpaq kimi
Qırılan insan görünür;
Kimsə görməyib tarixdə,
Çaylar kimi qan görünür;
Yaralılar sızıldaşır,
Ah çəkir, fəğan görünür;
Sayı yox, miqdarı yox,
Mən nə hesabatı yazım?!

Yoldaşlardan ayrı düşdüm,
Yanımda olmadı qalan;
Nə ola, biləm hardadı
Ataş, İsmayıl, Xənçəlxan?!
Qardaşdan artıq idik,
Deyirdik bir-birmizə "can";
Hamı yığılıb gedərdi
Biri xəstələnən zaman;
Dostluqda Haqverdini
Bayramı, Ziyatı yazım.

Heç bir çıxış yolu yoxdu,
Bəs, mən biçara neyləyim?
Hər saat, hər dəqiqə
Yanıram nara, neyləyim?
Yol uzaq, bədən yara,
Boranı, qarı neyləyim?
Mən ki aciz olmamışam,
Baxtımdı qara, neyləyim?
Yaxşısı budur, canımı
Allah amanata yazım.

Baş bədənə əmr verir,
Bir ərizə xudaya yazım;
Rəhmə gələ, bəlkə, sala
Üstümüzə sayə, yazım;
Baş ağarıb, qədd əyilib,
Dönmüşəm qocaya, yazım;
Səbəb kimdi, yox eləsin
Allah, bu davaya, yazım;
Yəqin tutular diləyim,
Mən bu minacatı yazım.

Belə görünür ki, hələ
Uzun gedəcək bu dava;
Bəndənin əlində nə var,
Haqq özü baxsın hesaba;
Ölənlərə rəhmət etsin,
Xəstələrə versin şəfa;
Yaralı vaxtımda yazdım,
Mənə də əhsən, mərhəba;
Burda yox, vətənimdə
Özümə vəfatı yazım.



## AŞIQ MƏHƏRRƏM
(1913-2002)

Məhərrəm Məmməd oğlu Hacıyev 1913-cü ildə Göyçə mahalının Ağbulaq kəndində anadan olmuşdur. Gənc yaşlarından saza böyük maraq göstərən Məhərrəm bu sənətə Aşıq Talıbın və Aşıq Ələsgərin qardaşı oğlu Aşıq Nəcəfin sayəsində yiyələnmişdir.

1938-ci ildə İrəvanda keçirilən olimpiada zamanı dövlət tərəfindən mükafatlandırılan Məhərrəm bir aşıq kimi şöhrətlənmişdir. O, 1941-1945-ci il Böyük Vətən müharibəsindəki döyüşlərdə iştirak eləmişdir.

Aşıq Məhərrəm 1949-cu ildən Azərbaycanın Xanlar rayonunda (indiki Göygöl) məskunlaşıb. O, 1952-ci ildə bir müddət Azərbaycan Dövlət Filarmoniyasında fəaliyyət göstərmişdir.

Yeni aşıqlar nəslinin yetişməsində xidmətləri olmuşdur. Aşıq İmran Həsənov, Aşıq Mahmud Məmmədov, Aşıq Ədalət Nəsibov, Aşıq Hüseyn Məhərrəmov, Namaz Əsədov və başqa aşıqlar Aşıq Məhərrəmdən çox şey öyrənmişlər.

1993-cü ildə Xanlar şəhərində Aşıq Məhərrəmin anadan olmasının 80 illiyi təntənə ilə qeyd edilmişdir.

Aşıq Məhərrəm 2002-ci ildə Xanlar şəhərində (indiki Göygöl) vəfat edib.

## *QOŞMALAR*

## CAVANLIQ

Aman, cavanlığım, küsərəm səndən,
Sən məni saxladın yaxşı, cavanlıq.
Yalvarıram, qoyma düşüm həvəsdən,
Ömrüm yaraşığı, naxşı cavanlıq.

Gəl qoyma saçlarım tez ağarmağa,
Yolumu salmaynan yoxuşa, dağa.
Türfə gözəllərə mehman olmağa
Qaytar təzdən geri yaşı, cavanlıq!

Bir də Məhərrəmlə gəl, sövda vuraq,
Həyatı dövranı yenidən quraq.
Sən Allah, tərs olma, kəcliyi burax,
Axıtma gözümdən yaşı, cavanlıq!

## OLSUN

Şəyird odur ustad adın ucalda,
Elə şəyird, görüm daim var olsun!
Nə mətləb istəsə, çatsın murada,
Həmişə əlində ixtiyar olsun!

Şəyird əgər itirməyə əməyi,
Haqq yanında qəbul olar diləyi.
Şahlar şahı olsun onun köməyi,
Ömür boyu tale ona yar olsun!

Məhərrəmin şirin sözü İmrandı,
Vuran qəlbi, görən gözü İmrandı,
Ellər yaraşığı, düzü, İmrandı,
Görüm, səfa sürsün, bəxtiyar olsun!

## ƏGƏR Kİ, BİR BÜLBÜL QƏFƏSDƏ QALSA

Əgər ki, bir bülbül qəfəsdə qalsa,
Ah çəkib, sızlayıb, bəs, ağlamazmı?!
Pərvanə özünü yandırsa oda,
Şəmi onun üçün yas saxlamazmı?!

Görən, yerindəmi gəzdiyim bağlar?
Gözlərim görməsə, qəlbim qan ağlar.
Səfalı yaylaqlar, sərin bulaqlar,
Sizdən ayrı düşən tez qocalmazmı!?

İllər həsrətiyəm səni görməyə,
Sirr sözümü açıb aşkar deməyə.
Qarğıyıram zalım çarxı-fələyə,
Sevgi sevgisini yada salmazmı!?

Salam olsun sizə, mənim ellərim,
Hələ ki, cavanam, solmur güllərim.
Məhərrəməm, həsrət qalan əllərim
Hicran sazım qürbət eldə çalmazmı!?

## QADİR ALLAH BİR DƏ SƏBƏB OLAYDI

Qadir Allah bir də səbəb olaydı,
Dostu, qohumları bir də görəydim.
Fələk ayrı saldı nazlı yarımdan,
Seyraqub qoymadı gülüm dərəydim.

Sağalaydı bu könlümün yarası,
Tapılaydı dərdlərimin çarası,
Uzaq oldu mənlə Vətən arası,
O yerləri görüb, sonra öləydim.

Ağlamaq peşəmdi, huş yoxdu sərdə,
Mən necə tab edim bir belə dərdə!?
Şahi-Mərdan yetişəydi bu yerdə,
Qurbanımı, nəzirimi verəydim.

Röyada bu gecə gördüm anamı,
Döşənib payına, verdim salamı,
Ağlayıb, dəstindən mən aldım camı,
İntizaram, əhvalını biləydim.

Ağlama, ay ana, düşmə gümana,
Çox cavanlar qərq oldular ümmana,
Məhərrəm sığınıb Şahi-Mərdana,
Qismət ola, ziyarətə gedəydim.

## VAR

Qadir Allah, sənsən mənim pənahım,
Bir yol göstər mənə, intizarım var.
Bağışla, yanında çoxdu günahım,
Gözü yolda qalan nazlı yarım var.

İslam olan şəxsin var bir ağası,
Cəmi dərdlərinin odur davası,
Əlbəttə, silinər könlümün pası,
Buna əzəl gündən etibarım var.

Məhərrəm qəm çəkməz meydanda qalsa,
Ərənlər sərvəri bir nəzər salsa.
Əgər hücm edib, faşistlər gəlsə,
Mənə kömək duran ələmdarım var.

## KİMİ
***(Aşıq Ələsgərə)***

Şeir meydanında vüqarla durdun,
Möhtəşəm dağların ucası kimi.
Sənətə möhkəm bir təməl qoyubsan,
Misir ehramının bənnası kimi.

Sözündə vəsf olub el gözəlləri,
Tər qönçə, tər çiçək, gül gözəlləri,
Oxşayıb sazında tel gözəlləri,
Mehriban ananın laylası kimi.

Meydanında neçə qilü qal olub,
Neçə aşıqların dili lal olub,
Neçə molla, alim payimal olub,
Coşubsan elmlər dəryası kimi.

Deyirlər, hər şeyi bilib Ələsgər,
El ilə qəmlənib, gülüb Ələsgər,
Elə ki, məclisə girib Ələsgər,
Nur saçıb Günəşin ziyası kimi.

Bir də gəl cahana, Ələsgər əmi,
Aşıq Məhərrəmin qalmasın qəmi.
Yığılsın başına aşıqlar cəmi,
Aşıq Ələsgərin sədası kimi.

## *GƏRAYLILAR*

## BARIŞAQ

Ağrın alım, küsmə məndən,
İnsaf eylə, gəl barışaq.
Ayrıla bilmirəm səndən,
Gəlib çatıb il, barışaq.

Sənsən bir ceyran balası,
Dağların gülü, lalası.
Naz eyləmə, ay qadası,
Bir üzümə gül, barışaq.

Sən ol Məhərrəmin yarı,
Bir sallan gəl bizə sarı,
Bağışla mən günahkarı,
Ver əlimə əl, barışaq.

## AY XALA

Yetişibdi bahar fəsli,
Açılıbdı yaz, ay xala!
Fələk ayrı saldı yarı,
Dərdimi sən yaz, ay xala!

Xəbər alma haralıyam,
Özüm bəxti qaralıyam,
Sinəm üstən yaralıyam,
Dərman yetir tez, ay xala!

Namərdlərdə olmaz vəfa,
Məhərrəməm, sürdüm səfa.
Salamat qal, Ağıstafa,
Çox çalmışam saz, ay xala!

## MAYIS GƏNCƏLİ, GƏNCƏLİ

Mərd kişinin mərd balası,
Mayıs gəncəli, gəncəli.
Hər yana çıxıb sədası,
Mayıs gəncəli, gəncəli.

Hatəm kimi səxalıdı,
Dost yoldaşa vəfalıdı,
Naməhrəmdən həyalıdı,
Mayıs gəncəli, gəncəli.

Dərya kimi elmi vardır,
Xaliqim üstündə yardır,
İmranıma barabardı,
Mayıs gəncəli, gəncəli.

El-obanı tutub adı,
Sevir dostu, sevir yadı,
Məhərrəmin qol-qanadı,
Mayıs gəncəli, gəncəli.

## SALAHLI PAŞA İLƏ DEYİŞMƏ

**Paşa**
Söylə, insan qocalarmı,
Günü yaxşı keçən yerdə.
Könlü hədər dolanarmı,
Özü ovlaq seçən yerdə.

**Məhərrəm**
Kamil ustad yada düşdü,
Arifləri seçən yerdə.
Cavanlığım tez ötüşdü,
Təzə meydan açan yerdə.

**Paşa**
Çox gəzmişəm qürbət eli,
Başa vurduq ayı-ili.
Şəfa verməz təbib əli
Könül evi uçan yerdə.

**Məhərrəm**
Dost gərək dostunu sora,
Tərlan baş əyməyə sara.
Canım düşüb ahü zara,
Bir dinc yatım haçan yerdə!?

**Paşa**
Yer üzündə gəzən bəşər,
Bir-birinə gəl, atma şər.
Quyu qazan özü düşər,
Düz yol bilib keçən yerdə.

**Məhərrəm**
Yadıma saldım keçmişi,
Oyundu fələyin işi.
Kim insana deyər kişi,
Dostu qoyub qaçan yerdə!?

**Paşa**
Sev xalqını Salahlıtək,
Vətən üçün vursun ürək.
Hərə bir iz qoysun gərək,
Bu dünyadan köçən yerdə.

**Məhərrəm**
Mən Hacıyev Məhərrəməm,
Namərdlərə baş əymərəm.
Yaranmışıq, kani-kərəm
Aləmə nur saçan yerdə.



## ŞAİR ƏBÜLFƏT
(1914-1944)

Əbülfət Rəhimov 1914-cü ildə Göyçə mahalının Zod kəndində dünyaya gəlmişdir. O, Usta Abdullanın qardaşı İsmayılın oğludur.

İrəvanda Pedaqoji texnikumu bitirən Əbülfət öz kəndlərindəki orta məktəbdə dil-ədəbiyyat müəllimi kimi fəaliyyətə başlamışdır. O, erkən bədii yaradıcılığa meyl göstərmiş, xalq arasında şair kimi tanınmışdır. Ermənistan Yazıçılar İttifaqı türk bölməsinin katibi olan Əbülfət, eyni zamanda SSRİ Yazıçılar İttifaqının üzvü idi. Onun bir sıra şeirləri o zaman müxtəlif mətbuat səhifələrində dərc edilmişdir.

Şair Əbülfət Böyük Vətən müharibəsi illərində cəbhəyə yollanmış və 1944-cü ildə Belarusiyanın azad olunması uğurundakı döyüşlərdə həlak olmuşdur. Onun şeirlərinin bir qismi səngərlərdə yazılmışdır. Bu şeirləri sağ qalan əsgər yoldaşları mühafizə etmişlər.

## *QOŞMALAR*

### AĞLAMA

Ay Əbülfət, bu nə gündü, çəkirsən,
Ağlamaqdan çıxdı canın, ağlama!
Dindirəndə, bulud kimi tökürsən,
Quruyubdu canda qanın, ağlama!

Bu dünyanın etibarın görmədin,
Bağ becərdin, meyvəsini dərmədin,
Cəfa çəkdin, səfasını sürmədin,
Bəsdir sənə bir ad-sanın, ağlama!

Qonaq idin, hazırlaşdın getməyə,
Peşman oldun yaranmağa, bitməyə.
Ay Əbülfət, əlin ələ yetməyə
Məhşərəcən var gümanın, ağlama!

### DURMA, GƏL

Ala gözlüm, səndən ayrı düşəli
Mənim halım pərişandı, durma, gəl!
Gecə-gündüz yuxu görmür gözlərim,
Zindandayam, nə zamandı, durma, gəl!

Anam-bacım yoxdu solu sağımda,
Atam hanı gələ qəmli çağımda!?
Bülbül ötmür gülü solan bağımda,
Baharım da zimistandı, durma, gəl!

Əbülfətəm, dünya mənə od oldu,
Dost ağladı, düşmən baxıb şad oldu,
Yaxşı günlər üz döndərdi, yad oldu,
İndi mənə qəm həyandı, durma, gəl!

## AMAN GÜNÜDÜ

Nə fərmandı, bu nə yoldu, bilmirəm,
Uğur verin, yollar, aman günüdü!
Ətrinizdən doymamışam hələ mən,
Saralmayın, güllər, aman günüdü!

Dərd əlindən ha incidim, nazildim,
Öncül idim, qatarımdan üzüldüm,
Fələk vurdu, qürbət elə yazıldım,
Unutmayın, ellər, aman günüdü!

Vaxtsız əcəl heç qapını döyməsin,
Xudam özü öz quluna qıymasın!
Yaman günlər qəddimizi əyməsin,
Dağılmayın, tellər, aman günüdü!

Dərd şahıyam, qəmdən təxtü tacım var,
Aləm bilir, yaman ağrı-acım var,
Gözü yolda qardaşım var, bacım var,
Üzülməyin, əllər, aman günüdü!

Çarxı-fələk hər bir işdən halıdı,
Bəlkə yolum gedər-gəlməz yoludu?
Mən gəlincə sonam sizdə qalıdı,
Qurumayın, göllər, aman günüdü!

Dua qılın, haqq evinə yetirsin,
Yaradanı zülmü yerdən götürsün.
Həsrətlini bir-birinə çatdırsın,
“Amin” deyin, dillər, aman günüdü!

Əbülfətəm, könlüm yaman dardadı,
Çahar fəsil günüm ahü zardadı.
Qohum-qardaş heç bilmirəm hardadı,
Xəbər verin, yellər, aman günüdü!

## ƏZİZİM

Bir ali məclisdə əyləşən zaman,
Sərraflar yerbəyer baxar, əzizim.
Alimi-dilavər tapar qüsurun,
Şəltəni boynuna taxar, əzizim.

Bihudə-bihudə canı bəsləmə,
Özünü ər bilib, yadı pisləmə,
Sərrafa mis verib, qızıl istəmə,
Paxırın üzünə çıxar, əzizim.

Alçaqlar ucalar, ucalar enməz,
Dünyalar yığılsa, vaxt geri dönməz.
Tale nəzər qılsa, çırağın sönməz,
Piltənə yağ gələr, yaxar, əzizim.

Sərçələr irilməz yüz bahar olsa,
Xainlər aynımaz, külli-var olsa,
Analıq nə qədər can-ciyər olsa,
Su yenə səmtinə axar, əzizim.

Kişisiz obada şiri-nər olma,
Bədəsil yoldaşla həmsəfər olma,
Dilbilməz yanında dərdəcər olma,
Nadanlar başına qaxar, əzizim.

Nəcabət əhlinə halaldır halal
O uca mərtəbə, o cahi-cəlal!
Görməmiş bir adam tapanda var-hal,
Gözü kəlləsinə çıxar, əzizim.

Adım Əbülfətdir, atam-İsmayıl,
Dünyanın sirrinə olmuşam mayıl.
Öz halal malına qayıl ol, qayıl,
Haram mal çox evlər yıxar, əzizim.

## İNŞALLAH

Ey könül, qəm yemə, Allah kərimdi,
Yaradan imdada çatar, inşallah!
Yusifi quyudan çıxardan kişi
Əl atıb, dəstindən tutar, inşallah!

Salavat çevirər günahsız əllər,
Savabla yoğrular işlər, əməllər.
Bar verər ağaclar, baş açar güllər,
Sevinər bülbüllər, ötər, inşallah!

Əbülfət, qəm yemə, gələr zamana,
Belə müşkül işlər çıxar asana.
Yön çevir dərgahi-Şahi-mərdana,
Əlin ətəyinə yetər, inşallah!

## *GƏRAYLILAR*

## BÜLBÜL

Nə bezibsən şirin candan,
Tökürsən qan-yaşı, bülbül!
Belə gəlib əzəl gündən
Bu dünyanın işi, bülbül!

Heç olmadım şadü xürrəm,
Ciyərimə doldu vərəm.
Sən ol Leyli, mən də Kərəm,
Gəzək dağı-daşı, bülbül!

Qul Əbülfət, haqqı çağır,
Sözlərin getməsin ağır.
Bəndəsində mənəm fağır,
Quşda: yazıq quşu-bülbül.

## EY FƏLƏK

Bu dərd məni tez öldürər,
Çoxdu azarım, ey fələk!
Kəsilibdi tabü təvan,
Səbrü qərarım, ey fələk!

Çalışdım, itdi əməyim,
Qəbula keçmir diləyim,
Yuxladı arxam, köməyim,
Yandı ciyərim, ey fələk!

Mənim adım Əbülfətdi,
Dərdim dillərdə söhbətdi,
Sözüm dürdü, zəbərtəcdi,
Yoxdu xirdarım, ey fələk!

## KÜLƏK, MƏNDƏN XƏBƏR APAR

Sərin-sərin əsən külək,
Külək, məndən xəbər apar.
Diyar-diyar gəzən külək,
Külək, məndən xəbər apar.

Gözü yolda qalanlara,
Əhdə vəfa qılanlara,
Üzü haqqa olanlara
Külək, məndən xəbər apar.

Yalvarmaqdan gəldim cana,
Əbülfəti qoyma yana.
Götür kiçik bir nişana,
Külək, məndən xəbər apar.

## MƏNİM

Yaman düşdü eldən-elə,
Daşım mənim, daşım mənim.
Nələr çəkdi gələ-gələ,
Başım mənim, başım mənim.

Qəm dəryası ləpələndi,
Dərdim artdı, təpələndi,
Diyar-diyar səpələndi
Huşum mənim, huşum mənim.

Əlif qəddim yaya döndü,
Gözüm yaşı çaya döndü,
Yaman ahü vaya döndü,
İşim mənim, işim mənim.

Qul Əbülfət günahkardır,
İşi-gücü ahü zardır.
Dörd fəsilə barabardır
Qışım mənim, qışım mənim.

## OLAYDI

A yoldaşlar, a qardaşlar,
Son günümüz ağ olaydı.
Deyib, gülüb, danışaydıq,
Damağımız çağ olaydı.

Fələk bir dövran quraydı,
Könlümdən xəbər verəydi.
Məxluqat xoş gün görəydi,
Ürəklər yumşaq olaydı.

Qoyun-quzu çöldə yata,
Örüş malı güclə tuta.
Bağ-bostanda inci bitə,
Bir kökdə yüz tağ olaydı.

Yeyib-içib gəzdiyimiz,
Şəhdi-şəkər əzdiyimiz,
Süd göləndə üzdüyümüz
Gah aran, gah dağ olaydı.

Çəkiləydi çiskin, duman,
Sevinəydi qoca, cavan.
Dünya cənnət olan zaman
Əbülfət də sağ olaydı!

## *TƏCNİSLƏR*

## GÜLDÜ, NƏ GÜLDÜ

Bu dərdli çağımda, qəm yığnağında,
Mehrindən açılan güldü, nə güldü.
Sən məni Məcnundan betər ağlatdın,
Düşmənlər üstümə güldü, nə güldü!

Gəl haqqı nahaqdan ara, di baxtım!
Dost ürək mətləbin aradı, baxdım.
Aralıq biilqar aradı, baxdım,
Yar nə bir danışdı, güldü, nə güldü?

At tiri-xədəngin, yar, ala gözdən,
Bu sınıq könlümü yarala gözdən.
Əbülfət doymasa, yar, ala gözdən,
Bülbül nə bülbüldü, güldü, nə güldü!?

## NƏ SAQİSƏN, YAR

Könül məclisində bir sultan kimi
Durubsan qəsdimə nə saqisən, yar!?
Gahdan bir şirinsən, gahdan bir acı,
Gah da heç bilmirəm, nə saqisən, yar!

Xəstəyəm, bu dərdə nəsə qalmışam,
Nə ölüb, nə itib, nə sağalmışam.
Günahkar bir qulam, nəsə qalmışam,
Yetirmə nasaqı, nasaqisən, yar!

Könlüm pərişandı, nə dağı dağdı,
Bimürvət dünyada, nə dağı dağdı.
Əbülfət, yolunda nə dağı dağdı,
Xəstəyəm, dərmanı nə saqisən, yar!

## *DİVANİLƏR*

### ÜSTƏDİ

Ey fələk, sən bilirsən
Kəmim ümman üstədi;
Yel vurur, qəhr eyləyir,
“Allah, aman!” üstədi.
Birillahım, insaf eylə,
Qoca-cavan qalmadı;
Meyitləri qan axıdır,
İnsan insan üstədi!

Nə qədər bağ salasan,
Yenə barsız dünyadı.
Al geyib cavan qalan
Yaman arsız dünyadı.
Kimsəyə sirr verməyən
Etibarsız dünyadı;
Sirrindən baş çıxarmaz
Kim ki, güman üstədi.

Yer üzü odlanıbdı,
Bir qiyamət görünür.
Fələyin qarğışıdı,
Yüz cür afət görünür.
Xaliqim, yoxsa sənə
Bu, zarafat görünür;
Quluna şəfa yetir,
Əbülfət can üstədi.

## EY ƏMİ

Mən fələkdən gileyliyəm
Əzəl başdan, ey əmi!
Gözlərimdə nur qalmadı
Axan yaşdan, ey əmi!
Bayquşların bayramıdı
Dünya binnət olandan;
İnsan oğlu cana gəldi
Boş təlaşdan, ey əmi!

Vəsiyyətim səndə qalsın
Əhdi-peyman eşqinə.
Allah özü sirr açmayıb,
Açma, Quran eşqinə!
Uçurmuşam könül quşun
Sirri-sübhan eşqinə;
Gözləyirəm mətləbimi
Qara daşdan, ey əmi!

Müxtəsəri, mən də deyim,
Çoxdu küsən dünyada;
Bəxtinə qane olub,
Varmı susan dünyada!?
Dərdü qəmə mübtəladı
Ağlı kəsən dünyada;
Əbülfətin ağlı çaşıb,
Gedib huşdan, ey əmi!



**AŞIQ CAHAD**
(1917-2013)

Cahad Camal oğlu Nağıyev 1917-ci ildə Göyçə mahalının Böyük Qaraqoyunlu kəndində anadan olmuşdur. Cahad gənc yaşlarından aşıqlıq sənətinə həvəs göstərmişdir. O, həmkəndlisi Aşıq Əsədin yanında üç aydan artıq şəyirdlik etmiş, sonra isə Ağkilsəli Aşıq Nəcəfin himayəsi ilə bir aşıq kimi yetişmişdir.

Aşıq Cahad 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində əsgəri xidmətdə olmuş, ağır döyüşlərin birində sol əlindən yaralanmışdır. Cəbhədən qayıtdıqdan sonra yenə də sazını götürüb, müqəddəs sənətini uğurla davam etdirmişdir. Onun şeir yazmaq qabiliyyəti də vardır.

1988-ci ildə ermənilərin törətdikləri milli ixtilafla əlaqədar olaraq, Cahad da doğma yurdu tərk etməyə məcbur qalmış, Şəmkir rayonunun Çənlibel kəndində məskunlaşmışdır.

Aşıq Cahad 3 iyun 2013-cü ildə vəfat etmiş və Çənlibel kənd qəbiristanlığında dəfn olunmuşdur.

## *QOŞMALAR*

## BİLİNMƏZ

Bir sirri-xudadı, bilin, bu dünya,
Nə tarixi, nə də yaşı bilinməz.
Bu gün qan ağladan sabah qan ağlar,
Bu çarxı-fələyin işi bilinməz.

Gündüz işıq olub külli-kainat,
Gecələr aləmə çökür zulumat.
Deyirlər qopacaq bir gün qiyamat,
Nə baharı, nə də qışı bilinməz.

Adam var, hər yerdə öyər özünü,
Adam var, məclisdə bilmir sözünü.
Aşıq Cahad deyər sözün düzünü,
Dar günə düşməmiş kişi bilinməz.

## GÖYÇƏ

Yenə ermənilər azdı, qudurdu,
Dağıldı, çapıldı, talandı Göyçə.
Beş günün içində kimsə qalmadı,
Elə bil, yox imiş, yalandı Göyçə.

Dövlətdən bu dərdə olmadı çara,
Qaçqınlar düşdülər borana, qara,
Ələ keçənləri çəkdilər dara,
Nahaqdan qanlara bulandı Göyçə.

Cahad, şərəflidi adı Göyçənin,
Getməz ağızlardan dadı Göyçənin,
Sönməz ürəklərdən odu Göyçənin,
Boşalıb, yenə də dolandı Göyçə.

## HANI

Göyçəyə baş çəkir Ələsgər ruhu,
Deyir bu mahalın elləri hanı!?
Qaratikan kök salıbdı bu yerdə,
Bəs mənim ətirli güllərim hanı!?

Miskin Abdal, Seyid Bayram ocağı,
İndi o yerlərdə yurd salıb yağı.
Mənim ürəyimin alovlu çağı,
Bayatı dediyim dillərim hanı!?

Aşıq Əsəd "cəngi" çalmır Göyçədə,
Dost-qohumlar qonaq qalmır Göyçədə,
Bir-birini yada salmır Göyçədə,
Ot basıb cığırı, yollarım hanı!?

Məşəd İsa haray salmır, hay vurmur,
Kalvay Miri, Qaçaq Cəmil qıy vurmur.
Cahadam, ağlaram, ürəyim durmur,
Qırılıb qanadım, qollarım hanı!?

## MƏNİM ÜÇÜN

Ay vəfalı dilbər, gəl gedək bizə,
Mən çalım həvəslə saz, sənin üçün.
Mənim məhəbbətim sənə bağlıdı,
Sənin məhəbbətin az, mənim üçün

Dişlərin mirvarı, ləblərin püstə,
Mən sənin dərdindən olmuşam xəstə.
Bir ləhzə başımı al dizin üstə,
Hərdən-hərdən elə naz, mənim üçün.

Sərvi qamətinə vurulmuşam mən,
Büllur sular kimi durulmuşam mən,
Cahadam, çox gəzib, yorulmuşam mən,
Qoynun içi cənnət, yaz, mənim üçün.

## KİMİ QAN AĞLAYIR, KİMİ KEF ÇƏKİR

Kimi qan ağlayır, kimi kef çəkir,
Bilmirəm, bu fələk nə həvəsdədi.
Soylayıb qılıncı, alıb əlinə,
Məqamdı, başımı kəsəkəsdədi.

Tacirəm, mətahım dünyanın qəmi,
Heç pərgar olmadı içimin çəmi.
Daima nizamdı könlümün simi,
"Kərəmi" kökdədi, "Dilqəm" üstədi.

Mən Aşıq Cahadam, dost yorğunuyam,
İlqar qədəhinin tam dolğunuyam.
Elə vurulmuşam, el vurğunuyam,
Eldən ötrü hey qulağım səsdədi.

## BİLMİRƏM

Vətən çox şirindir, çıxmaz yadımdan,
Qırılıb qanadım, uça bilmirəm.
Sərgərdan qalmışam sahibsiz yerdə,
Sirrimi yadlara aça bilmirəm.

Urus zərbə vurdu Azərbaycana,
Dığalar əlindən yetmişik cana.
Köç-köç oldu, hərə düşdü bir yana,
Burdan özgə yerə qaça bilmirəm.

Aşıq Cahad el oduna yanandı,
Laçın, Şuşa, Kəlbəcərim talandı.
Açar Yelsindədi, qalan yalandı,
Bağlayıb qapını, aça bilmirəm.

## *GƏRAYLILAR*

### OLUR

Qocalanda insanların,
Başında yüz xəyal olur.
Qanmazın dərdini qanan
Çəkəndə, başı çal olur.

Uşaqlar baxmır sözümə,
Hərdən vururam dizimə.
Arvad qayıdır üzümə,
Görən pərişan hal olur.

"Cahad, bəs, qazancın hanı!"
Danlayır mən binəvanı.
Paltardı arvadın canı,
Alanda, dili lal olur.

## DƏRD ÇƏKMƏKDƏN QOCALMIŞAM

Dərd çəkməkdən qocalmışam,
Daha dərdə dözəmmirəm.
Xocalıda, Xankəndində,
Mən Şuşada gəzəmmirəm.

Dağılıbdı obam, elim,
Bağlanıbdı mənim yolum,
Lal olubdu daha dilim,
Doğru sözü yazammıram.

Tağ yatıb, solubdu bostan,
Xəbər yox qohumdan, dostdan.
Cahadam, bağlaram dastan,
Dərya dərin, üzəmmərəm.

## BİR İL, BİR İL

Dostları qəmli görəndə,
Qocalıram bir il, bir il.
Gözləri nəmli görəndə,
Qocalıram bir il, bir il.

Ürəyimdən nələr keçir,
Sərraf ləlü gövhər seçir.
Ömür zəmi, dəryaz biçir,
Qocalıram bir il, bir il.

Mən Cahadam, baxtı qara,
Tapılmır dərdimə çara.
Düşmüşəm qürbət diyara,
Qocalıram bir il, bir il.

## *TƏSNİS*

## BİR YARA MƏNİ

Sirdaşım yox, sirr sözümü söyləyəm,
Pünhandan incidir bir yara məni.
Naşı təbib gətirməyin üstümə,
Kamil cərrah gərək, bir yara məni.

Qürbət eldə tikdirmişəm bir qala,
Nahaq yerdən, mən də düşdüm bir qala.
Yaxşı dostun ocağını bir qala,
O səndən istəsin bir yar əməni.

Aşıq Cahad, söylə sözün bir aya,
Oxumamış nə bilirsən bir aya,
İnsan oğlu yol salıbdır bir aya,
Tut qolumdan, tapşır bir yara məni.



# AŞIQ ƏLİ
(1927-1990)

Aşıq Əli Aşıq Ələsgərin qardaşı Məşədi Salahın nəvəsidir. O, 1927-ci ildə Göyçə mahalının Zərzibil (Zərkənd) kəndində anadan olmuşdur.

Gənc yaşlarından aşıq sənətinə böyük maraq göstərən Əli uzun müddət Aşıq Talıb və Aşıq Nəcəfin yanında şəyirdlik eləmiş, el arasında kamil bir aşıq kimi tanınmışdır. O da öz növbəsində bir çoxlarına ustadlıq eləmiş, saz sənətinin incəliklərini onlara öyrətmişdir. Hamının yaxşı tanıdığı, sazın füsunkar sədaları ilə bülbülü dilə gətirən Aşıq Ədalət Nəsibov da Aşıq Əlinin şəyirdlərindəndir.

Aşıq Əlinin ailəsi 1942-ci ildə Göyçədən köçüb, Goranboy rayonunun Qızılhacılı kəndinə gəlmiş, bir müddətdən sonra isə Naftalan şəhərinə gələrək orada məskunlaşmışdır.

Aşıq Əli 1970-ci illərdə al-ver üstündə günahlandırılaraq, həbsə alınmış, bir neçə il əzab-əziyyətə məruz qalmışdır. Onun şeirlərinin bir qismi bu işgəncədən yaranan ah-nalənin bədii ifadəsidir.

Aşıq Əli gənc yaşlarından şeir yazmağa başlamışdır. Aşıq Əli 1990-cı ildə Naftalan şəhərində vəfat etmişdir.

## *QOŞMALAR*

## AY HƏKİM

Ağlı az olana gün qara olar,
Günahkaram mənim özüm, ay həkim!
İstəyirəm qələm alıb əlimə,
Dərdimi mən sizə yazım, ay həkim!

İxtiyarım yoxdu, onu qanıram,
Bəlalı canımdan çox usanıram.
On beş gündür, qızdırmadan yanıram,
Özün söylə, necə dözüm, ay həkim!?

Baxtınızda küllü ixtiyar olsun,
Şəfalı əliniz daim var olsun!
Şahlar şahı sizə daim yar olsun!
Eşidilsin bu avazım, ay həkim!

Gödəldib dilimi bax bu dar zindan,
Məni məhv elədi bivəfa zaman.
Sənin şərəfinə deyərdim dastan,
Əlimdə olsaydı sazım, ay həkim!

Gör mən nələr əkdim, bitdi, nə dərdim?
Əliyəm, ayrılıq, möhnət becərdim.
Olmazdı fikirim, nə də ki dərdim,
Yadigar qalsaydı sözüm, ay həkim!

## ƏMOĞLU

Düz deyir ki, bu qəzanın toruna
Özüm düşdüm bilə-bilə, əmoğlu!
Qapını bağlayan açar deyirlər,
Mən də gözləyirəm hələ, əmoğlu!

Qismət olsa, kim ki girib qəsdimə,
Alışaram, o kor olar tüstümə.
Şahlar şahı nəzər salsın üstümə,
Görüşərik gülə-gülə, əmoğlu!

Əlini görməsin kimsə bu gündə,
Hər kəs arzusuna yetsin evində.
Otuz il dolandım toyda, düyündə,
İndi də olmuşam belə, əmoğlu!

## GEDƏKMİ

Ömür-gün yoldaşım, ay can sirdaşım,
Hirsin soyuyubsa, daha gedəkmi?
Yaş ötüb yarıdan, ağarıb başım,
Düşərsən qarğışa, aha, gedəkmi?

Bahar ömrüm düşüb borana, qara,
Sənsizəm, günlərim hey keçir qara.
Altmışından sonra çıxıb bazara,
Satma mətahını baha, gedəkmi?

Uşaqtək kövrəlib oldum birtəhər,
Mənə həmdəm oldu qüssə, qəm, kədər.
Yalvarıram imamlara hər səhər,
Üz tuturam qibləgaha, gedəkmi?

Dolaşıb gəzsən də sən oymaq-oymaq,
Çətin olar köhnə ilqardan doymaq,
Əldən düşmüş bu qocanı tək qoymaq
Ağır gedər bir Allaha, gedəkmi?

Əli, umudunu gəl kəsmə haqdan,
Özünü incidib, yorma nahaqdan.
Uzun aylar keçdi bu ayrılıqdan,
Göz dikmişəm bu sabaha, gedəkmi?

## SƏNSİZ YAMAN DARIXMIŞAM

Üç ay on gün keçdi görüşümüzdən,
Sənsizlədim, sənsiz yaman darıxdım.
Müştərisiz qalan dəyirman kimi
Dənsizlədim, sənsiz yaman darıxdım.

Bu sirlər agahdı qadir-sübhana,
And içirəm haqqa, dinə, ərkana.
Bu aləmdə dönüb Şeyx Sənana,
Dinsizlədim, sənsiz yaman darıxdım.

Əliyəm, ox oldum namərd yayında,
Mürvət olmaz nanəcibdə, xayında.
İsinə bilmədim bu yay ayında,
Günsüzlədim, sənsiz yaman darıxdım.

## YERİNDƏDİ

Vəfasız deyiləm, nazlı mələyim,
Mən sənə verdiyim söz yerindədi.
Səndən ayrılalı üzüm gülməyib,
Özgəyə baxmayıb, göz yerindədi.

Hansı səmtə, hara düşsə güzarım,
Çıxmırsan yadımdan, a nazlı yarım!
Səninlə etdiyim əhdim, ilqarım
Bir ara qəlbimi, öz yerindədi.

Havadarın olsun qadiri – sübhan!
A gözləri yolda, halı pərişan.
Səni öz canıtək çox sevir canan,
Aşıq Əli, səbr et, döz, yerindədi.

## *GƏRAYLILAR*

## AĞRIMA, CANIM, AĞRIMA

Böyük Allahın eşqinə,
Ağrıma, canım, ağrıma.
İrəhm eylə mana hələ
Ağrıma, canım, ağrıma.

Könül həzin çalan neydi,
Tutqunlaşıb başım, keydi.
İnsaf, mürvət yaxşı şeydi,
Ağrıma, canım, ağrıma.

Nə gizlədim, niyə danam,
Az qalıram oda yanam.
Nə atam var, nə də anam.
Ağrıma, canım, ağrıma.

Yazılmamış yazım qalıb,
Ürəyimdə sözüm qalıb,
Körpə oğlum, qızım qalıb,
Ağrıma, canım, ağrıma.

Mənə eləyib zülümü,
Tez-tez göstərmə ölümü.
Gözləyənim var yolumu,
Ağrıma, canım, ağrıma.

Qış dolanıb, indi yazdı,
Aşıq Əli dərdin yazdı.
Arzu çoxdu, zaman azdı,
Ağrıma, canım, ağrıma.

## BƏS NEYLƏSİN

Bu günümdə nazlı yarım
Ağlamasın, bəs neyləsin?
Qan veribdi yaralarım,
Bağlamasın, bəs neyləsin?

Qürbət elə gedir yarı,
Çox çəkəcək intizarı.
Al yerinə qaraları
Bağlamasın, bəs neyləsin?

Salar Əlinin bəhsini,
Ağlar, çıxarmaz səsini,
Qəm oduna sinəsini
Dağlamasın, bəs neyləsin?

## MƏNİM

Nə deyim, nə danışım mən,
Qurtarıbdı sözüm mənim.
Hər yetənə dost deməkdə
Günahkaram özüm mənim.

Qəmi-möhnət qəddim əydi,
Tutqunlaşıb başım keydi.
Namərdləri görməyəydi,
Kor olaydı gözüm mənim.

Ürəyimə qüssə dolub,
Ona görə rəngim solub.
Könlüm kimi dustaq olub,
Daha çalmır sazım mənim.

Yenə kəməndə ilişdim,
Hər kəsi tanıdım, seçdim.
Əliyəm, borana düşdüm,
Çox sərt gəldi yazım mənim.

## OLMASA

Sözlərini söylə mənə,
Alan xiridar olmasa.
Heç kimsədən əlac yoxdur,
Şahlar şahı yar olmasa.

Vəfalı ol bu dünyada,
Ləkə vurulmasın ada.
İlqar-iman gedər bada,
Namus, qeyrət, ar olmasa.

Aşıq Əli söyləsin bil:
Dünya bizə qalan deyil.
Fəğan etməz şeyda bülbül,
Gül üstündə xar olmasa.

## ŞÜKÜR OLSUN

Azadlığın iyisini
Duydum, daha şükür olsun!
Yerə, göyə, ərşə, kürsə,
Şəmsə, maha şükür olsun!

Sirlər ürəkdə xəlvətdi,
Haqqın özü ədalətdi.
Həm əymişdi, həm düzəltdi,
Hər sabaha şükür olsun!

Belə ağa görməmişəm,
Zikr etməkdir mənim peşəm.
Bir adı Şahi-Qəşəmşəm,
Yadullaha şükür olsun!

Əgər düşüb yansam oda,
Sığınmışam min bir ada.
Nəzər salsa çatan dada,
Qibləgaha şükür olsun!

Üz çevirib getsin hara,
Əli, sığın kirdigara.
Ondan başqa yoxdu çara,
Bir Allaha şükür olsun!

## *TƏCNİSLƏR*

## BİRCƏ ÜZ MƏNƏM

Dönmərəm sözümdən, düz ilqarımdan,
Belə doğulmuşam, bircə üz mənəm.
Dostluğun ən gözəl nemətlərindən
Ölərəm, əlimi bircə üzmərəm.

Ehtiyatlı dolan, açma dər yada,
Bağça mənimkidi, iylə, dər ya da.
Bivəfa, biilqar üzən dəryada,
Alova yanaram, bircə üzmərəm.

Dost bilmişəm mən özümə Kamalı,
Ağlı olan bu dünyadan kam alı.
Azalıb Əlinin ağlı, kamalı,
Təcnisi yazmağa bircə üz mənəm.

## NARA CANIMI

A bimürvət, niyə haqsız, günahsız
Yandırdın ataşa, nara canımı?
Çarxı-fələk, səndə bu nə adətdi,
Həsrət qoydun bir cüt nara canımı.

Pünhan durub, çəkilirsən nə yana?
Qoyma canım nə alışa, nə yana.
Arzulayıb dilin mana nəyi ana?
Nə yoxla qəlbimi, nə ara canımı.

Aşıq Əli, üzünü tut canana,
Adətdir ki, canı gərək can ana.
Xəstəyəm, gözlərim gəzir canana,
Aram etmir çəksəm nara canımı.

## YARA MƏN

Bivəfa, nainsaf, ay zalım dünya,
Səndən aldım çox sağalmaz yara mən.
Mənim ahü naləm ərşə dayanar,
Xeyir görməz ləblərindən, yar, əmən.

Yaxşı canı gərəkdir ki, can ana,
Xəstə sızıldayar deyər: ”Can, ana!”
Bu gündə ki əlim çatdı canana,
Şükür haqqa, gərək oldum yara mən!

Naşı bağban gülü bağdan dərdimi,
Aşıq Əli, o görünən dərdimi?
Ürəyimdən atmaq üçün dərdimi
Sığınmışam böyük olan yara mən.

## *DİVANİLƏR*

## BU GÜNDƏ

Bir nəzər sal, şahlar şahı,
Yetiş dada bu gündə;
İrəhm eylə mən fağıra,
Çat imdada bu gündə;
Qürbət eldə fikir məni
Üzüb, əldən salıbdı,
Ömrüm hicranlar qoynunda
Gedib bada bu gündə.

Vətənimdən cida düşdüm,
Necə dözüm bu dərdə;
Tab gətirmir canda canım,
Yoxdu sözüm bu dərdə;

Kərəm kanı, bir səbir ver,
Dözüm özüm bu dərdə;
Sidqi-dilnən sığınmışam
Min bir ada bu gündə.

Yaxşıların bu dünyada
Gərək olmasın nəsi;
Alçaqların, namərdlərin,
Görüm kəsilsin səsi;
Zaman elə dəyişib ki,
Seçmək olmur heç kəsi;
Sirr vermək çox çətinləşib
Dosta, yada bu gündə.

Haqq işini başa düşməz
Hər yaranan, hər insan;
Geri qaytarmaq çətindi,
Nə yazılıb binadan;
Ah, nə deyim bu gərdişə,
Əzab çəkir dərd qanan;
Az-az dəyir gözə, qardaş,
Halalzada bu gündə.

Bu halımdan yox bir kəsin,
Bilirəm ki, xəbəri;
Düşünəndə az qalıram,
Olum dəli, sərsəri;
Aşıq Əli gecə-gündüz
Gözəl keçən günləri,
Sızıldayıb qəmli-qəmli
Salır yada bu gündə.

## ƏCƏM QIZI

Mən yanıram eşq oduna,
Sən də yan, əcəm qızı!
Söyləyirəm mətləbimi,
Eşit, qan, əcəm qızı!
Mən ki səndən dönməyəcəm,
Əgər sən məndən dönsən,
Qənim olsun sənə ilqar,
O iman, əcəm qızı!

Göz görəndə gül camalın,
Ürək alışır nara;
A bimürvət, insafa gəl,
Bu gündə yetiş kara.
Çarxı-fələyin sitəmi
Günümü edib qara;
İrəhm eylə, sən dərdimə
Ol dərman, əcəm qızı!

Axı bizəmi qalıbdı
Dünyanın qəhri-qəmi!?
Səfa sürək, gün keçirək,
Ol Əlinin həmdəmi;
Zaman ötər, yaş çoxalar,
Gedər cavanlıq dəmi;
Bil ki, bir də ələ düşməz
Bu dövran, əcəm qızı!



**AŞIQ İSMAYIL MAHİR**
(1928-1995)

İsmayıl Bahan oğlu Nağıyev 1928-ci ildə Göyçə mahalının İnəkdağı kəndində anadan olmuşdur. Uşaq yaşlarından ata-anasını itirən İsmayılı Gəncə şəhərində yaşayan böyük bacısı Zivər 1940-cı ildə öz yanına aparmış və ona hər cür qayğı göstərmişdir.

Gəncə şəhərində tez-tez aşıq məclislərinin iştirakçısı olan İsmayılda bu sənətə maraq oyanmış, saz çalmağı, oxumağı öyrənməyə başlamış, sonralar isə Aşıq Talıbın, Aşıq Nəcəfin yanında bir neçə il şəyirdlik edərək, bir aşıq kimi təkmilləşmişdir.

Aşıq İsmayıl gənc yaşlarından şeir yazmağa həvəs göstərmişdir. Onun əldə edilmiş şeirləri içərisində qoşmalar daha geniş yer tutur. Onun "İsmayıl və Qəmzə" adlı bir dastanı da var. Şeirlərinin bir çoxunda "Mahir" təxəllüsünü işlətmişdir.

Aşıq İsmayılın əlindən saz bağlamaq da gəlirdi.

Aşıq İsmayıl 1995-ci ildə Gəncə şəhərində vəfat etmişdir.

## *QOŞMALAR*

### ELLƏR

İnsan düz dolanar, doğru danışar,
Özünə düzlüyü bir adət eylər.
Vicdanı ləkəli, xain baxışlı,
Eldə öz-özünə xəcalət eylər.

İnsanların qəlbi yaranıb şüşə,
Xoş üzlə halını soruş həmişə.
Hədyanı eyləmə özünə peşə
El səni qınayar, məzəmmət eylər.

Qazan hörmətini var ikən fürsət,
Xainə, xəbisə edərlər nifrət.
Çalış, öyrənəsən kamil bir sənət,
Əməlin özünə zəmanət eylər.

Tamahına əsir olub, göz açma,
Nanəcibə nəsihətdən söz açma.
İsmayıldan nə utanma, nə qaçma,
Sənə doğru yolu əmanət eylər.

### GETDİ

O şeir sərrafı, söz sənətkarı,
Ağlatdı elləri, hər yanı, getdi.
Sazımın, sözümün ustadı Nəcəf,
Könlümün istəyi, həyanı getdi.

Yayıldı ellərə bu acı xəbər,
Aldı ürəyimi acı qəm-kədər.
Sanki bu gün öldü Aşıq Ələsgər,
Dillərin söhbəti, dastanı getdi.

Həsrəti sinəmi dağlamazmı bəs!?
Yaralı sinəmi oxlamazmı bəs!?
Göyçə yasa batıb ağlamazmı bəs!?
Ağır məclislərin ürfanı getdi.

İsmayıl Mahirin hanı ustadı?!
Qövr etdi yarası, sındı qanadı.
Dilinin əzbəri, ağzının dadı,
Dərdinin çarəsi, dərmanı getdi.

***1968-ci il***

## İTİRMƏK ASANDIR, TAPMAQ ÇƏTİNDİR

Təmiz bir ürəyi, bir saf vicdanı,
İtirmək asandır, tapmaq çətindir.
Ömürdən mənalı keçən hər anı
İtirmək asandır, tapmaq çətindir.

Arifsənsə, dərk eylə bu dünyanı,
Yüz illər yaşamış babalar hanı!?
Bir vəfalı yarı, bir sağlam canı
İtirmək asandır, tapmaq çətindir.

Qazanıb yığsan da külli daş-qaşı,
Yavaş sür atını, bir az yavaşı.
Atanı, ananı, dostu, qardaşı,
İtirmək asandır, tapmaq çətindir.

Öz əməlin yaxşı qursun taxtını,
Bacarsan, firavan keçir vaxtını.
Gənclik illərinin ilkin baxtını
İtirmək asandər, tapmaq çətindir.

Səndə olmasa da dünyanın varı,
Unutma namusu, tərk etmə arı.
İsmayıl Mahirtək bir sənətkarı
İtirmək asandır, tapmaq çətindir.

## OLMAZ

Aşıq Mahir aldı, görək nə dedi:
Gözü qamaşdıran hər şey zər olmaz.
Qoşun sərkərdəsi ər ola bilsə,
Onda qorxu bilən bir əsgər olmaz.

Axtarsan dünyanı tamam sərasər,
Nadana heç zaman söz etməz əsər.
Çoxları dəmiri əridər, kəsər,
Nə fayda, dəmirçi, ya misgər olmaz.

Dastanım sizlərə qalsın əmanət,
Sazıma, sözümə verin zəmanət.
Hər dahi Nizami, hər şair Səməd,
Hər saz götürəndən Ələsgər olmaz.

## SAZDA YAŞAYIR

Hələ köhlənməyib bu sədəfli saz,
Babamın hikməti sazda yaşayır.
Ölməz iyidlərin, qəhrəmanların
Hünər hekayəti sazda yaşayır.

Hünərdən söz açıb hər bir pərdəsi,
Ellərə car edib azadlıq səsi.
O qoç Koroğlunun ölməz nərəsi,
Babəkin qüvvəti sazda yaşayır.

Abbasın, Alının, Aşıq Qurbanın,
Dahi Ələsgərin, Novrəs İmanın.
Şəmşirin, Talıbın, Hüseyn Cavanın
Ölməz söz sənəti sazda yaşayır.

Açıb kitabını keçmiş aləmin,
Dərmanı olubdur hər dərdin, qəmin.
Leylinin, Məcnunun, Əsli, Kərəmin
O saf məhəbbəti sazda yaşayır.

Dadıb acısını ötən zamanın,
Verib qiymətini yaxşı-yamanın.
Hər gəlinin, qızın, əziz ananın
Həyası, isməti sazda yaşayır.

Tamahı olmayıb elin varında,
Bilib öz qədrini, dostun, yarın da;
Böyük dahilərin, ataların da
Sözü, nəsihəti sazda yaşayır.

Sənət gülşənindən min çiçək dərir,
Nəğmə bəstələyir, ruha dad verir.
Döyüşdə igidə qol-qanad verir,
Xalqın əzəməti sazda yaşayır.

Əsəndə üstündə hicran yelləri,
Arxada qoymuşdur ağır illəri.
Mahir, daim dindir polad telləri,
Sənətin qüdrəti sazda yaşayır.

## *GƏRAYLILAR*

### DAĞLAR

Tilisimli gədikləri,
Könül istər aşa, dağlar!
Təbiət vurub boyasın,
Hər qaya, hər daşa, dağlar!

Eşq əsəri var başımda,
Ürək yanır ataşımda,
Yoxdur bircə qardaşım da,
Mənlə gəzə qoşa, dağlar!

Gəl pozmayaq düz ilqarı,
Var Mahirin intizarı,
Dərdimi tən bölək yarı,
Mənimlə çək qoşa, dağlar!

### OLSUN

El-obada gəzən aşıq,
Qoy, kamalın dərin olsun.
Könüllərin sazını çal,
Ürəklərdə yerin olsun.

Sənətində sən ol mahir,
Sözü-söhbəti cavahir.
Tarixləri oxu bir-bir,
Dastanlar əzbərin olsun.

Mən demirəm yüz bilginən,
Bildiyini düz bilginən,
Ləl qiymətli söz bilginən,
Sinən də dəftərin olsun.

Sən ey, el sazını çalan,
Dilinə gəlməsin yalan,
Sənət dəryasına dalan,
Qiymətli gövhərin olsun.

Qəvvas deyil üzdə üzən,
Doğru sözdən olma küsən.
İsmayıldan nə inci sən,
Nə də aran sərin olsun.

## *TƏCNİSLƏR*

### ATA ÇATMADIM

Deyirlər ulaq min ata çatınca,
Ha sürdüm ulağı, ata çatmadım.
Ulaq yük üçündür, at minmək üçün,
Ulağın yükünü ata çatmadım.

Yön çevir düz haqqa, sən elə yalvar,
Aşa bilmədiyin sən elə yal var,
Sən elə arxalan, sən elə yalvar,
Deməzsən, arzuma, ata, çatmadım.

Dərs alım, öyrənim halaldan qanım,
Sən nə qandın, mən də ha laldan qanım!?
Mahirəm, var bir mərd halaldan qanım,
Namərdin adına "ata" çatmadım.

### ELƏ DAĞAM MƏN

Yurdumun əbədi ağ günləri var,
Qardaşdan sinəsi elə dağam mən.
Əriyib süzgəcdən saf süzülmüşəm,
Daha ərimərəm, elə dağam mən.

Sən elə gözəlsən, elə gözəlsən
Vətənə yaraşıq, elə gözəlsən.
Nə eləsən mənə, elə, gözəl, sən,
Dözərəm dərdinə, elə dağam mən.

Mahirəm, yazanam, yaradanam mən,
Bir sirrim qalmayıb yara danam mən,
Qürbətə düşəndə, yar ad anam mən,
Vətəndə həmişə elə dağam mən.

## *MÜXƏMMƏSLƏR*

### GÖZƏL

Mən səni görməmişdim,
Sən hara, mən hara, gözəl!
Taleyin öz hökmü var,
Qismətini ara, gözəl!
Gəl, uymayaq bu həyata,
Dövlətə, nə vara, gözəl!
Sən gülsənsə, mən bülbüləm,
Həmdəm olma xara, gözəl!
Düz ilqardan dönməyək biz,
Çəksələr də dara, gözəl!

Gəl, biz də bir həyat quraq,
Şirindir həyatın tamı;
Sevilməyin dövranı var,
Əhli-hallar bilir hamı.
İçək eşqin piyaləsin,
Başlayaq toyu, bayramı;
Həyatda yaradaq, quraq,
Bu dövrandan alaq kamı;

Seyr eləyək ana yurdu,
Çıxaq bu dağlara, gözəl!

Şirin kimi könül bağla
Dağlar çapan bu Fərhada;
Səni sevib, bu cismimi
Salmışam bir yanar oda;
Səyyadınam, şikarımsan,
Ovlamışam bu səhrada;
Ellər gəzib görməmişəm,
Heç bir gözəl sən simada;
İsmayılam, atəşinə
Yanıram aşkara, gözəl!

## QARA GÖZ

Gəzdim tamam el-obanı,
Sevdim səni, ay qara göz!
Həyatıma bərabərsən,
Mələklərə tay qara göz!
Aralı gəzmə,
Ürəyim əzmə,
Yad göldə üzmə,
Qaş-gözü süzmə.
Uzaq eldənəm,
A nazlı sənəm.
Qaymaq dodaqsan,
Demədin bir əm.
Cismimi yandırma oda,
Qəm yetirmə, gəl, Fərhada.
Səndən ayrı keçən günü
Etmə ömrə say, qara göz!

Eşqindən mən divanətək,
Dolanıram diyar-diyar.
Sevdim səni, getdi könül,
Nə qalmadı bir ixtiyar.
Zülfü pərişan,
Halım soruşan,
Bil, həsrətindən
Mənəm alışan.
Cismi çıraqsan,
Məndən qaçaqsan.
Olum bağbanın,
Nemətli bağsan.
Adına bağlayım dastan,
Atəşimə gəl, sən də yan.
İnsaf eylə, qızardı dan,
Ey gözəl humay qara göz!

Gözəllərdən bəyənmişəm
Sənin kimi sərvinazı.
Aşiq sənin aşiqindir,
Sevgin ilə dindir sazı.
Üzü bəyazım,
Tərifin yazım.
Gözəl hüsnünə
Var xoş avazım.
Gəl gülüstana,
Sən düş dastana.
Gözəl bəzəksən
Azərbaycana.
Seyr edək bəhri-Xəzəri,
Açılmış sinən dəftəri.
Sən gözəli bu Mahirə
Həyat verib pay, qara göz!



## AŞIQ İMRAN
(1928-1999)

Aşıq İmran Mehralı oğlu Həsənov 1928-ci ildə Göyçə mahalının Ağbulaq kəndində anadan olmuşdur. Gənc yaşlarından saza maraq göstərən İmran həmkəndlisi Aşıq Məhərrəm Hacıyevə bir neçə il şəyirdlik edib, bu sənətə yiyələnmişdir.

Aşıq İmran 1940-cı illərdən Tovuzda yaşamışdır. Aşıqlıq sənətində böyük uğur qazanan İmran 1957-ci ildə keçirilmiş VI Ümumdünya festivalının laureatı olmuşdur. O, "Əməkdar mədəniyyət işçisi" kimi fəxri ada layiq görülmüşdür.

Azərbaycan aşıqlarının III və IV qurultaylarının nümayəndəsi olan Aşıq İmran bir sıra ölkələrdə beynəlxalq festivallarda iştirak edərək vətənə mükafatla qayıdıb.

Aşıq İmran Həsənov 15 dekabr 1999-cu ildə vəfat etmişdir.

Aşıq İmran həm də şair kimi diqqəti cəlb edir. Onun bir neçə kitabı nəşr olunmuşdur, müxtəlif şəkilli şeirləri var. Burada şeirlərdən seçmələr təqdim olunur.

## *QOŞMALAR*

## GÖZƏL

Bəzənib-düzənib çıx seyrangaha,
Süsən yaraşığı yaylağın, gözəl!
Açılıb yolları, bitib gülləri,
Gözləri yoldadır bulağın, gözəl!

İndi novbaharın gəlhagəlidi,
Tülək tərlan kimi könlüm dəlidi.
O yerə baş qoyub, can verməlidi,
Hansı daşa dəysə ayağın, gözəl!

Cilvələnib dağdan-dağa aşırsan,
İmran kimi hər gülə söz qoşursan,
Telli sazın tilsiminə düşürsən,
Yayılır ellərə sorağın, gözəl!

## QOCALMAZ

Dünyada olmasa hicranlar, qəmlər,
İnsanın ürəyi, gözü qocalmaz.
Saçın ağarması zirvə qarıdır,
Arzu-diləklərin düzü qocalmaz.

Həmdəmi olasan daim qananın,
Oduna yanasan oda yananın.
Bilsəydi qədrini insan insanın,
Keçsə də ömrünün yüzü, qocalmaz.

Az yaşa, çox yaşa, mənalı yaşa,
Bacarıb arzunu vurasan başa.
Əgər bu sözlərim gəlirsə xoşa,
İmranın söhbəti, sözü qocalmaz.

## SƏNİN

Sənət dahisisən, Aşıq Ələsgər,
Kamala yetişdim izindən sənin.
Oxuyan doymayır, duyan doymayır,
Çox ilham alan var sözündən sənin.

Üz tutdun dünyada haqq-ədalətə,
Can verdin əbədi şeirə, sənətə.
Heyranam səndəki sirrə, hikmətə,
Heç şey yayınmayıb gözündən sənin.

Dad çəkdin zamandan: aman – əlaman,
Verib qiymətini indiki zaman.
Adınla fəxr edir bu Azərbaycan,
İmran od götürüb közündən sənin.

## *GƏRAYLILAR*

## HARALISAN

Ləbi ballı, xoş xəyallı,
A gülyanaq, haralısan?
Qaşı kaman, alışdım mən,
Huri sayaq, haralısan?

Ay camalın şölə salır,
Hər baxışın canlar alır,
Zülfün şahmar kimi çalır,
Qaymaq dodaq, haralısan?

Ayaq saxla, qəddi mina,
Od salıbsan şirin cana.
Qəsd eyləmə sən İmrana,
Nurlu çıraq, haralısan?

## OLANDA

Ürək cavan, arzu şirin,
Nə olar ki, çal olanda!?
Duyan bilər ləzzətini,
Dodaq qaymaq, bal olanda.

Fikir vermə çox daş-qaşa,
Meylini sal qələm – qaşa.
Ömürdən də çəkmə haşa,
Əlif qəddin dal olanda.

Qınama gəl sən İmranı,
Nə qocası, nə cavanı;
Cavan saxlayar insanı,
Yarı əhli-hal olanda.

## *TƏCNİS*

## HEY NADAN SƏRİN
(dodaqdəyməz)

Dərdli qalar, dərd artırar, hey yanar,
Çəkər cəzasını hey nadan sərin.
Aşıq deyər, hey sərin,
Danış dərin, hey sərin.
Ayaq gedir, neyləsin,
Xətasıdı hey sərin.
Hər saat nə dəqiqədə ayrıldı,
Salar sınaq alta hey nadan sərin.

İşrət alan xəta çəkər nə haqdan,
Halal istər, əlin açar nə haqdan.
Aşıq deyər, nə haqdan,
Kölgə olar nə haqdan.

Kainatda əzəldən
Yaranandı nə haqdan?
Yazılanda sənə çatan nə haqdan,
Yorsa da ayağı hey nadan sərin.

Cəhli çəkən cəsədindən can alar,
Həqiqətdən danışanlar "can!"alar.
Aşıq deyər, can alar,
Can canandan can alar.
Satın olsa həyatda,
İnsan yenə can alar.
Aşıq İmran sənətindən can alar,
Yaradan yaşayar hey nadan sərin.

## *DİVANİLƏR*

### BAX

Əziz qonaq, göz dolandır,
Bir bizim ellərə bax;
Eşqimizlə çiçəklənən,
Gül açan çöllərə bax.
Uca dağlar sinəsindən
Salınan yollara bax.
Vətənimə zinət verən
Yorulmaz əllərə bax.

Hər günümüz bir dastandır,
Fəzalara uçmuşuq;
Ulduzların dünyasına
Pəncərələr açmışıq.
Biz günəşlər diyarından
Aləmə nur saçmışıq;
Kainata körpü salan
Bu qardaş ellərə bax.

Gur şəhərlər, abad kəndlər
Düzülübdü yan-yana;
Hünərimiz, qüdrətimiz
Şöhrətdir bu zamana.
Bu ağ günlər fərəh verir,
Canan, Aşıq İmrana;
Mənim sədəfli sazımda
Dil açan tellərə bax.

**DANIŞMA**

Hər namərdlə qoşa durub,
Yol-ərkandan danışma.
Öz tayını ara, axtar,
Bədgümandan danışma.
Səbirkara öyüd verib,
Din-imandan danışma.
Uzaq dolan şübhəlidən,
Keçib candan, danışma.

Arzuların təmiz olsun,
Bir müqəddəs söz kimi;
Mətləbini qanana de,
Qoy yapışsın köz kimi.
Vicdanını, namusunu
Qoru, saxla göz kimi;
Həqiqətə açıq-aşkar
Göz yumandan danışma.

Nəsihət de eləsinə,
Bilsin qədir-qiymətini;
Alim olsun-adam deyil,
Bölürsə öz millətini.

Öz-özündən şübhəlidir
Düşünmürsə sənətini;
Aşıq İmran, yaxşı-pisi
Duymayandan danışma.

## *MÜXƏMMƏSLƏR*

## QARAGÖZ

Yanağın gül, saçın sünbül,
Qaşın təzə ay, Qaragöz!
Aşiqin çox, mürvətin yox,
Qoy salım haray, Qaragöz!
Qəddin çinar, qoynunda nar,
Düşməz mənə pay, Qaragöz!
Ceyran nədir, tərlan nədir,
Yoxdur sənə tay, Qaragöz!

Özün şirin, sözün şirin,
Məlahətsən başdan-başa;
Nə incəsən, könlümcəsən,
Qismət olsun, yüz il yaşa!
Gözəl çiçək, gəl and içək,
Könül verib, gəzək qoşa.
Keçmə belə gülə-gülə,
Səninləyəm, ay Qaragöz!

Aşıq İmran sənə qurban,
Bir gəl bulağın başına;
Qeydinə qal, bir kölgə sal
Qəmli qonağın başına.
Gözəl xanım, qoy dolanım
Səntək çırağın başına.
Bəxtim gülər, bir gün gələr,
Eyləyərəm toy, Qaragöz!

## SƏNƏTİM

Əzəl gündən-yaranandan
Görməyib möhnət sənətim;
Dərdi, qəmi uzaq salan
Mənim xoşsifət sənətim.
Hər qapıya qismət olsun,
Qoy, çəksin zəhmət sənətim.
Heç kimsəyə toxunmayıb,
Götürməz minnət sənətim.

Çünki elin nəfəsidir,
Günbəgün ucalır hələ;
Əsrlərin yolçusudu,
Qiymətini alıb hələ.
Kim sənətə təməl qoyub,
Bir incitək qalır hələ.
Azad ellər qiymət verib,
Qazanıb hörmət sənətim.

Aşıq İmran izah etsin,
Nəqş olubdur tarixlərə.
Qədəmi xoş, niyyəti xoş,
Biz gedirik şad xəbərə.
Minnətdaram millətimə,
Çatdırıbdır zirvələrə;
Keçib çətin sınaqlardan,
Alıbdır qiymət sənətim.



**AŞIQ SALEH**
(1930-1975)

Saleh Əhməd oğlu Həsənov 1930-cu ildə Göyçə mahalının Bala Qaraqoyunlu kəndində anadan olmuşdur. 1941-1945-ci il Böyük Vətən müharibəsi zamanı maddi çətinliklə üzləşən ailə Gədəbəy rayonuna, sonra isə Şəmkir rayonuna köçmüş, bir müddət Düyərli kəndində yaşadıqdan sonra Goranboy rayonunun Qızılhacılı kəndinə gələrək orada məskunlaşmışlar.

Gənc yaşlarında saza-sözə maraq göstərən Saleh bu sənətə Aşıq Ələsgərin oğlu Aşıq Talıbın və Aşıq Əsədin sayəsində yiyələnmişdir. O, son vaxtlar Goranboy rayonunun Mədəniyyət Evinin müdiri işləmiş, həm də həmin ərazidə aşıqlar ansamblına rəhbərlik etmişdir.

Aşıq Saleh ömrünün çiçəkli çağında, qəflətən 21 sentyabr 1975-ci ildə Goranboy rayonunun Qızılhacılı kəndində vəfat etmiş və kənd qəbiristanlığında dəfn edilmişdir.

## *QOŞMALAR*

## DAĞLAR

Nə gözəl yaradıb təbiət sizi,
Göylərə baş çəkən, a qarlı dağlar!
Yayda gözəllərin seyrangahısan,
Əhdinə düz olan, ilqarlı dağlar!

Dəlidağ, İstisu, çox yığnağın var,
Qaraxaç, Sarıyer, min yaylağın var,
Göygöl, Daşkəsənin, Xaçbulağın var,
Kəpəzli, Murovlu, Qoşqarlı dağlar.

Dərələrdə bitir baldırğan, çaşır,
Kığ, moruq, çiyələk həddindən aşır...
Belə gözəlliyə dastan yaraşır,
Salehə ruh verən, vüqarlı dağlar!

## GÖZƏL SƏN

Nədən incimisən, ay minagərdan,
Sındırma könlümü barı, gözəl, sən.
Üzür ürəyimi qüssə, qəm, kədər,
Gəl eylə dərdimi yarı, gözəl sən.

Sevəndə naz gərək, şirin söz gərək,
Qaş ilə göz gərək, gülər üz gərək,
Eşqə sədaqətli, əhdə düz gərək,
Unutmusan düz ilqarı, gözəl, sən.

Sən mənim cananım, xub mehribanım,
Salehəm, uzaqda necə dayanım?
Ayrılıq oduna alışır canım,
Sənindi dağların qarı, gözəlsən.

## MƏNİM

Həvəsli bülbüləm, bir şirin diləm,
Düşübdür qürbətə güzarım mənim.
Alınır mətahım, çoxdu xirdarım,
Hələ kasad deyil bazarım mənim.

Bir bivəfa pozub əhdi, ilqarı,
Çəkirəm həsrətin, var intizarı.
Əgər ki, dərdimə olmasa yarı,
Köçəndə od olar məzarım mənim.

Mən sənə nə deyim, bimürvət gözəl,
Gedib özgəsini sevəydin əzəl.
Yandırma Salehi, gəl yola düzəl,
Kəsilibdi səbrü qərarım mənim.

## VERDİN

Vəfasızlıq etdin, alagöz pəri,
Əzəl gündən mənə hicranı verdin.
Yolunda qoymuşam bu canü səri,
Sən isə min cövrü-cəfanı verdin.

İndi kim olubdu yarın yoldaşın?!
Niyə tez qocaldın, ağardı başın.
Görəndə axıtdım gözümün yaşın,
Mənə dəryaları, ümmanı verdin.

Artıbdı Salehin dərdi, məlalı,
Tale küsgünüdü, halısan, halı.
Ataşı yandırır eli, mahalı,
Gen dünyada ona zindanı verdin.

## *GƏRAYLILAR*

## AYRI

Tifil ikən ah-vay çəkən
Mənəm düşən eldən ayrı.
Qara gözlü, gülər üzlü,
Şirin-şirin dildən ayrı.

Bəlalıdı başım mənim,
Atılıbdı daşım mənim,
Gözdən axır yaşım mənim,
Üzüm durmur seldən ayrı.

Saleh deyər, çeşmi-xumar,
Yaralarım eylər qabar.
Gecə-gündüz ağlar, sızlar,
Sona düşsə göldən ayrı.

## YALVAR

Dedim: gözəl, həmdəm olaq,
Dedi: aşıq, saza yalvar.
Dedim: birgə deyək, gülək,
Dedi: söhbət-sözə yalvar.

Deim: nazlı yarım olsun,
Dedi: işim, karım olsun,
Dedim: çoxlu varım olsun,
Dedi: onda aza yalvar.

Dedim: pərim, mürvətə gəl,
Dedi: Saleh, yola düzəl.
Dedim: məndən çəkməynən əl,
Dedi: qəmzə-naza yalvar.

## *TƏCNİSLƏR*

## AY YARI BİR DƏ

Aşıq al sinənə sədəfli sazı,
Çağır avaz ilə ay yarı bir də.
Bilirsənmi, sənə var ərkinazı,
O dostun eyləyər ay yarı bir də.

Hərdən oxuyursan "Alagöz"ləri,
Deyirlər, əzizim, ala gözləri.
Çəkirdi məni də ala gözləri,
Dedim, qəmi bölək, ay yarı bir də.

Mən bülbüləm, o da güldü, gül məzə,
Çağır gəlsin, qoy, versin o gül məzə.
Saleh deyər, qarşı gəldim gülməzə,
Pərişanam, yetir əyyara bir də.

## ÇAL VAXTI GÜLÜ

Hər Məcnun aşiqin bir Leylisi var,
Sən də ki, sevirsən çal vaxtı gülü.
Əzəldən sərində eşq havası var,
Nadanlar da sənə çal vaxtı gülü.

Kimə and içmişdin, ay andı gördü,
Çoxdu əməllərin a yandı, gördü.
Bağın bağbanı var, ayandı, gördü,
Üzmək istəyirsən çal vaxtı gülü.

Gördünmü oğlanı, tellidi, sazdı,
Onu yetişdirən Tellidi, sazdı.
Nə gözəl sədəfli tellidi, sazdı,
Saleh, al sinənə, çal, vaxtdı, "Gülü".

## MİN AYA, PƏRİM

Eşqin havasıdı, yoxdu çarası,
İstəyirsən oxut min aya, pərim.
Ölənədək ilqarımdan dönmərəm,
Gözlərəm, dözərəm min aya, pərim.

Bağban olub, bağdan aldım yüz barı,
Ürəyimdə kədər çoxdu, üz barı.
Hər ikimiz indi duraq üzbarı,
And içmək nə gərək Minaya, pərim.

Nə gözəl fəsildir, Saleh də, yazdı,
Elm çox dərindi, Saleh dayazdı.
Bu yeni təcnisi Saleh də yazdı,
Apar ver, saxlasın Minaya pərim.

## SƏN ARA DÜZGÜN

Nə zamandı keçib yarın vədəsi,
Hesab elə düzgün, sən ara düzgün.
Atası, anası, varmı kimsəsi,
Bəlkə də, kəsmisən sən ara düzgün.

Gəldi yenə bahar, qar ayazıdı,
Alnıma yazılan qara yazıdı.
İndiki səfərim Qarayazıdı,
Axtar cananımı, sən ara düzgün.

Saleh dilə gətdi, sən andı yenə,
Bu dağınmı adı Sənandı yenə?
Niyə ayaqladın sən andı yenə,
Zalım, qeyrətə gəl, sən ara düzgün.

## *MÜXƏMMƏS*

## GÖRMÜŞƏM

Bir çoxunu özüm kimi
Halı pərişan görmüşəm;
Etibarsız dostlarımı
Axırda düşman görmüşəm.
Hər vaxt şərə fitva verir,
Söyləyir böhtan, görmüşəm;
Nə insafı, mürvəti var,
Nə də ki, vicdan görmüşəm.

Bu namərdlər əl çəkmirlər,
Məni yetiriblər cana;
Ədəb-mərifətləri yox,
Dolanırlar yekəxana;
Gen gündə canhacan olur,
Çətin gündə gedir yana;
Dar ayaqda qoyub qaçıb,
Boş qalıb meydan, görmüşəm.

Saleh deyər, dostum var ki,
Gündə məni yad eləyir;
Mərdliyi, insanlığı
Ürəyimi şad eləyir;
Hər dərdimə şərik olur,
Qüssədən azad eləyir;
Belə dostlarıma layiq
Canımı qurban görmüşəm.



## AŞIQ HAQVERDİ
(1930)

Haqverdi Talıb oğlu Ələsgərov Göyçə mahalının Ağkilsə kəndində dünyaya göz açmışdır. O, məşhur Aşıq Ələsgərin nəvəsidir.

Haqverdi ibtidai təhsilini öz doğma kəndlərində, orta təhsilini qonşu Zod kəndində, ali təhsilini isə H. Zərdabi adına Gəncə Pedaqoji institutunda almışdır.

Sazlı-sözlü bir ocaqda boya-başa yetən Haqverdidə aşıqlığa erkən yaşlarından həvəs yaranmış və bu sənətin sirlərini atası Aşıq Talıbdan öyrənərək, bir aşıq kimi formalaşmışdır. Onun şairliyi də diqqəti cəlb edir.

İnstitutu bitirəndən sonra Kəlbəcərin kəndlərində müəllimlik fəaliyyətinə başlayan Haqverdi sonra Ağkilsə kəndinə qayıtmış, 1988-ci ilə qədər müəllim və məktəb direktoru vəzifəsində çalışmışdır. Bu müddət ərzində aşıqlığı da müəllimliyi ilə yanaşı davam etdirən Haqverdiyə hamı "Haqverdi müəllim" deyə müraciət eləyir.

Aşıq Haqverdi ermənilərin 1988-ci ildə törətdikləri milli soyqırımı ilə əlaqədar olaraq, Göyçəni tərk etməyə məcbur olmuşdur. O, hazırda Daşkəsən rayonunun Bayan kəndində yaşayır.

## *QOŞMALAR*

### MƏN

Bir xaliq üstümdən nəzər əyməsə,
Yüz namərd yığılsa, əyilmərəm mən.
Vicdanım şüşədi, qəlbim poladdı,
Əysələr, sınaram, əyilmərəm mən.

Məni soyuq sanıb incimə, lələ,
Hələ körpəlikdən qiymətdi belə:
Nə elə acıyam, atalar çölə,
Nə çox şirin olub yeyilmərəm mən.

Qohum var vurğunam etibarına,
Qohum var, qohumu satır qarına.
Haqverdi, göz yumdum dünya varına,
İsrafil sur çalsa, ayılmaram mən.

### MƏNİ

Gündə qılınc çəkir alır üstümü,
Çox aciz tanıyıb fələk də məni.
Aramır sədaqət, ilqar, etibar,
Tapır fırıldaq da, kələk də məni.

Əyilib qamətim bir sual kimi,
Dinib danışmıram dili lal kimi,
Gəzirəm mənasız boş xəyal kimi,
Eşitmir arzu da, dilək də məni.

Qəm-kədər əlindən ciyəri qanam,
Haqverdiyəm, nə kəmtale insanam.
Kaş, uşaq vaxtımda mehriban anam
Basıb öldürəydi bələkdə məni.

## GƏLİR

Tərəqqi çarxımız tərsə dolanır,
Yaxşı günlər keçib, yamanı gəlir.
Ürəyim titrəyir dəhşət içində,
Dilimə Allahın "amanı" gəlir.

Rüzgar amansız, dövran yağıdı,
Könlümün xanəsi qəm yığnağıdı.
Ağrılar qəlbimdə Ağrı dağıdı,
Başıma Ağrının dumanı gəlir.

Bəşər yolun azıb, odla oynayır,
Hələ kim nə bilir, fələk nə sayır.
Dünya coşub, qazan kimi qaynayır.
Deyəsən, Mehdinin zamanı gəlir.

Yoxdu Haqverdinin halı, neyləsin,
Dağılıb, talanıb eli, neyləsin,
Hər yerdən üzülüb əli, neyləsin,
Təkcə Yaradana gümanı gəlir.

## GÖYNƏDİ
***(Qəşəm Aslanovun xatirəsinə)***

Ay Qəşəm, xəbərin dağladı məni,
Yandı ürəyimin başı, göynədi.
Ağlamaq çətinmiş eldən gedəni,
Dondu gözlərimin yaşı, göynədi.

Qaralar bağlandı alın üstünə,
Xal düşdü qəlbimdə xalın üstünə.
Dərd ələndi bir mahalın üstünə,
Qurusu alışdı, yaşı göynədi.

Haqverdi, Göyçəyə dumanmı çökdü?!
Kişnədi buludlar, bayatı çəkdi.
Ayna bulaqları qanlı yaş tökdü,
Dağı sızıldadı, daşı göynədi.

***1984-cü il***

## BƏRDƏDƏ
***(Hüseyn Ağayevə)***

Xudaya, hər biri bir budaq olsun,
Çoxdu dostlarımın sayı Bərdədə.
Atamın, babamın ovlaqlarıdı,
Çox görmüşük haqqı-sayı Bərdədə.

İncidi, sədəfdi, dürdü mənimçün,
Çox çəkib qayğını, dərdi mənimçün,
Səxa kanı bir nəfərdi mənimçün,
Qohum, qardaş, əmi, dayı Bərdədə.

Haqverdi dərdindən hər vaxt halıdı,
Elin aqilidi, pürkamalıdı.
Ulu bir mahalın ağsaqqalıdı,
Yoxdu Hüseynin tayı Bərdədə.

## *GƏRAYLILAR*

## AĞRIN ALIM

Yenə məndən üz döndərib,
Gəzmə kənar, ağrın alım.
Bu söhbəti el eşidər,
Bizi qınar, ağrın alım.

Küsü-barış bir peşədir,
İlqarımız həmişədir.
Qəlbim büllur bir şüşədir,
Dəymə, sınar, ağrın alım.

İlqarımda mərdanəyəm,
Həsrətindən divanəyəm,
Mən oduna pərvanəyəm,
Sənsə fənar, ağrın alım.

## SƏNİ

Qurban olum, qəşəng ceyran,
İncitməsin sözüm səni.
Yaman qorxur ayrılıqdan,
Gözdən qoymur, gözüm səni.

Uzaqlaşma ayaq-ayaq,
Vədə verək, ilqar qoyaq,
Bu dağlarda Məcnunsayaq
Nə vaxtaca gəzim səni!?

Odlanar Haqverdi xəstə,
Heç kəs olmaz mən həvəsdə.
Tər çiçəksən bircə dəstə,
Əlim gəlmir üzüm səni.

## MƏNDƏN

Vətənimdə bülbül idim,
Ayrı düşdü gülüm məndən.
O zamandan incik olub,
Ayım məndən, ilim məndən.

Kədər məni çalır, çapır,
Sevincimi göydə qapır.
Hara getsəm, gəlir tapır,
Aralaşmır zülm məndən.

Məskən seçib, bay olmuşam,
Əlif qəddi yay olmuşam,
Gör kimlərə tay olmuşam,
Niyə qaçır ölüm məndən!?

## BAŞINA DÖNÜM

Xudam səni pak yaradıb,
Birsən, başına dolanım.
Ağlın, zəkan qüdrətindi,
Sirsən, başına dolanım.

Cana cansan san içində,
Yetişdin ümman içində,
Zühr etdin neysan içində,
Dürsən, başına dolanım.

Yolunda talanmaq şərəf,
Oduna qalanmaq şərəf,
Başına dolanmaq şərəf,
Pirsən, başına dolanım.

Külli-bəşər marağısan,
Xoş səadət sorağısan,
Xalqın ümid çırağısan,
Nursan, başına dolanım.

Haqverdiyə müqəddəssən,
İmdadlara yetən kəssən.
Həzrət Əliyə əvəzsən,
Şirsən, başına dolanım.

## *TƏCNİSLƏR*

## OYANA BƏLKƏ

Səmimi qardaşa yetir salamı,
Kağız, yolun düşdü o yana, bəlkə.
Könül sarayımın tacidarıdı,
Pərişan halıma o yana, bəlkə.

Dost yolunda astanadı dərdə sər,
Fikrim çoxdur, tab eyləmir dərdə sər.
Huşum çaşır, eləyəndə dərd əsər,
Yüz dəfə deyirəm "oy, ana", bəlkə.

Bilmirəm, Haqverdi qara baxtdımı,
Yoxsa fələk ona qara baxdımı!?
O da haraylasın qara baxtımı,
Qəflət yuxusundan oyana, bəlkə.

## DƏMDƏMİ, QARDAŞ

Gəlirəm halından xəbərdar olam,
Söylə məxməri çay dəmdəmi, qardaş?
Aqilin aqillə tutar söhbəti,
Qəmli-qəmli gəzər, dəm dəmi, qardaş.

Qəmdən uzaq olsun qəm, ə hayıfsan,
Dəyməsin köksünə qəmə, hayıfsan.
Heç vaxt meydan vermə qəmə, hayıfsan,
Qəm qəmi gətirər, dəm dəmi, qardaş.

Ruhun məlhəmidir, qəmdə də meylər,
Vaxtsız köç eyləsən, qəm dədəm eylər.
Qardaşın arifdi, qəmdə dəm eylər,
Sanma Haqverdini dəm dəmi, qardaş.

## A DADA HARAY

Anamız Göyçənin hər nemətindən
Könlüm istəyir ki, a dada hər ay.
    Aşıq deyər, a dada,
    Körpə istər a "dada".
    Yaxşı iş baş ucaldar,
    Şöhrət gələr ada da.
Çəkirəm vətəndə qürbət əzabı,
Həsrətdi dəhanım a dada, haray!

Qürbət eldə ha qovrulam, ha yanım,
Xəstə düşsəm, kəsən olmaz ha yanım.
    Aşıq deyər, ha yana,
    Cismim oda ha yana.
    Dərddi dəryayi-qəmdi,
    Yön çevirrəm ha yana.
Yoxdu bir həmdəmim, dostum, həyanım,
Sərgərdən qalmışam adada, haray!

Ay Haqverdi, demə dərdin yara, dan,
Xəbərsizdi sənə dəyən yaradan.
    Yox aşıq, yaradandı,
    Axan qan yaradandı.
    Köməksizin dayağı
    Dünyanı yaradandı.
Köməksizəm, nəzər əymə, yaradan,
Dar günümdü, yetiş a dada, haray!

## *DİVANİLƏR*

## MƏN KİMƏM

Şair Bəhmən, oğlansansa,
Gətir yada, mən kiməm?
Azdan-çoxdan tanıyırlar
El-obada, mən kiməm?
Nə qədər ki həyatım var,
Sağlam candı istəyim;
Olmamışam var dövlətə
Təmənnada, mən kiməm?

Özüm kimi dost yolunda
Qulam, qolu bağlıyam;
Qərar qoyub dolandıran
Haqqa beli bağlıyam.
Nə gəzməyə imkanım var,
Nə də yolu bağlıyam;
Maraqlıdı, nə dustağam,
Nə azada, mən kiməm?

Bağ salıram, zəhmətimin
Bəhrə-barı görünmür;
Sanki yoxdu bir kimsəyə
Xeyir karı görünmür.
Milyon yerə pay-puş olur,
Könül varı, görünmür;
On nəfərlə sərgərdanam,
Bir adada, mən kiməm?

Nə od olub, bir kimsəni
Yandırmaram, yaxmıram;
Nə sel kimi coşub-daşıb,
Dərələrdən axmıram;

Nə tufantək kükrəyəndə,
Nər palıdlar yıxmıram;
Bənzərim yox abü ataş,
Xakü bada, mən kiməm?

Bu xanədə örtülüdü,
Bilmək istəsən adım;
Kimsədən minnət götürüb,
Haqq üstümdə qoymadım;
Nəfəsi təng-bənd eylədim,
Fitnə-felə uymadım;
Ölənədək möhkəm durram,
Bu sevdada, mən kiməm?

## *MÜXƏMMƏS*

## BAXMISAN

Bir nəfərə xəbər verin,
Çevrilib yana baxmasın;
Qəmzələri cadü kimi,
Od salır cana, baxmasın.
Ağlımı başımdan alıb,
Eylər divana, baxmasın.
Salacaqdı çoxlarını
Şəkkə, gümana baxmasın;
Batıracaq əllərini
Nahaqdan qana, baxmasın.

Yaranmışda yoxdu tayı,
Sirri-xudaya bənzəyir;
Ayna qabaq şölə salır,
Bədirli Aya bənzəyir;

Yanağı gül yarpağına,
Qaşları yaya bənzəyir;
Başıma bir fikir dolub,
Yeni sevdaya bənzəyir;
Yoxsa yolumdan azaram,
Lənət şeytana! – baxmasın.

Abi-həyat çeşməsidi,
Yox ehtiyacı gözündə.
Gördüm, ziyarət eylədim
Məkkəni, hacı gözündə.
Düz yolumdan azammaram,
Görmüşəm bacı gözündə;
Haqverdidən ziyan yoxdu,
Qeyri cavana baxmasın.



## AŞIQ HACI GÖYÇƏLİ
(1931-2011)

Bayramov Hacı Abbas oğlu 1931-ci ildə Göyçə mahalının Daşkənd kəndində anadan olub. Hələ uşaq yaşlarından aşıqlığa həvəs göstərən Hacı 1945-ci ildə Daşkəndli Abbasəli Nəzərova şəyird olmuş, bir ildən sonra Bala Məzrəli Aşıq Hüseynin, 1947-1950-ci illərdə isə Aşıq Mehdinin yanında şəyirdlik etmişdir. Aşıq Hacı ustad sənətkar kimi bir neçə şəyirdə aşıqlıq sənətinin sirlərini öyrətmişdir. Qanlı kəndindən Balakişi, Qaraqoyunlu kəndindən Aşıq Səlim, Aşağı Şorca kəndindən Aşıq İslam 1968-ci ildən 1978-ci ilədək Aşıq Hacının yanında aşıqlıq sənətinin sirlərinə yiyələnmişdir.

Aşıq Hacı 1978-ci ildən öz həmkəndlisi Nuriddin İsgəndərovu özünə şəyird götürmüşdür.

1981-ci ildə Nuriddinlə birlikdə televiziyada "Aşıq Alı" dastanını, 1985-ci ildə isə "Şəmkirli Aşıq Hüseyn" dastanını söyləmişlər və hər iki dastanın lent yazısı televiziyanın "Qızıl fond"una daxil edilmişdir.

1984-cü ildə IV Aşıqlar qurultayına nümayəndə seçilmişdir. 1992-ci il 24-30-u oktyabrda Türkiyənin Konya şəhərində Ümumtürk aşıqlar müsabiqəsində iştirak etmiş və qızıl medala layiq görülmüşdür.

1988-ci ildə Aşıq Hacı Şəmkir rayonunun Çənlibel kəndində məskunlaşmışdır. "Mənim sazlı, sözlü dünyam" (Bakı, 2008) adlı kitabı çap olunmuşdur.

Aşıq Hacı Göyçəli 22 may 2011-ci ildə Şəmkir rayonunun Çənlibel kəndində vəfat etmişdir.

## *QOŞMALAR*

## GÖYÇƏNİN

Nə qədər saz duyan, söz əhli varsa,
Hamsı əziz qonağıdı Göyçənin.
Ögeyi bilinməz, yadı bilinməz,
Qoynu ana qucağıdı Göyçənin.

Burdadı İmanın şirin xəyalı,
Nazlı sənəmlərin göyçək camalı.
Məmmədsöyün, pir Ələsgər, şıx Alı,
Haqdan yanan çırağıdı Göyçənin.

Dindir Ağayarı ol ayıl-mayıl,
Anlamaz Bəhmanı ağıldan zayıl.
MisginAbdal, Seyid Bayram səcdə qıl,
Ən müqəddəs ocağıdı Göyçənin.

Gəl, Tərsə dağını seyr elə, qayıt,
Obalar mürgülü, yavaşca ayılt.
İsmixan, Şiruyə, Zəki, Alqayıt,
Şeir sənət sorağıdı Göyçənin.

Qartalları zirvələrdən qıy alar,
Çəmənində min bir naxış, boya var.
El-obaya keşik çəkən qayalar,
Yazılmamış varağıdı Göyçənin.

Ay Hacı, gələndə aşıqlar dəsi,
Qorxuya salardı Həsənin səsi.
Nəcəfin, Əsədin çağlar nəfəsi,
Bir nəğməkar bulağıdı Göyçənin.

***1978, Göyçə, Zod kəndi***

## İNDİ

Qocalığın ovsarından tutmuşam,
Alıbnan yedəyə çəkirəm indi.
Yornuğ öküzlərnən, qırıq bir cütnən,
Ömrün bağçasını əkirəm indi.

Səhralarım tor görünür gözümə,
Durammıram, əl vururam dizimə.
Oğul-uşaq daha baxmır sözümə,
Ağlayıb göz yaşı tökürəm indi.

Hacıyam, qocalıqdan giley eylədim,
Sərgi güddüm, sərçələri teylədim.
Nə qədər qazandım, axır neylədim,
Oturub hesabım çəkirəm indi.

## QƏRİBDİ

Bir məclisə, bir şənliyə gedəndə,
Hamı deyər – baxın gələn qəribdi.
Vətən həsrətinnən, el möhnətinən,
Günəştək saralıb, solan qəribdi.

Elə ah-vay çəkər hər an, hər gecə,
Yurd-yuva axtarar, gəzər ölüncə.
Dərdini içində çəkib gizlicə,
Əlləri qoynunda qalan qəribdi.

Gecə-gündüz haraylaram elimi,
Dərdinnən yükləyib əydim belimi.
Hacı deyər, bahar buludu kimi,
Gözləri həsrətdən dolan qəribdi.

***1982-ci il***

## SALAMAT QALIN

Bəlkə qayıtmadım, görmədim sizi,
Nərgizli yaylaqlar, salamat qalın.
Gedirəm, sən Allah, halallıq verin,
Ay elsiz oymaqlar, salamat qalın.

"Hacı Heydər", "Samux düşən", "Ala göl",
"Bəylik yalı" sarımsaqlı "Çala göl",
Elin getdi, sən salamat qal, a göl,
Sahibsiz oylaqlar, salamat qalın.

Zimistan adlayıb, yaz gələn zaman,
Mağarlar bəzənib saz gələn zaman,
Gəlin otağına naz gələn zaman,
Titrəşən dodaqlar salamat qalın.

Amansız zəmanə, bir sualım var:
Niyə tökdün yolum üstdə boran, qar.
Həsrət çəkər gözü yolda intizar,
Lilparlı bulaqlar, salamat qalın.

Hacıyam, zirvəsi görünən dağlar,
Al-yaşıl bəzənib bürünən dağlar,
Duman ətəyinə sürünən dağlar,
Müqəddəs ocaqlar, salamat qalın.

***1988-ci il***

## *DİVANİ*

### SƏN

Dəli könlüm, yaxşı düşün,
Vəzifəni seçmə sən;
Dolanırsan sadə dolan,
Dost yanından keçmə sən.
Öz-özünə mənəm demə,
Bu vəfasız dünyadı;
Həm endirər, həm qaldırar,
Öz həddini aşma sən.

Süleyman da bu dünyadan,
Nakam getdi, doymadı;
Puç eylədi igidləri,
Bir pəhlivan qoymadı.
Salsal qabil pəhlivandı,
Əli yıxdı, soymadı.
Şamama da ondan qorxdu,
Əli dedi – qaçma sən.

Hacı deyər, ləzzətsizsən,
Axır ollam puç kimi;
Ruhum çıxar bədənimdən,
Qanad alar, quş kimi.
Dünya malı çox şirindi,
Axrı xarab daş kimi.
Sirat durur qabağında,
Hünərin var, keçmə sən.

***1971-ci il***



## MÜŞKÜL MUSA
(1931-1991)

Musa Ağayar oğlu Süleymanov 1931-ci ilin avqust ayının 3-də Basarkeçər rayonunun Sarıyaqub kəndində anadan olub.

Müşkül Musa Ağkilsə kəndində yaşamış məşhur aşıqlardan Aşıq Musanın (1830-1912) qız nəvəsidir.

Aşıqlıqla yanaşı zurnaçılığı və şairliyi də vardı. Musanın oxuduğu Koroğlu havalarını hər aşıq onun kimi oxuya bilmirmiş. Bütün həyatı boyu Göyçədə el şənliklərində iştirak edib.

Müşkül Musa 31 may 1991-ci ildə vəfat etmişdir.

## *QOŞMALAR*

## DUR GEDƏK

Qızım, gedib, qohum-qonşu qalmayıb,
Bir doyunca otur ağla, dur gedək.
Ocağın başından, təndir külündən,
Qaynar yaralarım, yağla dur gedək.

Sən gəl vidalaşaq Keyti dağınnan,
Son dəfə ver içim el bulağınnan.
Atamın, anamın al torpağınnan,
Tökərsən gözümə, saxla dur gedək.

Silkindi Musanın ömrünün varı,
Ağlama, sızlama, oldun sapsarı.
Ağrın alım, götür qıfıl-açarı,
Bağla qapıları, bağla dur gedək.

## VARMI

Daha qocalmışam, əl işdən qalıb,
Gör açıb yaramı, sarıyan varmı?!
Fəhimi gödəlib, ağlı azalıb,
İçin-için məntək çürüyən varmı?

Gəlirim, qazancım dönsə də selə,
Vermişəm, aparıb, tufana-yelə.
Kimə gərək ollam mən innən belə,
Bir gör, heç axtarıb-arayan varmı?

Hər vaxtın qurğusu, hər işin çəmi,
Yandırıb odlara yaxır sinəmi.
Musa, sənlə bahəm bu dərdi-qəmi,
Tutub bir güncündən sürüyən varmı?

## ADDIYARMIŞ

Məni naçar qoyub, ay qoca baxtım,
Qalmadı cismimdə, can addıyarmış.
Zəmanəm, taleyim bir də ki vaxtım
Eyləyib qəlbimi qan, addıyarmış...

Tale bəd gələrmiş, iqbal dönərmiş,
Enən ucalarmış, qalxan enərmiş.
Sönən odlanarmış, yanan sönərmiş,
Ömür pay-puş olub, gün addıyarmış.

Yüz nəzir-niyaz de, yüz də sadağa,
Alnına yazılan çıxar qabağa.
Dostlar çəkilərmiş darda qırağa,
Qohum da, qardaş da gen addıyarmış.

O cənnət, cəhənnəm hardadı-harda?!
Elə cəhənnəmdi o dar məzar da.
Vəfasız çıxarmış vəfalı yar da,
Oğul, qız da gələr, yan addıyarmış.

Xilqətdən sən yaranıbsan tək, Musa,
Aslan Musa, pələng Musa, lək Musa,
Dərd sənindi, çəkəcəksən, çək, Musa,
Heç kim qatmaz cana-can addıyarmış.

## BİLMİRƏM

Qoca dünya, sən nə yaman şirinsən,
Mən səndən əlimi üzə bilmirəm.
Gövhər düzüb əbrü-atlas bürünsən,
Arzu-istəyimi yaza bilmirəm.

Deyirlər: hər dərdi salma ürəyə,
Dözümsüz bir ürək kərəkdir nəyə.
Saxlayaq cəsədi nəfəs verməyə.
Axı, mən dayanıb dözə bilmirəm.

O tərlan qəlbimi saldın təpərdən,
Göz dolur, boşalır, bax hərdən-hərdən.
Yaman diksinirəm səsdən, xəbərdən,
Silirəm, qəlbimdən poza bilmirəm.

Köçəri quşlar var, gəlib keçəndə,
Könlüm yüz yol dəyib-qayıdır kəndə.
Bir çadır görürəm, odur yelkəndə,
Tanıya bilmirəm, sezə bilmirəm.

Musa, Musa deyil o vətəndəki,
Daş deyil, ürəkdi bu bədəndəki.
Yar vuran yaradı bu sinəmdəki,
Qövr edir yaralar, dözə bilmirəm.

## QALDI

Yurd-yuva itirmək asan iş deyil,
Ürəyimdə dərdi-malalı qaldı.
Yetmiş il qazandı, qurdu, yaratdı,
Görünməz nə cahı, cəlalı qaldı.

El məzardan oldu, məzarlar eldən,
Nə dərdin sahibi gör, olmuşam mən?!
Anadan dünyaya gəldiyim vətən,
Biz ondan, o bizdən aralı qaldı.

Dili yox, dillənə hər məzar daşı,
Ürəyimə axdı gözümün yaşı.
Dost-dostu itirdi, qardaş-qardaşı,
Neçə-neçə yaslı-yaralı qaldı.

Əklillər çəkilib daşların üstə,
Yolma saçlarını, gəl dəstə-dəstə.
Gözləri yollarda, qulağı səsdə
Neçə-neçə dağlar maralı qaldı.

Ziyarət etsəm də ata-anama,
Baba dərdi çox çətindi adama.
Bir mən deyiləm ki, alışan şama?
Bu dağı görməmiş haralı qaldı.

Heyranıyam, yol-ərkanı qananın,
Azər oğlu, azəriyəm, inanın.
Dərdi çoxdu yazıq Müşgül Musanın,
Yaranandan başı balalı qaldı.

## QƏRİBLİKDƏ QALDI

Köç-köç oldu, aləm köçdü, el getdi,
Qırıldı könlümün havası qaldı,
İsti komasını hamı tərk etdi,
Qəriblikdə yurdu, yuvası qaldı.

Babası sayırdı özünə hamı,
Dədə Ələsgəri, Miskin Abdalı.
Həm Seyid Mahmudu, Seyid Bayramı,
Cəddi, cəsarəti, duvası qaldı.

Əmək zaya getdi, qazanc oldu puç,
Daşnaqlar boynuna gör, alırmı suç.
Musa, Göyçə deyə yüz də boyun quc,
Böyük Oğuz yurdu, obası qaldı?!

## BANLAYAR

Bayquş bəsləməklə qızıl qəfəsdə,
Uçar viranədə, daşda banlayar.
Yerini, yurdunu qanmayan kimsə,
Ayaqda oturar, başda banlayar.

Elə iş tut, iş çıxmasın içindən,
Diksinmişəm, necə deyim, özündən.
Çaxır qüvvəsindən, araq gücündən,
Sərçələr səyriyər, quş da banlayar.

Musa, dövran keçdi, o geri gəlməz,
Adam var qəlbini qardaşa verməz.
Ar-namus gözləyər, qeyrətsiz olmaz,
Ya doluda, ya da boşda banlayar.



## AŞIQ MURAD NİYAZLI
(1933-2005)

Aşıq Murad Niyazlı (Həsənov Murad Babaxan oğlu) 1933-cü ildə Göyçə mahalının Aşağı Şorca kəndində anadan olmuşdur. Atası 1941-ci ildə Böyük Vətən müharibəsi cəbhəsinə yollanmış və itkin düşmüşdür. Anası Tamam Əmrah qızı ailəni Azərbaycanın Şəmkir rayonunun Dəllər Cəyir kəndinə gətirmiş və orada yaşamağa başlamışlar.

Murad 1950-ci illərdən şeir yazmağa başlamış və aşıqlığa həvəs göstərmişdir. O, Aşıq Əsədin və qardaşı Aşıq Məhəmmədin yanında şəyird olduqdan sonra müstəqil aşıqlıq etməyə başlamış və şöhrət qazanmışdır.

Aşıq Muradın şeirləri müxtəlif mətbuat səhifələrində dərc edilmişdir. ”Harda türk var, mən ordanam” adlı kitabı çap olunmuşdur.

Aşıq Murad Ümumittifaq festifalı laureatı olmuş, “Əməkdar mədəniyyət işçisi” adına layiq görülmüşdür.

2005-ci ildə vəfat etmiş, Dəllər Cəyir kəndində dəfn olunmuşdur.

## *QOŞMALAR*

### AXTARAR

Adam var, aliməm, şairəm deyir,
Adına bir şeir yazan axtarır.
Əyridir, özütək hər şeyi əyri,
Düz sözü tərsinə yozan axtarır.

Adam var, anlamır, hey düşür bəhsə,
Adam var, "can" deyir hər yetən kəsə.
Adam var, daxilən bənzər iblisə,
Şənlik büsatını pozan axtarır.

Adam var, gözləri pərdələnibdi,
Adam var, üstünə dərd ələnibdi.
Adam var, hiyləyə zərdələnibdi,
Kələyi dolaşıb azan axtarır.

Adam var, bir şirin dil eşqinədir,
Adam var ki, Vətən, el eşqinədir,
Adam var, qışda da gül eşqinədir,
Adam var, baharda xəzan axtarır.

Adam var, zinətdir cahan mülkünə,
Adam var, daş yağsın yaranan günə.
Adam var, yapışıb şər külüngünə,
Dostuna bir quyu qazan axtarır.

Adam var ki, dayaq durar elinə,
Adam var ki, yetmək olmaz felinə.
Aşıq Murad saz götürüb əlinə,
Dərs almağa kamil ozan axtarır.

## BİR SƏHƏR GƏL, BİR GÜNORTA, BİR AXŞAM

Vəfalı dilbərim, məni görməyə:
Bir səhər gəl, bir günorta, bir axşam.
Halımı soruşub, salam verməyə
Bir səhər gəl, bir günorta, bir axşam.

Deyək, gülək, söhbət açaq sazınan,
Fərə kəklik kimi xoş avazınan.
Bəzən, sallan bizə qarşı nazınan,
Bir səhər gəl, bir günorta, bir axşam.

Keçən günlər bir də düşsün yadına,
Şeir yazdım, dastan qoşdum adına.
Aşıq Murad Niyazlının dadına
Bir səhər gəl, bir günorta, bir axşam.

## ÇIXIBDI

Vətən oğlu, sizə xəlvət sözüm var,
İşlərimiz çox gülməli çıxıbdı.
Ağıllı bildiyim, alim saydığım
Dostlarımdan biri dəli çıxıbdı.

Böhtan sözdən, bir də şərdən qorxuram,
Xəfkir atdan, qızmış nərdən qorxuram,
Yaman gözdən, bədnəzərdən qorxuram,
Bu gün qabağıma Vəli çıxıbdı.

Bilirsənmi, söz qılıncı yamandı,
Sayıq ol, yaz-yarat, yatma, amandı.
Müxtəsər, qardaşım, xeyli zamandı,
Muradın hər şeydən əli çıxıbdı.

## DEDİMMİ

Qanqaldan qızılgül, ulğundan palıd,
Göy söyüddən olmaz çinar, dedimmi!?
Polad qatılıqdan əysən, qırılar,
İnsan yoğunluqdan sınar, dedimmi!?

Gədadan şah olmaz, oğrudan kral,
Yapalaqdan tərlan, qarğadan qartal.
Anlamaz əlində qalsa bir mahal,
Odunsuz, ocaqsız yanar, dedimmi!?

Ağrı kəsmir, bədənimiz duzlaşıb,
Nakəslər varlanıb, çox quduzlaşıb.
Min-min ürək od içində buzlaşıb,
Əriməz, daha da donar, dedimmi!?

Xəsislər canından çox istər varı,
Yarasa zülməti, bülbül baharı.
Tamah bir kərkidir, bütün yonqarı
Sahibinə tərəf yonar, dedimmi!?

Murad Niyazlının yarıdır yaşı,
Təmizdir vicdanı, əyilməz başı.
Həyatın sirrini hər ötən naşı
Nə anlayar, nə də qanar, dedimmi!?

## DİNMƏRİK

Öyrənmişik “sus” deyəndə susmağa,
Dodağmızı tiksəniz də, dinmərik!
Başlamışıq ödümüzü qusmağa,
Tutub dara çəksəniz də, dinmərik!

Biz fağırın çıxmaz səsi, ünləri,
Dana kimi soyulsa da gönləri.
Bir cürünən keçirdiymiz günləri
Burnumuzdan töksəniz də, dinmərik!

Başqalara görünürük şən kimi,
Sərçələrə yem oluruq dən kimi.
Bulud kimi, duman kimi, çən kimi
Üstümüzə çöksəniz də, dinmərik!

Kim istəməz onun varı çox olsun,
Yesin-içsin gözü, könlü tox olsun,
Düz deyiblər: “Yoxsulluğu yox olsun”,
Cibimizi söksəniz də, dinmərik!

Ədalət axtarır yaxşı da, pis də,
Mömin bir kimsə də, bəzən iblis də.
Çovğunda, boranda, tufanda, sisdə
Yaş torpağa büksəniz də, dinmərik!

Asta danış, qulağı var daşın da,
Ağı olar namərdlərin aşında.
Aşıq Murad Niyazlının başında
Əgər kotan əksəniz də, dinmərik!

## ƏLƏSGƏR

Sənət aləminin nemətlərindən,
Əritdi, cövhəri süzdü, Ələsgər.
Cumdu qəvvas kimi dərinliklərə,
Şeir ümmanında üzdü, Ələsgər.

Yaşadı yüz beş il, dağda, aranda,
Gördü qan içən də, əhval soran da.
Bürküdə, yağışda, qarda, boranda
İstiyə, soyuğa dözdü, Ələsgər.

Vüqarı sınmayan uca dağ oldu,
Alnı açıq oldu, üzü ağ oldu,
Dörd yanı gül açdı, bağça-bağ oldu,
Hər güldən bir qönçə üzdü, Ələsgər.

Murad Niyazlısan, niyaz elə can,
Ver xalqın istəsə, canını qurban.
Ara əsrləri hey zaman-zaman,
Hanı belə sazlı-sözlü Ələsgər!

## QADASI

Enişli-yoxuşlu bu yollarda mən,
Min bəla görmüşəm azı, qadası.
Haqqı, ədaləti gözləyənlərdən
Olmuşam həmişə razı, qadası

Hərənin bir şeyə olar həvəsi,
Nadanlar alimlə çəkməsin bəhsi.
İblis olar iblisin də nəvəsi,
Edər atasına nazı, qadası.

Həmişə mərd deyib atalar mərdə,
Günəşin üzünə çəkilməz pərdə.
“Təqsir” Alıdamı, ya Ələsgərdə,
Onlar niyə çalıb sazı, qadası!?

Xanəndədən gəlir “şikəstə” səsi,
“Şur” ilə “Segah”ın şirin nəfəsi.
Əcnəbi xalların bu işgəncəsi
Tanıtdırır hoqqabazı, qadası.

“Dilqəmi” çal, qoy qəlbimi dağlasın,
“Kərəmi” çal, yazıq nənəm ağlasın.
“Koroğlu” çal, atam qılınc bağlasın,
Doldurma beynimə “caz”ı, qadası.

Çox sərvətli bağça-bardı Niyazlı,
El yanında üzü ağdı Niyazlı.
Neçə ki ölməyib, sağdı Niyazlı,
Gələcəkdir xoş avazı, qadası.

## OLAN YERDƏ

Tülkünün peşəsi şirvanmaq olar,
Gölün ortasında qaz olan yerdə.
Həqiqət dalınca həqiqət doğar,
Şər əkib, ev yıxan az olan yerdə.

Baxanda tanınar hər şeyin himi,
Qurbağa çeyildə axtarar çimi.
Qatırda adətdir, atası kimi,
Ağnayar küllükdə, toz olan yrdə.

Aşıq Murad, özün bilmirsən məgər,
Bir misaldır: yağsız cırıldar təkər.
Alimin ağzında dad verməz şəkər,
Bir qanmaz böyründən paz olan yerdə.

## YADIMA DÜŞÜBDÜ

İtirdiyim uşaqlığı, gəncliyi
Tapan ola tez, yadıma düşübdü.
Həzin-həzin şirin bir layla səsi,
Baş qoyduğum diz yadıma düşübdü.

Quzu otardığım, dağlar aşdığım,
Dəyə, alaçıqdan uzaqlaşdığım.
Dumanda, çisgində yolu çaşdığım
Dərə, təpə, düz yadıma düşübdü.

Tay-tuşlarım çağırırdı: qaşa çıx,
Gədiklərdən çən çəkildi, başa çıx.
Şehli otda ayaq yalın, baş açıq
Saldığımız iz yadıma düşübdü.

Nənəm məni oyadardı hər sabah,
Eyləyərdim umu-küsü, qaş-qabaq:
"Baban yatır, səs salmayın, ay uşaq!"
Anam deyən söz yadıma düşübdü.

Qoltuğumda yağlı fətir, bir kətə,
Hərdən-hərdən çəkilərdim xəlvətə.
Aşıq Murad, ayrılığa, həsrətə,
İyidsənsə döz, yadıma düşübdü.

## YARAŞMAZ

Haqq yanında cəhl çəkmək günahdı,
Qara yamaq vurma ağa, yaraşmaz.
Balıq gölməçəyə, bülbül qəfəsə,
Ala qarğa güllü bağa yaraşmaz.

İnsanlıqdan zərrə yoxsa qanında,
Mənasızdır, şöhrətin, də şanın da.
Cıdır meydanında, sərraf yanında
Qatır çıxa oynamağa, yaraşmaz.

Alim azsa, “aləm azar” deyərlər,
Nəsə düşdü yaxşı bazar deyərlər,
Bais olma, mərdiməzar deyərlər,
Doğru sözü qoyma lağa, yaraşmaz.

İyidə gərəkdir iyidin cəngi,
Misri qılınc olmaz dəmir firəngi.
Himara bəzəmə yeddi irəngi,
O buruna, o qulağa yaraşmaz.

Qoca bağban yetiribdir narın gül,
Baxan kimi heyran oldu Narıngül.
Dindirsələr, narın danış, narın gül,
Nalayiq söz dil-dodağa yaraşmaz.

Tez sınarmış bədöy nalsız olanda,
Mərd arxasız, kotan kalsız olanda,
El yiyəsiz, ağsaqqalsız olanda,
Sərçə qonar dal-budağa, yaraşmaz.

Aşıq Murad Niyazlıyam, bil aşkar,
Xalqıma tükənməz məhəbbətim var.
Keçsə də üstündən min acı rüzgar,
Vüqarını əymək dağa yaraşmaz.



## AŞIQ FƏTULLA GÖYÇƏLİ
(1941)

Əliyev Fətulla Əbdüləzim oğlu 1941-ci ildə Göyçə mahalının Nərimanlı kəndində dünyaya göz açıb. Kiçik yaşlarından saza-sözə böyük maraq göstərən Fətulla iki il müddətində aşıqlıq sənətinin sirlərini Qanlılı Aşıq Mehdidən, sonra isə Aşıq Ələsgərin oğlu Aşıq Talıba qulluq edib.

H.Zərdabi adına Kirovabad Pedoğoji İnstitutunun dil-ədəbiyyat fakültəsini bitirmişdir.

1988-ci il deportasiyasından sonra Gəncə şəhərində məskunlaşan Aşıq Fətulla İ.Qayıbov adına musiqi məktəbində şəxsi təşəbbüsü ilə ilk dəfə olaraq saz sinfi açmış, çoxlu tələbələr yetişdirmişdir.

Azərbaycan Aşıqlar Birliyinin üzvüdür.

Aşıq Fətulla Göyçəli "Yurd yeri", "Göyçəsiz dağlardan yaman küsmüşəm", və "Göyçə – dahilər yurdu" kitablarının müəllifidir. Haqqında Azərbaycan Aşıqlar Birliyi "Günümüzün ustad aşıqları: Fətulla Göyçəli" (Bakı, "Elm və təhsil", 2016) adlı kitab nəşr etmişdir.

Azərbaycan Respublikası Prezidentinin 15 iyul 2016-cı il tarixli sərəncamı ilə aşıq Fətulla Əliyev "Əməkdar Mədəniyyət İşçisi" fəxri adına layiq görülüb.

## *QOŞMALAR*

### MƏNİM

Hər Göyçə düşəndə yadıma, qardaş,
Dolanar qəlbimdə haralar mənim.
Heyif, əldən getdi bəxtəvər çağlar,
Bu həsrət sinəmi paralar mənim.

Qız-gəlinlər gözlərindən yaş tökər,
Qərib məzarlara kimlər baş çəkər?
Dustaq qalıb Alı, Bəhman, Ələsgər,
Bu sınıq qəlbimi yaralar mənim.

Fətulla, tarixin belə hökmü var:
Bir anda dəyişir görürsən qərar.
Göz yaşına dönüb keyvur bulaqlar,
Axdıqca, gözlərim qaralar mənim.

### BAĞLIDIR

İndi dostlarımız, ay vətən oğlu,
Açıqca, aşkarca pula bağlıdır.
Görürsən, ismətli bir nazənin qız,
Ehtiyac ucundan dula bağlıdır.

Kişilik dediyin hanı, a qardaş?
Dar gündə satılır vəfasız yoldaş.
Oğulsan, gəl çıxart bu dünyadan baş,
Bədbəxtlər həmişə yola bağlıdır.

Fətulla, seçilmir yaxşıynan yaman,
İndiki zamandan aman, əl aman!
Daha köhnələrə verilmir aman,
Ulağın yanında çula bağlıdır.

## “YURD YERİ”

Ellər o dağlara çıxmaz bir daha,
Yağılara yaman qaldı “Yurd yeri”.
Hərə səpələnib düşüb bir düzə,
Ayrılıq təbilin çaldı “Yurd yeri”.

Daşlı Güney – Ələsgərin oylağı,
Qan ağlayar Çalmalının yaylağı.
Sarıyer, Qaraxaç elin sorağı,
Açan gülün tezcə soldu, “Yurd yeri”.

Aman Allah, bu nə ahdı, amandı,
Keyti dağı göz önümdə dayandı.
Uzun Güney, Qumlu bulaq odlandı,
Dərin xəyallara daldı, “Yurd yeri”.

“Baleylinin komu”, “Sarı dərəsi”,
Bal dadardı südün axşam sərməsi.
Yeməliydi əmliklərin kərəsi,
Fikir məni nə bərk aldı, “Yurd yeri”.

Hayana baxıram dərddi, vərəmdi,
Göyçə Əsli, Fətulla da Kərəmdi.
Kim çəkər, ay ellər, axı bu dərdi,
Yaman ayrılığı saldı “Yurd yeri”.

# GÖRDÜM

Yuxumda Göyçəyə getmişdim, Allah,
Endim Çalmalıdan, gölləri gördüm.
Bənövşə boynunu bükmüşdü yaman,
Düşmənin əlində gülləri gördüm.

Kom yerini gəzib gəldim Zinaya,
Qarabulaq, həm Daltəpə haraya.
Xaçda gördüm hər şey uçdu havaya,
Axtarırdı keçmiş, illəri gördüm.

Bəd gəldi atamın baharı, yayı,
Ünüm ərşə çıxdı, yoxdu harayı.
Uçdu varlığımın ömür sarayı,
Gözümə toxunan milləri gördüm.

Seyid Mahmud burda çatdı imdada,
Seyid Miri vurğun oldu min ada.
"Bu ah yerdə qalmaz" – dedi dünyada,
Qeybdən səslənən dilləri gördüm.

Fətulla, ağlayıb, eylədim fəryad,
Bizi yaradandan istədim imdad.
Yetişsin dadıma, xudaya, min ad,
Vətənsiz uzanan illəri gördüm.

## *GƏRAYLILAR*

# GÖYÇƏ

***(1988-ci il dekabrın 6-da Göyçə dağılanda)***

Köç karvanım yola düşür,
Sən də ağla, mən də, Göyçə.
Görüşmədik bir də bəlkə,
Sən də ağla, mən də, Göyçə.

Göyçə gölüm layla çalar,
Ələsgərim fikrə dalar,
Səhnəbanım saçın yolar,
Sən də ağla, mən də, Göyçə.

Ustad Alı, şair Bəhman,
Bəs, de, hanı Növrəs İman?!
Nəcəfindir oda yanan,
Sən də ağla, mən də, Göyçə.

Qoy öpüm mən torpağından,
Ayrı düşdüm qucağından.
Necə köçüm ocağımdan?-
Sən də ağla, mən də, Göyçə.

Harda dost tapım özümə,
Qüvvət verən yox sözümə.
Küləyin dəysin üzümə,
Sən də ağla, mən də, Göyçə.

Fətullanı yola salsan,
Qəm sazını alıb çalsan,
Gedirəm, salamat qalsan,
Sən də ağla, mən də, Göyçə.

## DEYİL

Qanmayana yüz də can de,
Əhvalını bilən deyil.
Yüz dəfə alsan da yara,
Gözyaşını silən deyil.

Mərdə əl aç, ona yalvar,
Comərtdədi hünər, vüqar.
Alçaq təpə saxlamaz qar,
Gün vuranda qalan deyil.

Xain adam şayə yayar,
Ara vurar, od qalayar.
Fətullaya O verən var,
Verdiyini alan deyil.



## AŞIQ NURİDDİN
(1956-2017)

İsgəndərov Nuriddin Abid oğlu 1956-cı ildə Göyçə mahalının Daşkənd kəndində anadan olmuşdur. Orta təhsilini Daşkənd kənd orta məktəbində almış, hərbi xidməti başa vurduqdan sonra ali təhsilini Bakı Kooperasiya İnstitutunda davam etdirmişdir.

Erkən yaşlarından aşıqlıq sənətinə meyl göstərən Nuriddin ustad Aşıq Hacı Göyçəliyə şəyirdlik etmiş, ondan sənətin sirlərini öyrənmişdir. Aşıq Hacı Bayramovla həm Göyçə mahalının, həm də Azərbaycanın digər bölgələrinin el məclislərində iştirak etməyə başlamış, tez bir zamanda elin-obanın rəğbətini qazanmışdır.

1981-ci ildə Aşıq Hacı ilə birlikdə ifa etdikləri “Aşıq Alı” dastanı saz-söz sevənlərin yaddaşlarından silinməyib və bu günə kimi Dövlət Televiziyasının “Qızıl fond”unda ölməz sənət əsəri kimi qorunub saxlanır.

Aşıq Nuriddin 1988-ci ildən Şəmkir rayonunda yaşamış, 21 dekabr 2017-ci ildə orada vəfat etmişdir.

Burada təqdim olunan şeirlər Araz Yaquboğlunun “Daşkənd aşıqları və şairləri” (Bakı, “Nurlan”, 2008) kitabından götürülmüşdür.

*QOŞMA*

**GÜL YARIM**

Dəm dəmi gətirər, qəm də ki qəmi,
Çox ağlama, barı bir yol gül, yarım.
Gözlərinin şəfqətini aparar,
Göz yaşını gözlərindən sil, yarım.

Adını çəkəndə dilim sevinər,
Əlinə dəyəndə əlim sevinər,
Sən bizə gələndə elim sevinər,
Qoyma bizi intizarda, gəl, yarım.

Necə deyim, bir baxışdan doyanam,
Gözlərindən ürəyini duyanam.
Çətin işdir, mən bu dərdə dayanam,
Bir təbibsən, əhvalımı sor, yarım.

Yadındamı, könül verdin bir bahar,
Özün dedin, gəl eyləmə ahu-zar.
Nuriddini bir də qoyma intizar,
Bəs deyilmi gözlədiyim il, yarım?!

## *GƏRAYLI*

### KÜSƏR

İl qədrini bilməyən dost,
Bir anlığa məndən küsər.
İbadəti sevməyən dost,
Hədər yerə dindən küsər.

Kin-küdrətdən qurub qala,
Hasar çəkmə sağa, sola.
Qismət olanda çaqqala,
Çil toyuq da hindən küsər.

Namərd səni dara salar,
Ürəyinə qara salar...
Zülmət sevən yarasalar,
Kölgədən yox, gündən küsər.

Vədəsində düşən yarpaq,
Son günündən verər soraq.
Xaric güllər vuran barmaq,
Sazdan küsər, simdən küsər.

Çox olubdur qanan dostun,
Yaxşı dostun, yaman dostun,
Ay Nuriddin, uman dostun,
Səndən də yox, kimdən küsər?!

## *DİVANİLƏR*

## VAR

Eşq oduna alovlanan, canı oda yaxdı var,
Haqq aşiqi bu dünayda həqiqətdi, haqdı, var.
Biri çıxar, biri düşər bir qanundur əzəldən,
Bel bağlama bu dünyaya, bir ötəri taxtı var.

Bu gəlişin, ey nazənin, necə düşdü yerinə,
Dəli könül pərvaz edib çıxdı dağlar seyrinə.
Adam var ki, bu dünyada qoyulmazmış yerinə,
Qızıl deyil, gümüş deyil qızıldanca baxtı var.

Nuriddinəm, necə dözüm belə ahu-fəryada?
Bəxtin gülə, xoş gələsən həm qohuma, həm yada.
Təmiz dolan, təmiz adın, qoy yaşasın dünyada,
Pis əməllər açılacaq, o ki, başa qalxdı var.

## DÜŞƏRSƏN

Yaxın dosta fənd işlətmə, özün felə düşərsən,
El dalınca heç danışma, eldən-elə düşərsən.
Yaxşı yaşa, el dalınca həsrət çəksin, qoy sənin,
Yaman olsan, yada düşməz aya, ilə düşərsən.

Həyat sənə bəxş olunub, zərif anla, zər düşün,
Alçalan kim, ucalan kim boş taxtları bir düşün,
Sadiq dostun, qoy bir olsun dərdinizi bölüşün,
Hər yetənə sirr verərsən, yaman dilə düşərsən.

Hey ağlayar, göz qurumaz, zəhər bala düşəndə,
Parçalayıb eyni ürək sağa, sola düşəndə,
Köç qatarın hazır olub, karvan yola düşəndə,
Axtarmaqla, ay Nuriddin, hardan ələ düşərsən?!

## EYLƏMƏ

Gecə-gündüz bayquş kimi ulamağa meyl eyləmə,
Yemək ilə doymadınsa, yalamağa meyl eyləmə.
Yaltaqlanıb ona-buna boyun əymə, yalmanma,
Orda-buda quyruğunu bulamağa meyl eyləmə.

Yaltaqlıqdan kənar dolan, hünər göstər, qeyrət elə,
Yaxşılığı özün üçün bir tükənməz sərvət elə,
Adam kimi doğulmusan, adamlığa hörmət elə,
Namərd olub qan meydanı sulamağa meyl eyləmə.

Açıq gözlə həyata bax, dur seyr elə çöl-çəməni,
Dünya varı gəldi-gedər aldatmasın əsla səni.
Hatəm kəslər süfrə açar, yarı bölər bir tikəni,
Haram varla gün keçirib, dolanmağa meyl eyləmə.

Gədadan da bəy olarmı, hey aşsa da varı başdan,
Gözünü şöhrət bağlayar, xəbər tutmaz bu təlaşdan.
Nuriddini məcbur edib aralama yar-yoldaşdan,
Sör-söyüdü xan çinara calamağa meyl eyləmə.

## MÜNDƏRİCAT

